# Mündəricat

## İlahi ziyafət

### Kitab haqqında

İslam İnqilabının Böyük Rəhbəri həzrət Ayətullah Xameneinin Ramazan ayı barədə çıxışlarından seçmələr

Tərtib edən: Əlirza Muxtarpur

səh:۱

### İlahi ziyafət

#### Ramazan – Allaha qayıdış üçün ən yaxşı fürsət

İlin dəyişdiyi ay, ilahi rəhmət və bağışlanma ayı olan mübarək ramazan ayının yaxınlaşdığı bir vaxtda bizim də öz daxilimizdəki əyri-əskikliklərdən, çirkinlik və pisliklərdən üz çevirməyimiz - yəni bağışlanmaq istəməyimiz çox münasib görünür. Bağışlanmaq diləmək və tövbə etmək - Allaha qayıtmaq, pis əməllərə arxa çevirmək və yenilik yaratmaqdır: Rəbbinizdən bağışlanmanızı diləyin, sonra Ona tövbə edin ki, müəyyən bir müddət (ömrünüzün sonunadək) sizə yaxşı gün-güzəran və hər bir əməl sahibinə (əməlinin) mükafatını versin.(۱) Tövbə etmək, Allaha qayıtmaq və özümüzü daxilən islah etmək Allah-Taalanın bizə daha çox lütf və mərhəmət etməsinə, bərəkət, qüvvə və izzət nazil etməsinə bais olur. Bütün təbəqələr - istər mənim kimilər və yüksək vəzifələrdə çalışanlar, istərsə də adi insanlar bu qayıdışa və islahata ehtiyaclıdırlar. Biz vəzifəlilər digərlərindən çox özümüzə qayıtmalı, özümüz haqda .yenidən düşünməli və vücudumuzda nəfsin hakimiyyətinə son qoymalıyıq

#### Ramazan – Allahla ünsiyyətin baharı

Bu il təsadüfən təbiət baharı dua və Quran baharı ilə eyni vaxta düşmüşdür. Bir neçə gündən sonra insanın özünüislah və Allahla ünsiyyət baharı olan mübarək ramazan ayı başlayacaq. Məgər məsələnin bu cəhətini unutmaq olar?! Bütün səhvlər bu cəhətə qarşı diqqətsizlikdən irəli gəlir. Səhvi az, qəlbi Allahın mərifət və hidayət nuru ilə işıqlı olan, işarəsi bu xalqa, bizə və dünyanın bütün İslam aşiqlərinə yol açan, bələdçilik .edən mərhum və əzəmətli imamımızın Allahla əlaqəsi bu cəhətdən təmin olunmuşdu

İnqilab, hökumət və idarələrdə nöqsan və yayınma bu cəhətdən başlayır: mənəviyyat, Allahla əlaqə, qəlbin Allaha diqqəti cəhətinə əhəmiyyətsiz yanaşırlar. Əgər fikir versəniz, bizim inkişaf etdiyimiz, uğur qazandığımız, yaxşı işləyib razı qaldığımız yerlər bu cəhəti təmin etdiyimiz yerlərdir; harada ziyan gördüksə, işin bu cəhətinin zəifliyinə .görə oldu

## Allahla əlaqəni qorumağın təsirləri

Allahla əlaqəyə əhəmiyyətsiz yanaşmaq olmaz. Bizim hər bir işimiz bu əlaqədən asılıdır. Düşmənlərdən qorxmamaq üçün bizim qəlblərimizi möhkəmlədən amil bu əlaqədir. Fikir və üslub fərqlərinə rəğmən, bizim qəlblərimizi möminlərə və Allah yolunun yolçularına qarşı sevgi ilə dolduran Allahla bu əlaqədir. Allahla bu əlaqə öz nəfsimizdən ötrü həqiqəti tapdamamağa, ümumi məsləhəti şəxsi mənafeyə qurban verməməyə bais olur. Allahla bu əlaqə Allah yolundan yayınmamağa, bu yolu getməyə peşman olmamağa və yorulmamağa səbəb olur. Allahla bu əlaqə həmişə mümkündür, .heç zaman gec və imkansız deyil

## İnsan həyatında iki paralel yol

İnsan həyatı daim iki paralel yol üzərində gedir. Bir yolla gedənlər daim yüksəyə doğru gedir, o biri yolun yolçuları isə aşağıya, dərəyə və cəhənnəmə sarı hərəkət edirlər. Bu iki yol bir-birinin yanında və bir-birinə paraleldir. Bu iki yol eynilə bir-birinə bənzəyir. Süquta, tənəzzülə və aşağıya doğru hərəkət edənlər o biri yolla gedənlərin yaxınlaşdıqları yerdən uzaqlaşırlar. Onlar Allahdan uzaqlaşır, şeytana və cəhənnəmə yaxınlaşırlar. Ucalığa, yüksəlişə, işığa, Allaha, tövhidə, əxlaqi paklığa və mənəvi saflığa .doğru hərəkət edənlər isə o biri qrupun endiyi yerdən uzaqlaşırlar

Bu iki yol bir-biri ilə qonşudur, birindən o birinə keçmək çox asandır, yol yaxındır. Əgər biz Allah eləməmiş, ikinci yolla hərəkət edir, nəfs və əxlaq baxımından aşağıya doğru gediriksə, iradə göstərib o biri yola keçək və yüksəyə doğru hərəkət edək. Bu iş hər zaman mümkündür: Sənə doğru gedən yol yaxındır.[١] Allaha doğru hərəkət edənin yolu yaxındır. Əgər Allahın yoluna keçmək istəsək, məsafə çox yaxındır. Əgər yolçularının süquta və aşağıya doğru getdiyi bu yoldan bir addım atsanız, əbədi .səadətə, işığa və çox sadiq bəndələrin məqamına doğru gedən yola qədəm qoyarsınız

O biri tərəfdən də belədir. Biz nəfsimizin istəyinə qulaq asan və insanı Allah-Taaladan ,uzaqlaşdıran bir iş görən anda ayağımızı o yoldan götürüb



---

.Misbah əl-Mütəhəccid, c. ۲, səh: ۵۸۳ [۲] -۱

aşağıya doğru gedən yola qoyuruq. Biz öz nəfsimizin istəklərinin əksinə hərəkət etdiyimiz, eqoistliyə, qürura və nəfs itaətinə qarşı çıxdığımız anda ayağımızı bu yaxın məsafədən götürüb o biri yola qoyur və yüksəyə doğru gedirik. Böyük imamımız bu on ildən artıq müddətdə bizi həmişə nəfsə itaətdən çəkindirirdi, hamımıza, bütün İran xalqına, o cümlədən biz məmurlara deyirdi ki, ehtiyatlı olun və onun əsirinə çevrilməyin. Bu, ramazan ayında mümkündür. Ramazan ayında nəfsə nəzarət etmək .digər aylara nisbətən daha asandır

## Ramazan – Allahın xüsusi bəndələrinin ziyafət ayı

Hikmətli Allah Öz kitabında buyurur: Ey iman gətirənlər! Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də vacib edildi ki, (bunun vasitəsilə) təqvalı olasınız!(۱) Mübarək ramazan ayının başlanması müsəlmanlar üçün həqiqətən böyük bir bayramdır. Möminlər bu ayın gəlişi münasibəti ilə bir-birini təbrik etməli və bu aydan maksimum istifadəyə çağırmalıdırlar. Çünki bu ay ilahi ziyafət ayıdır. Bu ayda Səxavətli və Kərim Allahın süfrəsində yalnız möminlər və bu ziyafətə layiqli şəxslər əyləşirlər. Bu, Allahın bütün insanların və hətta bütün məxluqların bəhrələndiyi ümumi səxavət süfrəsindən fərqli bir şeydir. Bu, Allahın xüsusi bəndələrinin süfrəsi və .ziyafətidir

## Orucun insanın mənəvi təkamülünün əsas şərtlərindən biri olması

Əvvəla buyurur: Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də vacib edildi(۲). Biz bilirik ki, namaz və zəkat yalnız İslam ümmətinə məxsus deyil. Əziz İslam Peyğəmbərindən (s) qabaqkı peyğəmbərlər də namaz və zəkatı öz hökmlərinin başında qeyd etmişlər: O... mənə diri olduqca namaz qılıb zəkat verməyi tövsiyə buyurdu.(۳) Həzrət İsa peyğəmbər (ə) öz dinləyicilərinə buyurur ki, Allah mənə namaz və zəkatı tövsiyə etmişdir. Quranın digər ayələrindən də bu başa düşülür. Oxuduğum birinci ayədə buyurur ki, namaz və zəkat kimi oruc da yalnız İslam ümmətinə məxsus olmayan hökmlərdəndir. Keçmiş ümmət və peyğəmbərlərə də oruc tutmaq əmr .olunmuşdu

Bu onu göstərir ki, hər bir dövrdə insanların mənəvi həyatı üçün namazın lazım olduğu və bu namaz insanla Allah arasında mənəvi əlaqə yaratdığı kimi, həmçinin zəkatın

lazım olduğu və bu zəkat malın təmizlənməsi olduğu kimi, oruc da vacib və zəruridir və bu, insan təkamülünün, onun mənəvi yüksəlişinin



---

۱- [۳] Bəqərə/۱۸۳.

۲- [۴] Yenə orada.

۳- [۵] Məryəm/۳۱.

əsas şərtlərindən biri sayılır. Əks təqdirdə, müxtəlif dinlərin dəyişməsinə rəğmən, bu .xətt zaman boyu dəyişməz qalmazdı

Əlbəttə, oruc müxtəlif dinlərdə və müxtəlif dövrlərdə fərqli formalarda olmuşdur. Lakin ac qalmaq, qarını qidasız saxlamaq, ağızı, dili və dodağı müəyyən saatlarda fiziki ləzzətlərə bağlamaq müxtəlif dinlərin orucunda da mövcud olan bir xüsusiyyətdir. Deməli, oruc insanın mənəvi yüksəlişində, ruhi təkamülündə, hidayət və tərbiyəsində .əsas şərtdir

## Təqvanın təsir və faydaları, təqvasızlığın zərərləri

Buyurur ki, Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də vacib edildi ki, (bunun vasitəsilə) təqvalı olasınız. Yəni bu oruc təqvaya doğru pilləkan, qəlbinizdə və ruhunuzda təqva yaratmağa vasitədir. Təqva odur ki, insan özünün bütün rəftar və əməllərində ehtiyatlı olsun, gördüyü işin Allahın razılığına və əmrinə uyğun olmasına diqqət yetirsin. Belə daimi ehtiyatlılıq və çəkinmə halətinin adı .təqvadır

Təqvanın qarşı tərəfi qafillik, diqqətsizlik və ayıqlıq olmadan hərəkət etməkdir. Allah möminin diqqətsiz olmasını sevmir. Həyatın bütün işlərində möminin açıq gözü və ayıq qəlbi olmalıdır. Bu açıq göz və ayıq-sayıqlıq həyatın bütün işlərində möminə fayda yetirir, onu diqqətli edir, gördüyü işin Allahın istəyinin və dinin ziddinə olmasına imkan vermir. İnsanda bu ehtiyat yarandıqda, onun sözü, əməli, sükutu, qalxması, oturması - hər bir hərəkəti Allah-Taalanın təyin etdiyi xəttə uyğun olduqda, deməli, sözügedən diqqət və sayıqlıq haləti, yəni təqva yaranmışdır. Bu halət insanda həmişə olmalıdır. .Orucun faydası budur

## Təqvanın cəmiyyətə təsirləri

Əgər bir xalq, yaxud fərd təqvalı olsa, dünya və axirətin bütün xeyirlərinə sahib olar. Təqvanın faydası yalnız Allahın razılığını qazanmaq və axirətdə cənnətə getmək deyil. Təqvanın faydasını təqvalı insan dünyada da görür. Təqvalı cəmiyyət, Allahın yolunu diqqətlə seçən, o yolda diqqətlə hərəkət edən cəmiyyət dünyada Allahın nemətlərindən də bəhrələnir, dünyəvi iqtidara da nail olur, Allah dünya işlərində ona

elm və bilik də bəxş edir. Təqva yolunda hərəkət edən cəmiyyət və mühit sağlam və .sevgili olur, insanlar arasında əməkda.lıq ruhu yaranır

Təqva dünya və axirət xoşbəxtliyinin açarıdır. Müxtəlif fərdi və ictimai problemlərdən əziyyət çəkən sapqın bəşəriyyət təqvasızlığın, nadanlığın, diqqətsizliyin və ehtiraslar səbəbindən bataqlığa düşməsinin altını çəkir. İnkişaf

etməmiş cəmiyyətlərin halı bəllidir. İnkişaf etmiş cəmiyyətlərdə də bəzi sahələrdə ağıllı işlərindən yaranan nailiyyətlər olsa da, onlar da ölümcül çatışmazlıqlara düçar olmuşlar. Bu gün onların yazıçıları, natiqləri və sənət adamları bunu dönə-dönə .deyirlər

Təqva peyğəmbərlərin ilk və son tövsiyəsidir. Quranın müxtəlif surələrində oxuyursunuz ki, peyğəmbərlərin insanlara dediyi ilk söz təqva olmuşdur. Əgər təqva olsa, ilahi hidayət də olar; təqva olmasa, ilahi hidayət də fərdə və cəmiyyətə kamil .formada nəsib olmaz. Bu oruc təqvaya hazırlıqdır

Allah Hədid surəsinin başqa bir ayəsində buyurur: Ey iman gətirənlər! ilahi təqvanız olsun və Onun peyğəmbərinə iman gətirin ki, (Allah) sizə Öz mərhəmətindən iki pay versin, (Sirat körpüsündə) getməyiniz üçün nur bəxş etsin(١). Allah-Taala təqvaya görə sizin qəlbinizdə, həyatınızda və yolunuzda bir nur yaradır. Siz o nurun işığında hərəkət edib həyat yolunu tapa bilərsiniz. Bəşər gözübağlı hərəkət edə bilməz. Məqsədi tanımadan insanın hərəkət etməsi mümkün deyil. Bizə məqsədi, mənzili və yolu göstərən bu nur təqvadan irəli gəlir. Bütün peyğəmbər və övliyaların tövsiyəsi .təqvadır

Mən namazda iştirak edən siz qardaş və bacılara, xüsusən də cəmiyyətdə daha yüksək vəzifəsi olanlara tövsiyə edirəm ki, bütün işlərdə və həyatınızın bütün anlarında ilahi təqvanı özünüzə vacib sayasınız. İslam cəmiyyətində hamı məsuliyyət daşısa da, vəzifə nə qədər böyük və yük nə qədər ağır olsa, təqva ehtiyatına bir o qədər çox ehtiyac olar. Cəmiyyətin vəzifəli şəxsləri öz təqvalarını artırsınlar, nə etdiklərini bilsinlər, bir söz danışarkən, bir addım atarkən onda Allahın razılığının olub-olmamasını bilsinlər. Meyar budur. Əgər biz təqva qazansaq, and olsun Allaha, ən güclü maddi qüvvələr bizi getdiyimiz düzgün yoldan bir iynə ucu qədər də yayındıra .bilməzlər

### Ramazan ayını və Quran baharını qənimət bilmək

Ramazan ayını qənimət bilin. Bu günləri oruc tutmaqla, bu gecələri zikr və dua ilə keçirin. Dua mövsümü bu mübarək aydır. İnsan dua vasitəsi ilə həmişə Allahla əlaqə qurmalı olsa da, diqqət yetirmək lazımdır ki, Quranın Bəndələrim Məni səndən

soruşduqda söylə ki, Mən (onlara) yaxınam, dua edib Məni çağıranın duasını qəbul edərəm(۲) ayəsi Bəqərə surəsində oruca və ramazan ayına aid olan mübarək ayələrin arasında gəlmişdir. Və bu, bütün insanları, bütün bəndələri duaya və Allah zikrinə sövq .və dəvət etmək üçündür



---

.Hədid/۲۸ [۶] -۱

.Bəqərə/۱۸۶ [۷] -۲

Dua sizin qəlbinizdə Allahla yaratdığınız əlaqədir. Dua – istəmək və Allahı çağırmaqdır. İstəmək isə ümiddən sonrakı mərhələdir. Ümidiniz olmasa, Allahdan bir şey istəməzsiniz. Ümidsiz insan heç nə istəmir. Deməli, dua ümiddir, qəbul olunmasına ümidlə yanaşıdır. Bu ümid ürəkləri işıqlandırır və duanın sayəsində cəmiyyət həvəsli və .fəal olur

**İslam inancını gücləndirmək üçün Quranla ünsiyyətin təsiri**

Bu ay həmçinin Quranın baharıdır. Quranla ünsiyyət İslam inancını gücləndirir və dərinləşdirir. İslam cəmiyyətlərinin bədbəxtliyi Qurandan, onun həqiqət və bilgilərindən uzaq düşməsinin nəticəsidir. Quranın mənasını anlamayan və onunla ünsiyyətdə olmayan müsəlmanlar bir yana, hətta Quranın dili öz doğma dilləri olan və Quranı başa düşən insanlar da Quran ayələri üzərində dərindən düşünmədiklərinə görə Quran həqiqətləri ilə tanış olmur və ünsiyyət yarada bilmirlər. Quran buyurur: Allah heç vaxt kafirlərə möminlərin əleyhinə olan bir yol göstərməz!(١) Yəni Allah möminləri kafirlərin əlinin altında qoymaz və onların qarşısında xar etməz. Bu ayə ərəb ölkələrində və bütün dünyada ərəbdilli insanlar tərəfindən oxunur, amma ona əməl olunmur. Quran ayələri üzərində diqqətlə fikirləşib düşünmürlər və nəticədə İslam .ölkələri geridə qalır

Quranla ünsiyyət – onu oxumaq, yenə oxumaq, Quranın dedikləri haqda fikirləşmək və onları anlamaqdır. Qeyri-ərəb xalqlar Quranın tərcüməsindən istifadə edə, onun sözlərini təxmini şəkildə bilib məzmununu anlaya və o barədə düşünüb fikirləşə .bilərlər

Quran ayələri üzərində düşünsək, bizim iradə və müqavimətimiz güclənər, bundan da çox olar. Bir zaman küfr və zülmət dünyası ilə vuruşan insanları yetişdirən amil elə Quran ayələridir. Bu bilgilər bizim böyük xalqımızı zülmət dolu müasir cahiliyyət dünyası ilə – iyirminci əsrin modern cahiliyyəti ilə vuruşmağa vadar və qadir etdi. Ümidvarıq ki, bizim xalqımız Qurana və Quran həqiqətlərinə günbəgün daha !yaxınlaşsın

.Tehranın cümə namazı xütbələrindən: ١٩٩٠

Nəyiniz varsa, İslamdandır. Nəyiniz varsa, Allaha güvənməkdən və Onunla əlaqədəndir. Allahla əlaqəni unutmayın. Qarşıdan ramazan ayı – özünüislah ayı, ibadətin, Quranın, Allah zikrinin, Allahı yad etməyin, tövbə və yardım istəyinin baharı gəlir. Onun qədrini bilin. Xalqın müxtəlif təbəqələri, xüsusən də gənclər ramazan ayını qənimət bilib Allaha sığınsınlar, Onun hidayət və diqqətini istəsinlər, Ona arxalansınlar .və düşmənlərindən əsla qorxmasınlar

Həzrət İmam Rzanın (ə) ziyarətçilərinin və Məşhəd əhalisinin böyük toplantısındakı .çıxışdan: ۱۹۹۰

Allahı və Onun yolunu unutduran müxtəlif amil və səbəblər arasında qalmış, müxtəlif maraqların aşağıya, tənəzzülə və süquta doğru çəkdiyi bəşər ramazan ayında ucalığa və yüksəlişə meylli ruhunu yuxarıya doğru sövq etmək, Allaha yaxınlaşmaq və ilahi .əxlaqla bəzənmək üçün bir fürsət əldə edir. Ramazan ayı belə bir fürsətdir

Əlbəttə, ramazan ayından başqa imkanlar da var. Məsələn, gündəlik beş namaz bizim istifadə edərək yüksələ biləcəyimiz imkanlardır. Biz bununla özümüzü islah edib mənəvi pasları, çürükləri, qafillik və xəstəlikləri özümüzdən uzaqlaşdıra bilərik. Namaz çox yaxşı fürsətdir. Siz yəqin ki, bunu sınaqdan keçirmisiniz. Həmişə əməliniz belə olsun və təcrübə edəsiniz. Yaddan çıxarmayın ki, namaz halında özünüzə və gördüyünüz işə qarşı diqqətli olsanız, namazdan sonrakı halınız ondan qabaqkı halınızla mütləq fərqlənəcək. Bunun şərti namazda diqqətli olmaqdır. Nə iş gördüyünüzə diqqət yetirin. Daha yaxşısı budur ki, namazın zikrlərini anlayın. Bu çox .asan işdir

Deyə bilmərik ki, biz ərəb deyilik və namazın sözlərini anlaya bilmirik. Namazda əvvəldən axıra qədər deyilən bütün sözləri öyrənmək üçün orta istedadlı insanlar üçün bir saatdan artıq vaxt lazım deyil. Bu çox asandır. Bu barədə kitablar yazmış və namazın sözlərini tərcümə etmişlər. Əgər mənalara diqqət yetirib bu sözlərin məzmununun nədən ibarət olduğunu anlasanız və o barədə fikirləşsəniz, əlbəttə ki, daha yaxşı olar. Əgər bu da mümkün olmasa, ən azı səcdə halında olarkən Allahla danışdığınızı bilin; rüku halında olarkən aləmlərin Yaradınına təzim etdiyinizi bilin; qiraət və zikr halında olarkən kiminlə danışdığınızı bilin. Bu diqqətin özü mühüm .məsələdir

Əgər bu diqqət yaransa və namazda həqiqətən Allah yad olunsa, bu namaz sizin üçün möminin meracı olacaq, sizi ucaldacaq. Bunun əlaməti odur ki, siz namazdan sonra öz daxilinizdə daha çox paklıq, mənəviyyat və nurluluq hiss edirsiniz. Maliyyə ibadətləri də belədir. Müxtəlif ibadətlər bizim üçün fürsətlərdir, lakin ramazan ayı il ərzində .müstəsna bir imkandır

Bu otuz, yaxud iyirmi doqquz gündə həmişəki beş vacib namazdan və insanın həmişə

qıla bildiyi nafilə namazlarından əlavə, bəzi dualar da var. Həmin duaları oxumaq insana əlavə nur bəxş edir. Bu duaları bizim ixtiyarımızda qoymuş, Allahla danışmaq və münacat etmək yolunu öyrətmiş, Allaha hansı sözləri deməyin mümkünlüyünü göstərmişlər. İmamlardan nəql olunan bu duaların bəzi cümlələri olmasaydı, insan özü Allahla bu formada danışmağın və Allahdan bu şəkildə istəməyin mümkünlüyünü .təxmin edə bilməzdi

### Ramazan – özünü yenidən islah etmək, tanımaq və fəsaddan qurtulmaq mövsümü

Bundan əlavə, ramazan orucunun özü insanda ruhani və mənəvi bir əhval yaradır, onu ilahi lütfü qazanmağa hazırlayır. Ramazan ayında bütün əməllərə – namaza, daimi vəzifələrə, oruca, bu ayın dualarına diqqət yetirin və Quran oxuyun. Deyilib ki, ramazan ayı Quranın baharıdır. Bu, özünü yenidən islah etmək, yenidən tanımaq, .paslardan və fəsadlardan qurtulmaq mövsümüdür. Bu çox faydalı bir zamandır

Əsas məsələ budur ki, biz ramazan ayında Allaha doğru hərəkət edə bilək və bu mümkündür. Dedim ki, bəzən ramazan ayından sonra imamın yanına gedəndə onun daha nurlaşdığını, danışığının, baxışının, hərəkətinin və fikirlərinin ramazan ayından öncə ilə fərqləndiyini duyurdum. Ramazan ayı mömin və uca bir insan üçün belədir. Onun qəlbinə və daxilinə elə işıq bəxş edir ki, insan bunu hiss edir, danışığından anlayır. .Allahın bəndələri belədirlər. Biz bu fürsətdən çox istifadə etməliyik

### Günahı tərk etməyin əhəmiyyəti

Öz əməli həyatımıza dair bir məsələni xatırlatmaq istəyirəm. Bu mənim özüm və siz qardaş və bacıların hamısı üçün daha yaxşı və daha çox əmələ səbəb ola bilər. O məsələ budur ki, Allaha yaxınlaşmaq üçün əsas amil günahları tərk etməkdir. Müstəhəb işlər görmək, təvəssül, dua və digər işlər ikinci dərəcəlidir. Əsas məsələ budur ki, insan özünün günah etməsinə mane olsun. Bunün üçün təqva lazımdır. İnsan vücuduna lazım olan ən mühüm, yaxud ən birinci şərt təqvadır. İnsanın günah etməsinə mane olan amil budur. Günah insanı hətta ilahi əfvin əzəmətli dəryasına yaxınlaşıb, ondan istifadə etməyə də qoymur. Günah bizim dua və zikr halı əldə etməyimizə imkan vermir. Günah bizi özümüzə yenidən baxmaq və özümüzü islah .etmək barədə düşünməyə, çalışıb günahdan uzaqlaşmağa qoymur. Birinci şərt budur

Əlbəttə, günahlar müxtəlifdir; fərdi və ictimai günahlar, əlin, gözün, dilin vasitəsi ilə və müxtəlif yollarla baş verən günahlar var. Yəqin ki, müsəlmanlar günahlar haqda məlumatsız deyillər və nəyin günah olduğunu bilirlər. Dua edən, müstəhəb işlər görən, şəriət vəzifələrini yerinə yetirən, lakin bunların kənarında günahdan çəkinməyən insan soyuqladığı və qızmasının yüksəldiyi zaman həm soyuqdəymə əleyhinə dərmanlar içən, həm də xəstəyə zərərli qidalardan istifadə edən şəxs kimidir. Məlum məsələdir

.ki, xəstə zərərli qidalar qəbul etsə, dərmanın təsiri olmayacaq

Allahın rəhməti, əfvi və mənəvi mərhəmətləri üçün şərait yaratmaq lazımdır və bu, günahı tərk etməklə yaranır. Buna görə Əmirəlmömininin (ə) Kumeyl duasında belə deyir: İlahi! Mənim duanı həbs edən günahlarımı bağışla.(١) Yəni günahlar duanın qəbul olunmasına mane olur. Bu gecələrdə şərafətli Əbu Həmzə duasında oxuyursunuz ki, İlahi, mənimlə vəzifələrimi yerinə yetirməyə və özümü Sənə yaxınlaşdırmağa mane .olan günahım arasında fasilə yarat.(٢) Əsas məsələ günahı tərk etməkdir

**İslam cəmiyyətində sağlam mühiti qorumağın və günahdan çəkinməyin əhəmiyyəti**

İslam quruluşunun ən müsbət cəhəti mühitin günahla dolmamasıdır. Tağut quruluşlarında mühit bulaşıqdır; insan günah etmək istəməsə də, sanki mümkün olmur və hər şey insanı günaha sarı çəkir. İslam quruluşunda isə belə deyil, mühit insanı günaha səsləmir. Günahkar var, müxtəlif səviyyələrdə və müxtəlif işlərdə çalışan, müxtəlif səlahiyyətlərə malik olan günahkarlar var, lakin günah yalnız şəxsi məsələ olur; yəni insanın nəfsi onu günaha çəkir. İslam quruluşu günahın ictimai inkişaf meyarı sayıldığı tağut və şeytan quruluşlarından fərqlidir. İslam quruluşunda .günah nəinki inkişaf meyarı deyil, hətta inkişaf və dəyərin ziddi, tənəzzülün meyarıdır

Günahı kimin etməsinin fərqi yoxdur. Demək olmaz ki, günahı bu şəxs edirsə, eybi yoxdur. Xeyr! Günahı tanımaq və günahkarı onunla müəyyən etmək lazımdır. Günah edən günahkardır, kim olursa-olsun. Biz deyə bilmərik ki, bu işi filankəsin gördüyünə görə yəqin ki, eybi yoxdur, əgər eybi olsaydı, etməzdi. Sözsüz ki, bədgüman olmamaq yaxşıdır. İnsan bütün möminlərə qarşı nikbin olmalı və imkan daxilində fəsada yozmamalıdır, amma bir şəxsdən aşkar bir səhv baş verdikdə bunun kim olmasının heç bir fərqi yoxdur. Edən kim olursa-olsun, günah günahdır. Hətta böyük şəxslər .günah etdikdə qəbahəti daha çox olur

Buna əsasən, əsas məsələ günahdan çəkinməkdir. Biz bu ramazan ayında çalışıb iradə göstərməli və günahdan uzaqlaşmalıyıq. Əgər bu baş versə, o zaman ruhani aləmə yüksəlmək və pərvaz etmək yolu açılacaq, insan onun üçün təyin olunmuş mənəvi və ilahi yolla gedə biləcək. Amma ağırlıq edən günahlarla belə bir şey mümkün deyil. .Ramazan ayı günahdan uzaqlaşmaq üçün əlverişli fürsətdir

Ümidvarıq Allah burada iştirak edən siz qardaş və bacılara, həm də bütün ölkədə və bütün dünyada olan müsəlman və möminlərin hamısına bu ramazan ayından bəhrələnmək, özlərini ilahi əxlaqla bəzəmək səadəti nəsib etsin! Onlar ən azı bu işə başlasınlar. Bəşəriyyət bu yolla irəlilədikcə problemləri azalacaq və bitəcək.

Mübarək ramazan ayının on birində xalqın müxtəlif təbəqələri ilə görüşdə çıxışından: ١٩٩٠.

Qarşıdan mübarək ramazan ayının bizim mərhum və böyük imamımız tərəfindən Qüds günü adlandırılan son cüməsi gəlir. Builki Qüds günü ramazan ayının qədr gecələri ilə qonşudur. Qədr gecəsində səhərə qədər oyaq qaldığımız, Allah dərgahına dua və münacatımızla bizim üçün yaxşı gələcəyin yazılmasını istədiyimiz kimi, Qüds gününü və İslam tarixinin qədr gecəsi olan bu həssas günləri də ayıq-sayıq şəkildə keçirməli və müsəlman xalqların, xüsusən də şücaətli və məzlum Fələstin xalqının .qurtuluş şəfəqinin doğuşuna qədər səyimizi dayandırmamalıyıq

Mən ümidvaram ki, bizim böyük xalqımız həmişə olduğu kimi bu il də Qüds günündə hamılıqla küçələrə çıxacaq, cümə namazları qılınan yerlərə qədər yürüş edəcək, uca fəryadlarını və şimşəyə bənzər səslərini bütün dünyaya çatdıracaq, əzəmətli İmam Xomeyni ümmətinin həmişə Fələstinin yanında və onun düşmənlərinə qarşı olduğunu .göstərəcək

.Ümumdünya Qüds Günü münasibəti ilə müraciətdən: ۱۹۹۰

İnsanın təkamülünə mane olan, Quranda və imamların hədislərində müxtəlif sözlərlə qadağan olunmuş xüsusiyyətlərdən biri təkəbbürlülükdür. Bu xüsusiyyət insanın mənəvi inkişafı üçün çox təhlükəlidir. Tarixin əvvəlindən başlayan bütün bu qalmaqalların – peyğəmbərlərin gəlişinin, çoxlu mübarizələrin, haqq və batilin vuruşmasının, müharibələrin, döyüşlərin, çəkişmələrin, çətinliklərə dözmələrin, haqq tərəfdarlarının böyük səyinin, hətta İslam hökuməti qurmağın və İslam ədalətini bərqərar etməyin son məqsədi insanın təkamülü və Allaha yaxınlaşmasıdır. Hər şey buna müqəddimədir. Təkəbbürlülük isə elə bir haldır ki, kimdə olsa, o şəxs özünə vurğunluq halətinə düçar olur, özünə, işinə, məlumatına və fərdi xüsusiyyətlərinə heyran olur, bunlar onun gözündə böyük, gözəl və ideal görünür. Bəlkə də bəşəri təkamül yolunda ən böyük maneə, ən pis dərd və xəstəlik özünü böyük, pak, .nöqsansız, güclü və digərlərindən üstün bilməkdən ibarətdir

Təkəbbürlülüyün xüsusiyyətlərindən biri insanın özünü digərlərindən böyük görməsidir. Bu, təkəbbürün mənası deyil, onun xüsusiyyətlərindən biridir. Bu çox təhlükəli və qəribə bir şeydir. İnsan Quran ayələrinə baxanda müxtəlif sözlərlə bu xüsusiyyətdən söz açıldığını görür: istela (ucalıq istəyi), ülüvv (böyüklük), istikbar (hegemonluq), təkəbbür. Quranda bunun üzərində çox təkid olunmuş və Allah yolunda .hərəkət edən mömin insanın bu xüsusiyyətdən çəkinməsi çox tapşırılmışdır

İnsanın özünü qüdrətli görməsi təkəbbürlülüyün bir növüdür. İnsan özünü qüdrətli, sərvətli, ehtiyacsız, yaxud elmli hiss edir və öz elminə çox güvəndiyinə görə deyilən hər bir sözü elmi ilə ölçür; elminin dairəsinə sığanı düzgün sayır, sığmayanı isə rədd edir. Bu da təkəbbürün bir şaxəsi və təhlükəli növlərindən biridir. Hətta ibadət adamları, zahidlər və mənəvi insanlar üçün də öz sahələrində təkəbbür vardır. Abid və zahid insanın öz ibadəti ilə fəxr etməsi təkəbbürün şaxələrindən biridir; özünü böyük .görmək, özünü pak görmək, özünü digərlərindən üstün bilmək

Bir şəxs qədr gecəsini dua ilə, münacatla, ağlamaqla, Allaha ibadətlə, namaz, tövbə və bu kimi işlərlə keçirir, ertəsi gün xalqın içinə çıxıb küçələrdə öz işi ilə məşğul olan camaatı görəndə isə öz-özünə deyir: Ey yazıqlar! Dünən gecə siz hansı halda idiniz, biz

hansı halda idik! Siz qəflət içərisində idiniz – yəni özünü digərlərindən üstün sayır. Bu .işlərin hər biri insanın təkamülü və inkişafı üçün öldürücü zəhərdir

Bizim kimi adi adamlar ümumi təkəbbürlərə düçar oluruq. Hansı məqam və dərəcədə olmalarından asılı olmayaraq, mənəvi dərəcələrə və uca məqamlara

səh:١٣

malik olanlar da böyük təhlükə olan təkəbbürə düçar ola, özləri ilə öyünə və özlərini .böyük görə bilərlər. Bu təhlükə hər hansı bir səviyyədə olan hər bir şəxs üçün realdır

Allah yolunun birinci addımı özünü sındırmaq, özünü tam yoxsul və əliboş görməkdir. Yəni insan güc, sərvət, elm və digər müsbət xüsusiyyətlərə malik olsa da, sərvətin və iqtidarın zirvəsində dursa da, kompliment kimi yox, həqiqətən özünü Allahın qarşısında ehtiyaclı, yoxsul, kiçik və dəyərsiz bilməlidir. Bu, insani kamillik ruhiyyəsidir və sözsüz .ki, buna nail olmaq üçün çox çalışmaq lazımdır

**Təkəbbürü sındırmağa dair bir hekayə**

Öz dövrünün böyük övliyalarından, ariflərindən və mənəvi şəxsiyyətlərindən olan mərhum Hacı Mirzə Cavad Ağa Təbrizi təhsil almaq üçün Nəcəfə gələndə, tələbə olsa da, zadəganlar kimi hərəkət edirdi; arxasınca nökər gəzirdi, çiyninə qiymətli xəz atırdı, bahalı paltarlar geyinirdi. O, zadəgan ailədən idi, atası, yaxud babası Təbrizdə məliküttüccar – tacirlər ittifaqının başçısı olmuşdu. O, hövzə tələbəsi, fəzilətli və mənəviyyatlı bir şəxs idi. Bu saleh və mömin gənc o dövrün məşhur arifi, əxlaq, irfan və tövhid müəllimi olan mərhum Axund Molla Hüseynqulu Həmədaninin məclislərində iştirak etmək səadətinə nail oldu. Molla Hüseynqulu Həmədani öz dövründə Nəcəfdə mənəviyyat və irfan adamlarının mürşidi və qibləsi idi. Hətta böyük alimlər də gedib .onun yanında oturur və mənəviyyat nurundan istifadə edirdilər

Mərhum Hacı Mirzə Cavad Ağa birinci gün Axund Molla Hüseynqulu Həmədaninin dərsinə zadəgan tələbə görkəmində gedir. Məclisə girmək istəyəndə axund məclisin başından səsləyir ki, qapının ağzında ayaqqabıların üstündə otur. Hacı Mirzə Cavad Ağa da orada əyləşir. Əlbəttə, bu ona toxunur və təhqir edildiyini duyur. Amma bunun özü – bu ilahi tərbiyə və təlimə dözmək ona uğur gətirir. Dərsi davam etdirir, müəllimə layiq olduğu kimi hörmət göstərir və onun dərsinə gedir. Bir gün dərs qurtaradan sonra mərhum Axund Molla Hüseynqulu Həmədani Hacı Mirzə Cavad Ağaya üzünü tutub deyir ki, get mənim qəlyanımı doldur gətir. O qalxıb qəlyanı aparır. Amma bu işi necə görsün?! Zadəgan nəslindən olan kübar bir gənc hamının gözü önündə, elə bahalı paltarlarda... Baxın, saleh və böyük insanları belə yetişdirirdilər. Qəlyanı aparıb bayırda dayanan nökərinə verir və deyir ki, bunu doldur gətir. O gedib qəlyanı hazırlayır, gətirib

Mirzə Cavad Ağaya verir və qəlyanı məclisə onun özü aparır. Onun qəlyanı əlinə götürüb məclisə gətirməsi də mühüm və ağır iş səh:۱۴

sayılırdı, amma eyni zamanda mərhum Molla Hüseynqulu deyir ki, qəlyanı özünün .düzəltməni istədim, nökərinə düzəltdirməni yox

Bu, insanın daxilində olub hər işə qarışan və insani şirkə bais olan məni sındırmaqdır. Bu, sözügedən qüruru, təkəbbürü, özünü üstün görmək, özü üçün haqq qarşısında dəyər və məqam tanımaq xislətini məhv edir, insanı mərhum Mirzə Cavad Ağa Məliki Təbrizinin getdiyi yola yönəldir, onun nail olduğu kamillik dərəcələrinə çatdırır. O öz dövründə mənəviyyat əhlinin qibləsinə çevrildi. Bu gün də o həzrətin qəbri mənəviyyat və irfan adamlarının yad etdikləri mərkəzdir. Buna əsasən, birinci addım hər bir insanın daxilində olan məni sındırmaqdır. Əgər insan daim diqqətlə, zikrlə, moizə və .riyazətlərlə onu xar və zəbun etməsə, daxilində inkişaf edib bir firona çevriləcək

Dünyanın bütün fəsadları insanların qürurundan irəli gəlir. Bütün zülmlər, bütün ayrıseçkiliklər, bütün müharibələr, tökülən qanlar, törədilən bütün nahaq qətllər, həyatı bəşərə acıladan, insanı öz səadətindən uzaqlaşdıran bütün işlər mənim və sizin daxilimizdə olan bu qürurun və fironun nəticəsidir. Əgər onu cilovlamasaq, bizim vücudumuzda olan bu nadinc atın ağzını buxovlamasaq, çox təhlükəli olacaq; yalnız insanın özü üçün yox, hətta məqamına və təsir dairəsinə uyğun olaraq ətraf dünya üçün də təhlükəli olacaq. İnsanın özünü bədbəxt edən bu qürur onun gücü qədərincə real aləmə də təsir buraxır və onda fəsad yaradır. Buna görə Quranda buyurur: Məgər təkəbbür edənlər üçün cəhənnəmdə yer yoxdur?![١] Cəhənnəm təkəbbürlü insanların yeridir. Günah, fəsad və bədbəxliklər təkəbbürdən irəli gəlir. İnsanların təkəbbürü onların daxilində, həmçinin onları əhatə edən mühitdə bir dünya yaradır, o dünyada .şeytan hakim və söz sahibi olur

### Neml surəsinin Allah qarşısında kiçilməyə dair zərif dərsləri

Mən mübarək Nəml surəsinə baxırdım. Süleyman peyğəmbərin (ə) çox möhtəşəm əhvalatının bir qədəri bu surədə qeyd olunmuşdur. Təxminən bütün hadisələr həmin mövzu ətrafında baş verir. Surə Musa peyğəmbərlə (ə) başlayır, təkəbbürlü firondan danışır. Yəni bir insan öz zahiri gücü və qüdrəti ilə elə öyünür ki, ondan firondan yaranan bir dünya yaranır. Sonra dərhal Süleyman (ə) və Davuddan (ə) söz açır: Biz Davuda və Süleymana (ə) elm əta etdik.[٢] Allah-Taala bunlara elm, hakimiyyət və

qüdrət verdi. Süleyman (ə) ətrafındakı insanlara müraciət edərək dedi: Bizə hər şeydən verildi.(٣) Yəni Allah-Taala bir

səh:١٥

---

١- [١١] Zümər/۶٠.

٢- [١٢] Nəml/١۵.

٣- [١٣] Nəml/١۶.

hakimiyyətə lazım olan bütün imkanları Süleymana bəxş etmişdi. Süleyman (ə) mülkü, Süleyman (ə) hökuməti Bəni-İsrailin bir neçə yüzillik səyinin məhsuludur; yəni haqq Musanın (ə) firona təklif etdiyi haqdır. Bəni-İsrailin uzun illər can atdığı bu haqqın və tövhid hakimiyyətinin timsalı Davudun (ə) hökumətidir. Ondan sonra isə Süleyman (ə) .peyğəmbərin möhtəşəm hakimiyyəti başladı

Süleyman peyğəmbərin (ə) bu surədə qeyd olunan bütün əhvalatı təxminən bu məqam ətrafındadır ki, yalnız maddi və adi qüvvələrin yox, hətta mənəvi və qeyri-adi qüvvələrin də açarlarına malik olan, ondan öncə və sonra heç kimin sahib olmayacağı hökumətə, gücə və əzəmətə malik olan bu insan qüdrətin zirvəsində də Allah qarşısında kiçilir və təzim edir: Nə gözəl bəndə! O, daim Allaha sığınan bir kimsə idi.(١) Allah Quranın çoxlu ayələrində - Nəml, Səbə, Sad, Bəqərə surələrində Süleymanın adını çəkmiş və onu əvvab - yəni Allah qarşısında kiçilən, Allaha sığınan və bütün .işlərini Allaha tapşıran bir bəndə kimi təsvir edir

Süleyman peyğəmbərin (ə) Nəml surəsində qeyd olunmuş əhvalatının bu hissəsində də elədir. Əvvəlcə qarışqalardan başlayır: Onlar nəhayət qarışqa vadisinə gəlib çatdıqda bir qarışqa dedi: "Ey qarışqalar! Yuvalarınıza girin ki, Süleyman və ordusu özləri də bilmədən sizi (ayaqları altında) basıb əzməsinlər!(٢) Bir qarışqa digər qarışqalara deyir ki, Süleymanın (ə) əsgərləri bilmədən və diqqət yetirmədən sizi tapdayarlar. Süleyman peyğəmbər (ə) bu sözləri başa düşür. Bu, ilahi qüdrətdir. Bu peyğəmbər qarışqanın insan üçün dərkediləsi olmayan səsini necə eşidə bilər?! Bu, ilahi qüdrətdəndir. Süleyman peyğəmbər (ə) quşların da dilini bilir, sözlərini anlayırdı. Bunlar elm inkişaf etdikcə, quşların, canlıların və bitkilərin xüsusiyyətləri öyrəndikcə, .daha çox başa düşüləcək və qəbul olunacaq

Bir zaman bu sözlərin hansı deyilirdisə, adi camaat və hətta alimlər onu rədd edirdilər. Təxminən yüz il öncə Hindistanda və Misirdə ١٩-cu əsr Avropasının təfəkkürləri ilə yaxından tanış, tamamilə materialist təfəkkürlərə malik olan və mənəviyyatı inkar edən təfsirçi və ziyalılar vardı. Bunlar buna bənzər nə görürdülərsə, başqa mənaya yozurdular. Halbuki buna heç bir ehtiyac yoxdur. Elmin inkişafı bizə bu qəbildən olan çoxlu məsələlərin mümkünlüyünü isbat etmişdir. İddia etmişlər ki, onları da anlamışlar və dərkolunasıdır. Hər halda, Quranın konkret məzmunlu ayəsində şübhəyə yer

.yoxdur və biz onu qəbul edirik. Bu, bizim üçün dərkolunasıdır



---

.Sad/۳۰ [۱۴] -۱

.Nəml/۱۸ [۱۵] -۲

Əzəmətli hakim qarışqanın sözünü eşidəndə təbəssüm etdi.[١] Bu çox şirin və simvolik bir şeydir. Qarışqa zəiflik və kiçiklik tərənnümüdür, Süleyman (ə) isə insani qüdrət və əzəmətin tərənnümü. Bundan böyük əzəmət yoxdur. O, ən kiçik məxluqun tənəli sözünə qəzəblənmir və intiqam almaq istəmir. Bu çox böyük ruhiyyədir. Əlbəttə, peyğəmbərdə belə ruhiyyələr gözləniləndir, amma adi insanlar üçün bu qədər səbir və .mənəvi dözümlülük mümkün deyil

Süleyman peyğəmbərə (ə) aid olan bu əhvalatlarda diqqətəlayiq bir məqam var, Qurani-kərimdə bunun üzərində təkid olunmuşdur. Həmin məqam da bu istiqamətdədir. Dedim ki, bu surədə Süleymana aid olan hissənin sanki hamısı həmin məsələ ətrafındadır: yəni qüdrətli insanların Allah-Taala qarşısında necə kiçilməsi, özlərini görməməsi, öz heysiyyətlərini və qürurlarını saymaması, Allah qarşısında heç .olması və bunun insani kamilliyə səbəb olması

Süleyman (ə) Səbə padşahı Bilqeysin hökumətindən xəbər tutan kimi ona elçi göndərdi ki, mənə qarşı təkəbbür göstərməyin və müti halda yanıma gəlin.[٢] Yəni bu qalib ilahi qüvvə bütün firon qüvvələri, şəxsi və şeytani gücləri məhv, hamısını Allah-Taala qarşısında təslim edir. Səbə şəhəri təxminən Yəməndə, yaxud Şimali Afrikanın yaxınlığında bir yer idi. Onun yeri dəqiq bilinmir. Süleyman (ə) Bilqeysə xəbər göndərir ki, mənə təslim olmalısan. Bilqeys Süleymana (ə) hədiyyə göndərir, lakin o, hədiyyəni rədd edərək məsələnin maliyyə mübadiləsi və bazarlıq məsələsi olmadığını, Allah .qarşısında təslimçilik və iman məsələsi olduğunu göstərir

Bilqeys Süleymanın (ə) sarayının yerləşdiyi yerə daxil olanda Süleyman (ə) ixtiyarında olan fövqəltəbii qüvvə ilə şüşədən bir qəsr, eyvan və böyük bir yer düzəltməyi əmr edir: Onun (Süleyman) üçün nə istəsə - məbədlər (uca qəsrlər), heykəllər... düzəldirdilər[٣]. Şüşədən bir qəsr, yaxud möhtəşəm bir eyvan düzəltdilər. Bilqeys ora girmək istəyəndə şüşələrin parıltısından onların su olduğunu düşündü. Amma buna məcbur olduğundan girərkən paltarını bir qədər qaldırdı ki, islanmasın. Bu zaman Süleyman (ə) ona buyurdu: Bu, büllurdan tikilmiş bir saraydır.[٤] Bunlar su deyil, .şüşədir və paltarını qaldırmana ehtiyac yoxdur

Burada elmə, qüdrətə, izzətə, sərvətə və hər şeyə malik olan Süleymanın (ə) əzəməti

birdən-birə Bilqeysin qürurunu sındırdı. Onun müsəlman olması və



---

۱- [۱۶] Nəml/۱۹.

۲- [۱۷] Nəml/۳۱.

۳- [۱۸] Səbə/۱۳.

۴- [۱۹] Nəml/۴۴.

iman gətirməsi üçün əsas maneəni ortadan götürdü. Hər halda, o da padşah və qüdrətli bir şəxs idi. Qüdrətli insanlar bir-birinin qarşısında durduqda daha çox təkəbbür edir, təkəbbürlü ruhlarına və azğın nəfslərinə daha çox sərbəstlik verirlər. Hər halda, qarşılıqlı rəqabətdir. Rəqabət zamanı insanın firon xisləti daha çox zahir olur. Bu vəziyyətlə Bilqeysin iman gətirməsi imkansız idi. Əgər iman gətirsəydi də, süni və qorxudan olacaqdı. Nə üçün? Çünki daxilində olan şahlıq və qüdrət hissi iman gətirməsinə qoymayacaqdı. O belə bir əzəmətin qarşısında qaldı; qüdrət və əsrarəngizlik bir insanda cəm olmuşdur, amma eyni zamanda bu insan özünü Allahın bəndəsi bilir. Belə bir əzəmətin qarşısında qaldıqda Bilqeysin daxilindəki qürur şüşəsi sındı: Dedi: Ey Rəbbim! Mən həqiqətən özümə zülm etmişdim.(١) Bu böyük əlamətləri görəndən sonra Bilqeys Allahla münacata başladı: Mən artıq Süleymanla (Süleymanın sayəsində) aləmlərin Rəbbi olan Allaha təslim oldum. O, ürəkdən İslam gətirdi, təslim .oldu - yəni maneə ortadan götürüldü

Burada da Allah-Taala göstərir ki, bir insan öz daxili təkəbbürünün əsiri olunca iman gətirməsi mümkün deyil. Bu tilsim sınanda onun iman gətirməsi də asanlaşır. Bu, Quranın və İslamın böyük dərsidir. Dünyada mövcud olan bütün problemlər həmin təkəbbürlülüklərə görə yaranmışdır. Bu gün dünyada qüdrət sahibi olanlar, böyük və puç güclər, əslində heçnə olanlar bu gün qüdrətlidirlər, sabah isə bədbəxt olacaqlar. Bu gün bir şahdır, amma iki gündən, bir həftədən sonra öz canını qoruya bilməyən aciz və gücsüz bir məxluq olacaq. Tarix belə hadisələrlə doludur. Bu necə güc, necə qüdrətdir ki, insan onunla fəxr edib öyünsün! Bəzi sərvətlilər öz sərvətlərinə güvənir və bunun ehtiyacsızlıq olmadığını bilmirlər. Bu, şərafətli Ələq surəsində buyurulan haldır: Xeyr, insan özünün ehtiyacsız olduğunu gördüyü üçün azğınlıq edər.(٢) İnsan özünü .ehtiyacsız gördükdə və hiss etdikdə azğınlıq edir. Azğınlığın amili budur

Çoxlu pulu, sərvəti və imkanı olan, amma özünü ehtiyacsız bilməyən, bu sərvətə güvənməyən və özünü Allahdan asılı bilən çoxlu şəxslər var. Belə insan azğınlıq etməz. Dünyanın bütün sərvətinə malik olan Süleyman peyğəmbər (ə) belə bir insanın kamil nümunəsidir. Tarix boyu ilahi hökumətlərin, hakimiyyətə gəlmiş peyğəmbər və övliyaların hər biri belə olmuşdur. Cəmiyyətin sərvət və imkanları onların ixtiyarında olmuşdur, amma özlərini ondan ayırmışlar. Əmirəlmömininin (ə) şəxsi sərvəti də vardı,

daim qazanır və ehtiyaclılara verirdi. Cəmiyyətin sərvəti və beytülmal da onun ixtiyarında idi, istədiyi qədər xərcləyə bilərdi, amma bu sərvətə göz dikmirdi.



---

۱- [۲۰] Nəml/۴۴.

۲- [۲۱] Ələq/۶-۷.

İnsan üçün təhlükəli olan bu ehtiyacsızlıq, öz qüdrət və biliyinə arxalanmaq hissidir. Qurani-kərim Qarunun əhvalatını danışarkən deyir ki, ona nəsihət verəndə belə cavab verirdi: Mən onu elmlə əldə etmişəm.(١) Mən bu sərvəti öz elm və biliyimlə əldə etmişəm və bunlar özümə məxsusdur. Bu qürur, fəxr, təkəbbür, insanın malik olduğu, .böyük və çox sandığı dəyərsiz sərvətə güvənmək ən böyük bəladır

İslam Respublikasında bütün təbəqələr - istər quruluşda vəzifə tutanlar - əlbəttə ki, bu şəxslərin vəzifəsi daha ağır, daha təcili və daha vacibdir - istərsə də adi camaat çalışıb özlərində bu təvazökarlıq hissini yaratsınlar, azğınlığa səbəb olan təkəbbürlülüyü məhv etsinlər. Belə olsa, çoxlu problemlər həll olunacaq və cəmiyyət həqiqətən müsəlman cəmiyyəti olacaq. Biz bu işləri görməliyik. Nə gözləyirik? Bizim daxilimizdə olan o hiss və vəsvəsə daim bizə deyir ki, digərlərindən üstünük, bizim sözümüz digər sözlərdən daha məqbuldur, bizim məqamımız ayrılarının məqamından ucadır. Bu, İslam quruluşunda fəsada, ixtilafa və hər şeyin qırılmasına bais olur. Bunu məhv etmək lazımdır. Əgər biz öz vücudumuzda və cəmiyyət səviyyəsində bu şeytani xisləti məhv etsək, qardaşlıq və həmkarlıq, daha yaxşı və daha güclü birlik yaranacaq .və cəmiyyət özünün ilahi şəfasını tapacaq

Əmirəlmöminin (ə) şərafətli Nəhcül-bəlağə kitabında təkəbbürlülük xüsusiyyəti və onun müalicəsi barədə gözəl sözlər buyurmuş, bu haqda o həzrətdən dürlü kəlamlar nəql olunmuşdur. O həzrətin həyatı da Allah üçün və Allah yolunda bəndəliyin timsalıdır. Bəlkə də insan vücudundakı təkəbbürlülük və qürur hissinin qarşı tərəfini ilahi hökmləri qəbul etməklə yanaşı olan bəndəlik və Allah qarşısında mütləq təslimçilik .hesab etmək olar

Bu, Allah övliyalarının xüsusiyyətidir və Əmirəlmöminin (ə) buna hər kəsdən daha çox yiyələnmişdi. O həzrət ömrünün və İslam yolunda mübarizələrinin əvvəlindən xəlifə seçildiyi zamana qədər, eləcə də xilafət və hökuməti dövründə, siyasət meydanının tağutları, təkəbbürlüləri və hegemonları ilə mübarizə zamanı insanların daxilində olan həmin hegemon ruhiyyə ilə də mübarizə aparırdı. Onun fərdi əməli belə idi. O həzrətin öz vücudunda olan təvazökarlıq və Allah qarşısında kiçilmə hissi möhtəşəm və

.müstəsna bir hiss idi və o digərlərində də bu hissi yaradırdı

Ümidvarıq ki, Allah-Taala Quranın kəramətli ayələri və təqvalılar ağasının sözləri sayəsində o həzrətə aid olan bu günlərdə bizə ilahi bəndəlik



---

.Qəsəs/٧٨ [٢٢] -١

!yoluna qədəm qoyub özümüzü Allahın layiqli bəndəsi etmək səadətini nəsib etsin

## Allah dərgahına dua

İlahi! Səndən istəyir, Səni çağırır və əzəmətli, ən böyük, ən izzətli, ən şanlı və ən kəramətli adına and veririk! Ey Allah! Ey Allah! Ey Allah! İlahi! Ey Həmid Allah, Məhəhəmməd haqqına! Ey Ali Allah, Əli haqqına! Ey Fatir Allah, Fatimə haqqına! Ey !Möhsin Allah, Həsən haqqına! Ey Ehsanı qədim olan Allah, Hüseyn haqqına

İlahi! Məhəmməd və Ali-Məhəmməd (s) hörmətinə, bizə Öz bəndəliyin üçün tərbiyə olunmaq səadəti nəsib et! İlahi! Bizim daxilimizdəki bütü sındır! İlahi! Bizim azğın nəfsimizi həqiqətən Özünə bəndə və Öz mərhəmətini bizə nazil et! İlahi! Səni Məhəmməd və Ali-Məhəmməd (s) hörmətinə and veririk, bizi Məhəmməd və Ali-Məhəmmədin (s) həqiqi ardıcılları et! İlahi! Daxilmizdə olub bizi Səndən uzaqlaşdıran, Sənin yanında xəcalətli edən və təkamül yolunu üzümüzə bağlayan bəyənilməz və qəbahətli xüsusiyyətlərin kökünü kəs! İlahi! Bizi deyib-bildiklərimizə əməl edənlər et! İlahi! Məhəmməd və Ali-Məhəmməd (s) hörmətinə and veririk, bu bərəkətli günlərdə və bu mübarək ramazan ayında bizim ixlaslı və müsəlman xalqımıza Özünün xüsusi mərhəmətini nazil et! Onları düşmənlərinə qalib et! Onların düşmənlərini xar və zəlil et! İlahi! Məhəmməd və Ali-Məhəmməd (s) haqqına, bizim əziz və böyük imamımızın pak ruhunu Məhəmməd və Ali-Məhəmmədin (s) pak ruhları ilə birgə et! İlahi! Onun Sənin yanındakı məqamını günbəgün ucalt və yaxşılaşdır! İlahi! Məhəmməd və Ali-Məhəmməd (s) haqqına, bu xalqdan, bu toplantılardan və bizim hər birimiz tərəfindən o həzrətin ruhuna rəhmət və hədiyyə göndər! İlahi! Məhəmməd və Ali-Məhəmməd (s) haqqına, bizim dəyərli şəhidlərimizi erkən İslam çağının şəhidləri ilə birgə et! Öz mərhəmət və bərəkətlərini şəhid ailələrinə şamil et! İlahi! Məhəmməd və Ali-Məhəmməd (s) haqqına and veririk, Özünün xeyir və bərəkətlərini bizim cəmiyyətimizə nazil et! Problemləri aradan qaldır! Düşmənin gizli və aşkar əllərini kəs! Bizi bir-birimizə daha mehriban və daha yaxın et! Bizi Sənin hökmlərinə tam şəkildə əməl edənlər et! İlahi! Kəramətli və əziz Quranı bizim cəmiyyətimizdə kamil şəkildə həyata keçir, bizim əxlaqımızı Quran əxlaqı et! İlahi! Bizim ölənlərimizi, ata-analarımızı bağışla! İlahi! Bizi bağışla! Öz rəhmət və əfvini bizə şamil et! İlahi! Əgər bu ayın ötən günlərində bizi bağışlamamısansa, qalan günlərində Öz əfvini bizə şamil et! İlahi!

Məhəmməd və Ali-Məhəmməd (s) haqqına, dövrün imamının müqəddəs qəlbini bizdən razı et! O həzrətin dua və

səh:٢٠

razılığını bizə şamil et! Bizi qeybi və zühuru dövründə o həzrətin köməkçilərindən et!
!İlahi! Öz yolunda şəhidlik səadətini bizə nəsib et

Mübarək ramazan ayının ٢٣-cü günündə xalqın müxtəlif təbəqələri ilə görüşdə .çıxışından: ١٩٩٠

səh:٢١

İdman etməyən insanın bədəni zəif və gücsüz olur. Kim olursunuzsa-olun, sümükləriniz nə qədər bərk olursa-olsun, əgər idman etməsəniz, yeyib-yatsanız, bədəniniz zəifləyəcək. Buna şübhə yoxdur. İdman etməsəniz, bədəniniz lazımi formada inkişaf etməyəcək. Bəzi gözəllikləri idman aşkara çıxarır, idmansız görünmürlər. Sizin ruhunuz da eynilə belədir. İdman olmasa, təlim və riyazət olmasa, .güclənməyiniz imkansızdır

Çoxlu insanların bədənləri güclü və gözəl, ruhları isə arıq, çirkin, gücsüz və zəifdir. Bunun faydası yoxdur. Bütün ibadətlər bizim idman etməyimiz, tərbiyə olunmağımız və inkişafımız üçündür. Əlbəttə, ibadətləri tanımaq lazımdır. Onların da cismi və ruhu var. İbadətlərin cismi təklikdə kifayət etmir. İnsan namaz halında dediyi zikrlərə diqqət yetirməsə, nə dediyini, kiminlə danışdığını bilməsə və məzmununa tam diqqətsiz halda .namaz qılsa, bunun faydası olmaz

Sözsüz ki, ərəb dilini bilməyənlər bu cümlələrin mənasını anlamırlar. Əgər insan namaz halında ən azı Allahla danışdığını bilsə və Allahı yada salsa, bu da yaxşı haldır. Amma çalışın namazın mənasını öyrənin. Namazın mənasını öyrənmək çox asan işdir. Bu bir neçə cümlənin tərcüməsini çox tez öyrənə bilərsiniz. Mənasına diqqət yetirərək namaz qılın. Belə namaz hər bir təqvalı insanı Allaha yaxınlaşdıran(١) namaz olacaq. Namaz .insanı Allaha yaxınlaşdırır, amma təqvalı insanı

Oruc təqvaya bais olur və onu yaradır, amma diqqətli oruc. Mən birinci məclislərdə oruc hədislərinə işarə vurdum. Burada çıxış edən digər cənablar da buna toxundular. Oruc yalnız insanın yeyib-içməməsi üçün deyil, sizin ruhunuzun bir növ tərbiyəsidir. Siz .ruhunuzu orucla sağlam saxlaya, paklaya və təmizləyə bilərsiniz

Böyük bir ibadət sayılan zəkatın və ehsanın da cismi və ruhu vardır. (Allah tərəfindən) nəfsinin xəsisliyindən qorunub saxlanan kimsələr – məhz onlar nicat tapıb səadətə qovuşanlardır(٢). Bu zəkat bizim daxilimizdəki tamahkarlığı və xəsisliyi sındırmalı, .dünya malına sevgimizi yox etməlidir. Belə zəkat yaxşı zəkatdır

Allaha şükür olsun ki, bu il ramazan ayı otuz gün oldu. Bir neçə il idi ramazan ayı iyirmi

doqquz gün olurdu, bu il isə bir gün çox oldu. Siz otuz gün oruc tutub, ürəkdən namaz qıldınız, dua etdiniz. Bu şübhəsiz ki, sizə təsirsiz



---

۱- [۲۳] Nəhcül-bəlağə, hikmət: ۱۳۶.

۲- [۲۴] Həşr/۹.

ötüşməyəcək. Biz bu təsiri qorumağa çalışmalıyıq. Bu təsir dəyərli məsələdir. Əgər bizdə diqqətli namaz, oruc və insanı oyadan zikr olsa, o zaman İslama günbəgün yaxınlaşan bir müsəlman olacağıq. Müsəlman cəmiyyətlərində İslamın məqsədlərinə yaxınlaşmayan, əksinə, uzaqlaşan insanlar varsa, o cəmiyyətlərin bir eybi budur. Bəlkə .də çoxlu nöqsanlar var, amma biri budur

### Qapalılığın və avamlığın İslam cəmiyyətinin ən böyük bəlalarından biri olması

Əgər ibadətdə diqqət olmasa, ibadətin bəndəlikdən, Allahla ünsiyyətdən və Onun qarşısında təslimçilikdən ibarət olan ruhuna diqqət yetirilməsə, insanın qarşısında müxtəlif təhlükələr yaranacaq. Onların biri qapalılıqdır. Bu günlərdə adlarını çox eşitdiyiniz Xəvaric qruplaşmasının bəzi üzvləri elə ibadət edir, Quran ayələrini elə oxuyur və elə gözəl namaz qılırdılar ki, hətta Əmirəlmömininin (ə) səhabələri də təsir altına düşürdülər. Döyüş ərəfəsində Əmirəlmömininin (ə) tərəfdarlarından biri gecə yarısı onların birinin ibadət etdiyini və bu ayələri gözəl səslə oxuduğunu gördü: Məgər axirətdən qorxan, Rəbbinə ümid bəsləyən, gah səcdəyə qapanıb, gah da ayaq üstə durub gecə saatlarını ibadət içində keçirən (müti bəndə kafirlə birdirmi)?!(١) O bundan təsirlənib Əmirəlmömininin (ə) yanına gəldi. Hətta Əmirəlmömininin (ə) yaxın .səhabələri olan ayıq və məlumatlı insanlar da çox zaman belə səhvlərə düşürdülər

Əbəs deyil ki, Əmirəlmöminin (ə) belə buyurmuşdur: Heç kim bu işi (Xəvaricin darmadağın edilməsi işini) görə bilməz, bu fitnəni yatırmağı bacarmazdı. Bu iş üçün həqiqətən həzrət Əlinin (ə) xəncəri, ayıqlığı, özünə güvənməsi və öz yoluna inamı lazım idi. Hətta bəzən aparıcı adamlar da təsirlənirdilər. Əmirəlmöminin (ə) həmin səhabəsinə buyurdu ki, sabah sənə deyəcəyəm. Ertəsi gün müharibə bitəndə və Xəvaric qruplaşmasından on nəfərdən də azı sağ qalanda, digərləri döyüşdə öldürüləndə həzrət öz tərəfdarlarına və səhabələrinə nəsihət vermək və onların ibrət alması üçün ölülərin arasında gəzir, onların bəzisi ilə danışırdı. Arxası üstə uzanmış bu ölülərin birinə çatanda imam onu qaldırmalarını istədi. Bəlkə də buyurdu ki, onu oturdun və oturtdular. Sonra yaxın səhabələrindən olan həmin şəxsə buyurdu ki, bunu tanıyırsanmı? Dedi ki, xeyr, ey Əmirəlmöminin. Buyurdu ki, bu ötən gecə Quran .oxuması ilə səni valeh edən şəxsdir

Bu necə Quran oxumaqdır?! Bu necə ibadət etməkdir?! Bu, ibadət ruhundan ,uzaqlaşmaqdır. Əgər insan ibadət, namaz və Quran ruhu ilə tanış olsa



---

.Zümər/۹ [۲۵] -۱

İslamın həqiqətinin və məğzinin təcəssüm olunduğu Əli ibn Əbu Talibin (ə) bir tərəfdə durduğunu görərkən bütün şübhələrdən çıxıb ona qoşular. Bunu təyin etməmək və .nəticədə Əliyə (ə) xəncər çəkmək Qurandan və dindən uzaqlaşmaqdır

Deməli, məsələnin bir tərəfi sözügedən qapalılıq, düşüncəsizlik, bizim Bəni-Üməyyə və Bəni-Abbas xilafəti zamanı müşahidə etdiyimiz böyük və əsaslı səhvlərdir. Bəziləri dindar, ibadətçi və zahid insanlar idilər, kitablarda adları abidlərin, zahidlərin, əxlaqlı və düzgün insanların sırasında qeyd olunmuşdur, amma səhv edirdilər; haqq cəbhəsini batil cəbhəsi ilə qarışdırmaq kimi böyük bir səhv. Ən böyük səhv budur. Kiçik səhvlər bağışlana bilər. Bağışlanmaz səhv isə kiminsə haqq cəbhəsini batil cəbhəsi ilə səhv .salması və haqqı ayırd edə bilməməsidir

### Əmirəlmöminin Əlinin (ə) xüsusi səhabəsi olan Əmmar Yasirin əzəmət rəmzi: Ayıqlıq

Əmmar Yasir kimilərin əzəməti burada görünür. Əmirəlmömininin (ə) bu böyük səhabəsinin əzəməti ondadır ki, heç bir şəraitdə səhvə düşmədi və cəbhəni itirmədi. Mən Siffeyn döyüşünün müxtəlif yerlərində bu əzəməti görmüşəm. Sözsüz ki, bu yalnız Siffeyn döyüşünə məxsus deyil. Möminlər üçün şübhəli məqamların yarandığı bir çox yerlərdə qarşıya çıxıb güclü ayıqlığı və aydınlaşdırıcı sözü ilə şübhəni aradan qaldıran Əmmar Yasir idi. İnsan Əmirəlmömininlə (ə) bağlı müxtəlif hadisələrdə, o .cümlədən Siffeyn döyüşündə bu aydınlaşdırıcı və böyük kişinin rolunu görür

Siffeyn döyüşü aylarla uzandı. Qəribə döyüş idi. Döyüşçülər qarşı

tərəfdəkilərin ibadət etdiyini, camaat namazı qılıb Quran oxuduğunu, hətta

Quranı nizələrə sancdığını görürdülər. Belə namaz qılan şəxslərə xəncər çəkmək

.üçün çox ürək və cəsarət lazım idi

Bir hədisdə İmam Sadiqdən (ə) nəql olunmuşdur ki, əgər Əmirəlmöminin (ə) qiblə əhli ilə vuruşmasaydı, sona qədər pis və azğın qiblə adamlarının hökmü bəlli olmayacaqdı. Əli ibn Əbu Talib (ə) bu yolu açıb hamıya nə etməyin lazım olduğunu göstərdi. Bizim uşaqlarımız təcavüzkar cəbhənin bəzi səngərlərini ələ keçirib döyüşçülərini əsir tutanda səngərlərindən möhür və təsbeh tapırdılar. Bəli, Əmirəlmömininin (ə)

qarşısında durub namaz qılan və nəticədə bəzi adamları şübhəyə salan şəxslər kimi. Belə adamların yanına gedən Əmmar Yasir idi. Bu ayıqlıq üçün Əmmar Yasir kimi bir nəfər lazımdır. Əgər əməl və ibadətlərin Allaha diqqətdən və Onun bəndəliyindən ibarət olan ruhu insan üçün həll olunmasa və aydınlaşmasa, insan bu vacib əməllərin hər birində

özünü Allah bəndəliyinə yaxınlaşdırmağa çalışmasa, işi dayazdır. Dayaz iş və iman .həmişə təhlükə altındadır və biz İslam tarixində bunu görmüşük

Qeyd etdim ki, bəzi dindar, müqəddəs, abid və zahid insanlar gedib zalım, işğalçı, günahkar, xəbis, yalançı və riyakar xəlifənin yanında oturur, ona dörd nəsihətli söz deyirdilər. O da ya saxtakarlıq və riyadan, ya da bəlkə də qəlbinin bir küncündə həqiqətən təsirləndiyindən göz yaşı tökürdü. Bəziləri də məst olanda həyəcanlanır, onlar üçün bir qədər söhbət edən bir nəfəri gətirir, onun sözləri ilə ağlayırdılar. Sonra bu sadəlövh, nadan alimlər də onların zahirinə aldanır və həmin xəlifələrin müridi olurdular. İslam tarixində belə qəribə hadisələr baş vermişdir. Abbasi xəlifəsi məşhur abid və zahid olan Əmr ibn Əbidə hörmət edir və deyirdi ki, Əmr ibn Əbid digər təqva və zahidlik iddiaçılarından fərqlidir. Siz həmin Əmr ibn Əbidə, Məhəmməd ibn Şəhab Zöhriyə və onlar kimilərə baxsanız, öz dövrlərində haqq cinahının böyük başağrılarından olduqlarını görərsiniz. Gedib öz vücudları ilə batil cəbhəsini gücləndirir, haqq cəbhəsini – yəni Peyğəmbərin Əhli-beytini (ə) yalqız və məzlum qoyur, həmin .bilməzlikləri ilə düşmənə şərait yaradırdılar

Qısası budur ki, ibadətin ruhu Allaha bəndəlikdir. Qardaş və bacılar! Biz özümüzdə bəndəlik ruhunu dirçəltməyə çalışmalıyıq. Bəndəlik - Allah qarşısında təslimçilik və daxilimizdəki bütü sındırmaqdır. Bizim daxili bütümüz olan mən çox yerdə özünü göstərir. Mənafeyin təhlükəyə düşəndə, heç kim sözünü qəbul etməyəndə, sənin meylinə uyğun və şəriətin ziddinə olan bir iş qarşıya çıxanda, yaxud bir tərəfdə şəxsi maraqlar, bir tərəfdə isə vəzifənin durduğu iki yol ayrıcında, belə dar və ensiz .keçidlərdə qalanda insanın daxilindəki mən baş qaldırıb özünü göstərir

Əgər biz bu daxili məni, bu nəfsi, daxili fironu, bizim daxilimizdə yatan bu şeytanı cilovlasaq, yaxud ən azı bir qədər cilovlasaq, bütün işlər düzələcək. Birinci növbədə bizim özümüz adam olacaq və səadətə çatacağıq. Ramazan ayı buna hazırlıqdır. Diqqətli oruc, namaz, yoxsullara yardım və hətta Allah yolunda cihad da xalqın Allaha .bəndə olduğu belə bir dünyaya nail olmaqdan ötrüdür

!İlahi! Məhəmməd və Ali-Məhəmməd (s) hörmətinə, bizi Özünə bəndə et

Bu gün ramazan ayı qurtarır. Qardaş və bacılar! Çalışın bu ayda əldə etdiyiniz

nailiyyətləri qoruyun. Bunun yolu günahlardan çəkinməniz, qəlbinizdə Allahın xatirəsini yaşatmanızdır. Müxtəlif hallarda – işdə, xalqla rəftarda, maddi maraqlarla üzləşəndə, .ehtiraslarla və digər hallarla üzləşəndə bacardığınız qədər Allahı yada salmağa çalışın

## Ramazan ayının xeyirlərini hesablamaq və il boyu qorumaq

Bayram günü müsəlmanlar özlərinə, mübarək ramazan ayındakı ilahi ziyafətdən necə bəhrələndiklərinə baxmalıdırlar. Ramazan ayı özünüislah və təqva ayıdır. Biz bu şərafətli ayda oruc və ibadətlərlə özümüzə bir şey qazana, özümüzü islah edə bilmişik, yoxsa yox? Bu gün bunu hesablayın və əgər ramazan ayından xeyir götürdüyünüzü .görsəniz, onu il boyu qorumağa çalışın

...

Əmirəlmöminin (ə) fitr bayramı namazının xütbəsində müsəlman camaata müraciətlə buyurur: Ölümündən öncə səhvinə tövbə edən yoxdurmu?!(١); Yoxsulluqdan öncə özü üçün bir iş görən yoxdurmu?!(٢). Ölümdən, bütün insanların qaçılmaz sonunun çatmasından öncə öz günahlarına və səhvlərinə görə tövbə etmək istəyən yoxdurmu?! Yoxsulluq gününün, insanın Allahın mərhəmətindən və öncədən göndərdiyi əməllərdən başqa heç nəyi olmayacaq günün çatmasından öncə bir iş görmək istəyən yoxdurmu?! Yəni Əmirəlmöminin (ə) bayram və şadlıq günündə xalqı .tövbəyə, yaxşı əməllərə qərar verməyə və Allahla əlaqəyə yönəldir

Qardaş və bacılar! Biz özümüzün bütün səhvlərimizə görə tövbə etməliyik. İmam Səccadın (ə), Əmirəlmömininin (ə) və bəşəriyyət arasında misilsiz nuraniliyi olan digər böyük şəxslərin müxtəlif dillərlə və yanıqlı sözlərlə bağışlanmaq istədiyi və tövbə etdiyi halda mən və mənim kimilər Allaha qayıtmaq, Allahdan bağışlanmaq istəmək üçün heç .bir anı əldən verməməliyik

## Günün bütün saatlarında və əməllərində ehtiyatlı olmaq

Gün ərzində etdiyiniz bütün əməllərdə təqvaya riayət edin; yəni danışığınızdan, əməlinizdən, işinizdən, qərar və hərəkətinizdən ehtiyatlı olun, nəfsin sizi Allahdan və ilahi vəzifədən yayındırmasına imkan verməyin. Şeytan əmmarə nəfsimizə, eqoistliyimizə, qürur və həvəslərimizə arxalanıb bizi Allahın düzgün yolundan yayındırır. Təhlükəli bir dağ keçidində özünün hər hərəkətindən, hər addımından ehtiyatlı olan şəxs kimi ehtiyatlı olmalıyıq. Bu, təqva – yəni ehtiyatlı olmaq, Allahın hər şeyi gördüyünü, hər bir işə şahid olduğunu bilmək, baş verən səhvlərə görə tez tövbə

.etmək, Allaha arxalanmaq, Allahdan kömək istəmək və Allaha sığınmaqdır

Bu gün dünyanın gözü siz İran xalqına dikilmişdir. Bu gün xalqlar öz əzəmətli hərəkətlərini sizin hərəkətinizin xatirəsi ilə başlamışlar və sizin



---

.Nəhcül-bəlağə, xütbə: ۲۸ [۲۶] -۱

.Mən la yəhzuruhu əl-fəqih, c. ۱, səh: ۷۱۵ [۲۷] -۲

imanınıza iqtida edirlər. Əgər siz xalqların Allah və İslam yolundan ibarət olan bu yola gəlmələrini istəyirsinizsə, onu güclü şəkildə davam etdirməlisiniz və bu, təqva .olmadan mümkün deyil. Odur ki, bu gün təqva bizim ən böyük vəzifəmizdir

!İlahi! Bizim hamımızı təqvalı et

## Ramazan – ruhlarda, qəlblərdə, yaşayış və iş yerlərində yenilik fürsəti

Şübhəsiz, biz dini vəzifəmizə uyğun olaraq, mübarək ramazan ayında və Allahın yaratdığı bütün faydalı imkanlarda bizə verilən zikr, ibadət və dua nemətini qənimət sayıb qüdrət, izzət və əzəmət mənbəyi - yəni Allah-Taalanın müqəddəs zatı ilə mənəvi əlaqə yaratsaq, şübhəsiz, həm bizim ruhlarımızda, qəlblərimizdə və əsl insani kimliyimizdə, həm də onun ardınca yaşayış, iş və mübarizə yerlərimizdə əsaslı və ideal yenilik yaranacaq, biz İslam məqsədlərinə yaxınlaşacağıq. Bu, İslamla bəşərə bir .yenilik və ideal təklif edən bütün üsul və proqramlar arasındakı əsas fərqdir

Biz belə düşünürük və bu, İslamın, bəlkə də bütün dünyanın aşkar məsələlərindəndir ki, insan yalnız Allah-Taala ilə əlaqə sayəsində kamilliyə doğru gedə bilər. Təbii ki, ramazan ayı müstəsna bir fürsətdir. Allah-Taalanın Quranda Qədr gecəsi min aydan üstündür(١) – deyə buyurması kiçik məsələ deyil. Min aydan yaxşı, fəzilətli və insanın inkişafına təsirli olan bir gecə ramazan ayındadır. Bu, kiçik məsələ deyil ki, əziz Peyğəmbər (s) bu ayı ilahi ziyafət ayı hesab etmişdir. Məgər insanın səxavətli bir şəxsin süfrəsində oturub oradan faydasız çıxması mümkündür?! Yalnız bu ziyafətə qoşulmayanlar ondan məhrum ola bilərlər. Bu ayda Allahın əfv, razılıq və ziyafət süfrəsində oturmayan şəxslər təbii ki, bəhrəsiz qalacaqlar və bu, sözün həqiqi mənasında məhrumluqdur: Həqiqətən bədbəxt insan bu böyük ayda Allahın əfvindən məhrum olan şəxsdir.(٢) Əsl məhrum ramazan ayında ilahi əfvi əldə edə bilməyən .şəxsdir

## Uca bəndəlik məqamı

Dəfələrlə demişik ki, əsas məsələ insanın özünü ilahi bəndəliyə çatdıra bilməsidir. Bəndə və qul Allahın iradəsinə, hökmünə və ilahi şəriətə təslim olandır. Bütün ilahi əmrlərin, hökm, fərman və şəriətlərin əsas məğzi bu bir kəlmədir. Allah-Taala

öncə bəndəlik məqamına ucaltmışdır. Bir hədisdə deyilir ki, Allah Məhəmmədi (s) elçi seçməzdən öncə bəndə seçdi.(۱) Allah-Taala əvvəlcə ona bəndəlik xalatı geyindirdi, sonra peyğəmbər rütbəsinə ucaltdı. Sanki bu hər bir yüksəlişə lazım olan hazırlıq və əsas şərtdir. Təkamülün hər bir miqdarında bəndəlik əsas şərtdir. Əlbəttə, bəndəliyin də mərhələləri var. Bəndəliyin aşağı və bizim kimilərin tamah sala biləcəyi mərhələsi .budur

Özümüzü itaətə hazırlayaq, hər şeyi Ondan bilək, Allahın nemətlərini həqiqətən ilahi nemətlər sayaq, öz qüdrətimizin, elm və bacarığımızın məhsulu yox. Bilək ki, biz də bir vasitəyik. Bizim zehnimiz, əlimiz, əməlimiz, qolumuz, səyimiz ilahi iradənin həyata keçməsinə bir vasitədir. Allahın bizim böyük imamımız kimi layiqli bəndələri ramazan ayının bu saat və günlərinin qədrini bilir, ondan maksimum istifadə edirdilər. Biz məsum imamları görməmişik, amma bizim böyük, mərhum və böyük imamımızın .müqəddəs vücudunda həmin ibadət və zikr əlamətləri müşahidə olunurdu

Fitr bayramı münasibəti ilə İslam Respublikası quruluşunun vəzifəli şəxsləri ilə .görüşdə çıxışından: ۱۹۹۰



---

.Bihar əl-ənvar, c. ۹۳, səh: ۲۱۱ [۳۰] -۱

## Ramazan – mənəvi güc qazanmaq, həmkarlıq və humanizm ayı

Ramazan ayı dua və təqva ayıdır. Biz bu ayda ibadətin və Allahı yada salmağın sayəsində mənəvi güc qazanmalı, həmin güclə kələ-kötür yolları sürətlə və asanlıqla .qət etməliyik

Ümidvaram İran xalqı keçmişdən təcrübə toplayıb bir-biri ilə qardaşlığın, həmkarlığın və həmrəyliyin qədrini bilsin, onu imkan daxilində artırsın. İnsanlar bir-biri ilə mehriban olsunlar, bir-birlərinə kömək etsinlər, xüsusən bu günlərdə yoxsullara yardım etməyə çalışsınlar. İmkanı olanlar mütləq yoxsullara və ehtiyaclılara kömək etsinlər. Bizim xalqımız arasında qədim ənənə və İslamın uca göstərişi olan bu həmkarlıq və qarşılıqlı yardım ruhu çox dəyərli bir şeydir. Onu qoruyun, xüsusən bayram günlərində, mübarək ramazan ayında ona daha əhəmiyyətli yanaşın. Humanizm, fədakarlıq, yaxşılıq, digərlərini düşünmək və onlar üçün çalışmaq hissi bizim xalqımızı bu hərəkətin .nəticələrinə çatdıracaq hissdir

.Yeni il münasibəti ilə şərafətli İran xalqına müraciətdən: ۱۹۹۱

səh:۳۰

Bu şərafətli və böyük gündə namazda iştirak edən bütün qardaş və bacıları ilahi təqvaya dəvət edirəm. Bu, təqvalılar imamının ardıcılı olmaq, həyatda, dində, təqvada, ilahi qadağa və qəzəblərdən çəkinməkdə Əmirəlmöminini (ə) örnək seçməkdir.

Bu ay oruc ayı, Quranın nazil olduğu və Quranla ünsiyyət ayıdır. Bu ay ibadət, dua və münacat ayıdır, ibadətin məğzi və ruhu isə duadır. Bu ay bağışlanmaq istəyi, tövbə, bəyənilməz yollardan Allah-Taalanın yanına qayıtmaq və ilahi təqvaya riayət etmək ayıdır. Bu ay cihad ayıdır. Bu mübarək ayda hicrətin ikinci ilində Bədr döyüşü, səkkizinci ilində Məkkənin fəthi və elə həmin ildə Hüneyn döyüşü baş vermişdir. Bu ay nəfslə, şeytanla və Allah düşmənləri ilə cihad ayıdır. Bu ay hazırlıq və təqva ehtiyatı görmək ayıdır. Qohumları ziyarət etmək, din qardaşlarına sədaqət və yaxşılıq, İslam maarifi ilə tanışlıq, Quranla tanışlıq, Quran üzərində təfəkkür, xülasə, bir il boyu ilahi hərəkət ehtiyatı toplamaq ayıdır. Ümidvarıq ki, ötən günləri bu ayın tələblərinə uyğun şəkildə keçirmiş olaq, gələn günlərin isə daha çox qədrini bilək. Öz nəfsimizlə işləməyə, ilahi hökmlərə əməl etməyə, xalqla rəftara, Quranla rabitəyə, Quranın dedikləri haqda fikirləşməyə və nəfslə cihada dair ciddi qərar verək və qəti addım ataq.

Mən bu tövsiyələrə əməl etməyə sizdən çox ehtiyaclıyam. Bu tövsiyələr din böyüklərinin və Əmirəlmömininin (ə) tövsiyələridir. Bu günləri qənimət sayın, Allahla mənəvi əlaqənizi gücləndirin. Biz bu güclü əlaqənin sayəsində dini və dünyəvi problemlərin həllinə doğru hərəkət edəcək və inşallah ona nail olacağıq.

Tehranın cümə namazı xütbələrindən: ۱۹۹۱.

səh:۳۱

Siz ibadət etdikdə, mənəvi halda bir dua oxuduqda, diqqətlə bir namaz qıldıqda, bir yoxsula kömək etdikdə həzz aldığınızı duyursunuz. Bu həzzi yeməklə duymaq olmur. Hər bir mömin insan öz həyatında az-çox belə halları təcrübə etmişdir; bəziləri az, bəziləri çox. Allah bəndəliyinin bu ləzzətini dadmış insanlar Allaha diqqət, ibadət, münacat halında, Allah üçün və Allah qarşısında ağlayarkən elə ləzzət duyurlar ki, .bundan ötrü dünyanı və dünyada olan hər bir şeyi verməyə razı olarlar

Əlbəttə, maddi məsələlər insanı o haldan çıxarır. O hal bəzən yaranır. Mənəvi ləzzət həmin hallara deyilir. Allahla və mənəvi məqsədlərlə tanış olmayanlar bu ləzzətin nə olduğunu bilmirlər. Bəzi insanlar maddi quruluşların uğursuz kölgəsi altında bir ömür yaşayıblar, amma onlar üçün Allaha diqqət və mənəvi ləzzət halı bir an da yaranmayıb. .Onlar mənim və sizin nə dediyimizi anlamırlar

İslam insanları elə ucaltmaq, qəlbləri elə işıqlandırmaq, məndən və sizdən pislikləri elə qoparıb tullamaq istəyir ki, biz həmin mənəvi ləzzəti yalnız ibadət mehrabında yox, həyatımızın bütün anlarında, hətta iş yerində, dərs zamanı, cəbhədə, təlim-tərbiyə və quruculuq zamanı da hiss edək. Daim namaz halında olanların xoş halına! Onlar iş-güc zamanı da Allahladırlar, yeyib-içərkən də Allahı xatırlayırlar. Belə bir insandan ətrafa nur saçılır. Əgər dünya belə insanlar yetişdirə bilsə, müharibələrin, zülmlərin, .haqsızlıqların və çirkinliklərin kökü kəsiləcək. Gözəl həyat budur

Deməli, gözəl həyatın mənası bu deyil ki, bəzi şəxslər yalnız namaz qılsınlar, ibadət etsinlər, məişət və maddiyyat barədə isə əsla düşünməsinlər. Xeyr, gözəl həyat dünya və axirətə malik olmaqdır. Gözəl həyat maddiyyat və mənəviyyatın hər ikisinə birgə yiyələnməkdir. Gözəl həyat odur ki, xalq çalışır, quruculuqla məşğul olur, sənayeni, ticarəti və əkinçiliyi rövnəqləndirir, elm və texnika əldə edir, bütün cəhətlərdən müxtəlif inkişaflara nail olur. Amma bu halların hamısında onun qəlbi Allahladır və Allahla günbəgün daha çox tanış olur. İslam quruluşunun məqsədi budur; Peyğəmbərlərin elan etdiyi, dünyanın islahatçı şəxslərinin dediyi, son ١٥٠-٢٠٠ ildə .İslamın görkəmli şəxsiyyətlərinin elan etdiyi məqsəd budur

.İmam Rzanın (ə) pak məqbərəsinin ziyarətçiləri ilə görüşdə çıxışından: ١٩٩١

## Quran oxumağa, Quran üzərində təfəkkürə və Quranla rabitəni gücləndirməyə dair tövsiyə

Əmirəlmöminin (ə) buyurur ki, Quranın yanından qalxdıqda sizə hidayət əlavə olunur, korluq və cəhalət sizdən alınır. Bu hidayəti bizdən almaq istəyirdilər. İş elə bir yerə çatdı ki, sonuncu şah dövrünün – yəni inqilabın qələbəsindən öncəki iyirmi ilin yetişdirdiyi nəsil məktəblərdə Quranla tanış olmurdu. Əgər bəxti gətirib bir yerdə Quran kursu və ya Quran müəllimi tapsaydı, yaxud mehriban atası və ya Quran oxuyan anası olsaydı, öyrənərdi, əks təqdirdə, Quranla heç bir tanışlığı olmurdu. .İnqilab gəlib Quranı xalqın ruhuna hopdurdu

Mənim əzizlərim! Quran qiraətçiləri! Bizim pak və inqilabçı gənclərimiz! Quranla bu əlaqəni günbəgün artırın. Ailələrdə Quran ətrini yayın, Quranı oxuyun, yenə oxuyun, Quran üzərində təfəkkür edin. Düşmən müsəlmanların Quran ayələrini bayraq kimi qaldırmasını istəmir. Çünki Quran vəzifələri təyin etmişdir; müsəlmanların cihad .vəzifəsini, müsəlman yaşamaq və müsəlman ölmək vəzifəsini

Biz Quranla rabitəmizi günbəgün gücləndiməliyik. Evlərdə Quran oxuyun, bekar olanda, bir qədər boş vaxt tapanda vaxtınızı Qurana həsr edin. Hər gün bir qədər Quran oxuyun, onu öyrənin. Təcvid qaydalarını öyrənin, əsasən Misirdən gəlmiş bu müəllimlərdən maksimum istifadə edin. Bu Quran müəllimlərinin nəyi varsa, hamısını öyrənin. Əlbəttə, Quran dərin bir dərya və sonu görünməyən dənizdir. Nə qədər öyrənsəniz – istər zahirində, istərsə də dərinliklərində yenə də öyrənmək, inkişaf və .hərəkət etmək imkanı vardır

.Quran qiraətçiləri ilə görüşdə çıxışından: ۱۹۹۲

səh:۳۳

Qarşıdan ramazan ayı gəlir. Ramazan ayında həm özümüzlə məşğul olmalıyıq, həm də xalqla. Bunu da bilək ki, özümüzlə məşğul olmasaq, xalqla da məşğul ola bilməyəcəyik. Ramazan ayının dua, oruc, münacat, təzim və zikrlərinin, ramazan ayında qılınan bu nafilələrin hamısı ondan ötrüdür ki, biz əvvəlcə bir qədər özümüzü nurlandıraq. Əgər nurlansaq, o zaman digərləri ilə də məşğul ola bilərik. Əgər nurlanmasaq, digərlərinə nur saça bilməyəcəyik. Nə qədər desək də, artıq və zərərli olacaq, fayda .yetirməyəcək

Ümidvarıq həm özümüzü islah etməyə, həm də xalqın islahına, mənəviyyatına və əhval-ruhiyyəsinə kömək etməyə müvəffəq olaq. Allah dövrün imamının müqəddəs !qəlbini bizə qarşı mehriban və o həzrətin duasını bizə şamil etsin

.Ruhanilərlə görüşdə çıxışından: ۱۹۹۳

səh:۳۴

### Ramazan – özünüislah və müxtəlif problemlərdən qurtuluş fürsəti

Ramazan ayı özünüislah üçün yaxşı fürsətdir. Biz bir xammal kimiyik. Əgər öz üzərimizdə işləyib bu xammalı yaxşı formalara sala bilsək, həyatda lazım olan işi görmüş olarıq. Həyatın məqsədi budur. Elm və əməl baxımından öz üzərində çalışmayan, həyat boyu insanın düçar olduğu çirkablarla, ziyanlarla, xarabalıq və fəsadlarla bu dünyadan gedənlərin vay halına! Mömin daim öz üzərində işləməlidir, daim. Elə bilməyin ki, daimi işləmək çoxdur, yaxud mümkün deyil. Xeyr, həm mümkündür, həm də çox deyil. Əgər bir şəxs özündən ehtiyatlı olsa, qadağan olunmuş işlərdən uzaqlaşmağa çalışsa və Allahın yolunu ciddi şəkildə getsə, uğur qazanar. Bu, daimi özünüislahdır və İslamın proqramı bununla uyğundur. Gündə beş dəfə namaz qılmaq, Yalnız Sənə ibadət edir və yalnız Səndən kömək istəyirik zikrini təkrarlamaq, rüku etmək, torpağa düşmək, Allah-Taalaya təzim etmək, şükür etmək və la ilahə illəllah demək nə üçündür? Bunlar insanın daim özünüislahla məşğul olması üçündür. Lakin problemlər çoxdur və hamımız onlara düçar oluruq; həyat problemi, məişət problemi, şəxsi problemlər, ailə-uşaq problemi və özümüzlə yetərincə məşğul olmamıza mane olan digər problemlər. Buna görə Allahın yaratdığı biraylıq ramazan fürsəti faydalı fürsətdir. Bu fürsəti əldən çıxarmayın. Məqsədim budur ki, daim özünüislah və diqqət halında ola bilmiriksə, ən azı ramazan ayını qənimət sayaq. Ramazan ayında şərait mövcuddur. Ən yaxşı amillərdən biri sizin tutduğunuz orucdur. Bu, ən böyük ilahi yardımlardan biridir. İlahi yardım nədir? İlahi yardım və uğur odur ki, Allah-Taala insan üçün bir şeyə münasib şərait yaratsın. Orucu vacib etməklə Allah-Taala mənim və sizin bu ayda bir qədər özümüzlə məşğul olmamızdan ötrü əlverişli şərait yaratmışdır. Oruc böyük nemətdir. Qarın boşdur, gün ərzində müəyyən həddə və müxtəlif cəhətlərdən nəfslə mübarizə aparılır: sevdiyinizi yemirsiniz, içmirsiniz, bir çox istəkləri bir neçə saatlığa özünüzə qadağan edirsiniz. Bu, nəfslə mübarizədir və .nəfslə mübarizə bütün yaxşı işlərin və özünüislahın başında durur

### Ramazan – ruhi və mənəvi xəstəliklərin müalicə ayı

Ramazan ayı çox əlverişli bir aydır. Allah-Taala özümüzü islah etmək üçün mənə və sizə belə bir imkan yaradıb. Bu ayın saatları çox faydalı və qənimətli saatlardır. Sizin bu ayda bir rükət namazınız, bir subhanəllah zikriniz, bir qədər sədəqə verməniz,

qohumları ziyarət etməniz eyni işləri ramazandan başqa bir ayda görmənizdən dəfələrlə üstündür. Bu, çox gözəl fürsətdir. Bu ayda insanın öz qeydinə qalması üçün yaxşı şərait yaranır. Sanki

bir həkim bir xəstəyə rast gəlir. O xəstənin müxtəlif xəstəlikləri var; şəkər xəstəliyi var, qan təzyiqi var, qanında yağlılıq var, sümük ağrısı var, revmatizm var, mədə yarası var, xülasə, çoxlu xətəliklər var. Onun xəstəliklərini və müalicə yolunu bilən mahir həkim bu xəstəyə nə edər? Əvvəl onun xəstəliklərini bir-bir kağız üzərinə yazmalıdır. Əgər həkim onun bəzi xəstəliklərini bilməsə və hansısa xəstəliyə zərərli olan bir dərman yazsa, müalicə etmək yerinə yazığı digər xəstəliklərə də düçar edər. Məsələn, mədə yarasının olduğunu bilmir və onun revmatizmini müalicə etmək üçün aspirin verir. Düzdür, aspirin revmatizmin dərmanıdır, amma mədə yarası üçün çox ziyandır. Əgər həkim bu xəstəlikdən xəbərsiz olsa, yaxud xəstənin buna düçar olduğunu bilməsə, onu müalicə etmək yerinə yazığı mədə qanaxmasına yoluxdura bilər. Deməli, əvvəlcə diqqətlə baxmalı, qayğıkeşliklə xəstəlikləri tapmalı və yazmalıdır. Sonra onların hansının daha mühüm, daha təcili və daha dərin olmasına baxmalıdır. Mədəsində narahatlıq olan şəxsin bədəni hər bir dərmanı götürmür. Yaxud bağırsağı xəstədirsə, hər bir gücləndirici qidadan istifadə edə bilməz. Yolu budur ki, əvvəlcə mənfi təsiri digərlərindən çox olan və sağaldığı təqdirdə şəfasının müsbət təsiri daha .böyük olan xəstəliyi təyin etsin

Siz özünüzə həkim olun. Əziz qardaş! İnsanın özü kimi başqa heç bir kəs onun xəstəliklərini görə bilməz. İnsanda bəzi xəstəliklər var. Məsələn, siz mənə Sən bu xəstəliyə tutulmusan - desəniz, əsəbiləşər və inciyərəm. Əgər kiməsə Siz paxıl adamsınız - desələr, məgər buna dözər?! Deyər ki, paxıl özünsən, niyə təhqir edirsən, nə üçün boş-boş danışırsan. Biz bu sözləri digərindən qəbul etmirik, lakin özümüzə müraciət etdikdə görürük ki, bəli, acı da olsa, bizdə bu xəstəliklər var. İnsan kimi aldatsa da, kimdən gizlətsə də, özündən gizlədə bilməz. Deməli, xəstəliyimizi təyin edən ən yaxşı adam özümüzük. Siz bunları yazın; yazın həsəd, yazın xəsislik, yazın digərlərinə bədxahlıq; yazın ki, digərinə bir xeyir çatanda biz narahat oluruq; yazın işdə tənbəllik, yazın yaxşı və saleh insanlara bədbinlik, yazın vəzifələrə etinasızlıq, .yazın xudpəsəndlik; yazın ki, biz özümüzü çox sevirik

Hansı xəstəliyə tutulmuşuqsa, onu kağız üzərinə yazaq. Ramazan ayı bu xəstəlikləri mümkün həddə bir-bir müalicə etmək üçün yaxşı fürsətdir. Əgər müalicə etməsək, bunlar təhlükəli olacaq, bizi mənəvi və həqiqi cəhətdən məhv edəcək. Fiziki cəhətdən

məhvolma çox da mühüm deyil. Əgər bizdə ölümcül bir xəstəlik olsa, yaxud buna ehtimal verilsə, nə qədər əl-ayağa düşərik, gecə yata bilmərik, ən yaxşı həkimləri tapıb deyərik ki, birdən mənim bədənimdə, əlimdə, dərimdə olan bu vəzi xərçəng olar. .Bunu təsəvvür etməyə də çox qorxuruq

Sonu nədir? Sonu ölməkdir. İndi olmasa, bir ildən sonra, iki ildən sonra, on ildən sonra bu baş verəcək. Nizami Gəncəvi yaxşı deyir:

İstər bir gün yaşa, istər yüz il, onsuz da bu dünyadan köçəsisən!

Qalası deyilik, bir neçə günlükdür; ya bir qədər çox, ya bir qədər az, axırı bitəcək. Fiziki məhvolma belədir, amma ondan bu qədər qorxuruq. Mənəvi məhvolma isə əbədi olaraq ilahi əzaba düçar olmaqdır; yəni əbədi həyatda Allahın bizdən ötrü yaratdığı bütün nemət və ləzzətlərdən məhrum olmaq. İnsan qiyamətdə baxıb görəcək ki, Allah-Taala ünsiyyətdə olduğumuz, küçə və məhəllədə gördüyümüz bəzi bəndələrinə, iş yoldaşımıza, tələbəlik dostumuza və yaxud oturub-durduğumuz bir adama bu dünyada gördüyü bəzi işlərə, çəkdiyi bəzi zəhmətlərə görə uca məqamlar verir, onları cənnətə aparır, əzabdan qurtarır, qiyamətin əziyyətlərindən xilas edir, biz isə tənbəlliyə görə, öz qeydimizə qalmamağa və bir anlıq diqqətsizliyə görə onların hamısından məhrum olmuşuq. O zaman həsrət insanı yandırıb-yaxar: Qəflətdə olanları və iman gətirməyənləri işin bitmiş olacağı peşmançılıq günü ilə qorxut!(١) Daha iş işdən keçmişdir və həsrətin faydası yoxdur. Bu, mənəvi cəhətdən məhvolmadır.

Qardaş və bacılar! Əgər öz qeydimizə qalmasaq, bunun sonu bədbəxtlik, üzüqaralıq, məhrumluq, Allahın gözündən düşmək, mənəvi məqamlardan və Allahın əbədi nemətindən məhrumluq olacaq. Deməli, öz qeydimizə qalmalıyıq. Ramazan ayı yaxşı fürsətdir. Əxlaq kitabları da xoşbəxtlikdən, çoxdur. Lakin insanın kompleks şəkildə anladığı mühüm məsələ budur ki, insan öz nəfsinə nəzarət etsin, onu cilovlasın. Əsas məsələ budur.

### İxlas – özünüislahın ən mühüm şərti

Özünüislah üçün çox və bəlkə də ən əhəmiyyətli şərtlərdən biri ixlasdır. İxlas işi yalnız Allah üçün görməkdən və başqa bir məqsəd güdməməkdən ibarətdir. Bir adam ibadət etmir, biri isə ibadət edir, amma ixlassız şəkildə. Bu da onun kimidir. İbadət və əməlin ixlaslı olması üçün onu yalnız Allahdan ötrü etmək lazımdır. Təəssüf ki, yaxşı işlərini söyləmək xalq arasında adət olub. Diqqət yetirmirlər ki, yaxşı işi demək lazım deyil; təbii ki, bəzi yerlər istisna olmaqla. Bəzi işlər aşkar şəkildə görülməlidir. Hədislərdə sədəqə barədə deyilib ki, gizli sədəqənin filan savabı var, aşkarda verilən sədəqənin

isə filan savabı. Yaxud kollektiv ibadətlər xalqın gözü önündə baş verir və belə də olmalıdır. Bunlar ilahi ayinlərdir. Amma bir çox, yaxud əksər ibadətlər – zikr, dua, nafilə, gecə namazı, əhya, ehsan və xeyriyyə işləri insanın özü ilə Allah arasında qalmalıdır. .İnsan heç vaxt digərlərinin görməsi üçün iş görməməlidir



---

.Məryəm/۳۹ [۳۱] -۱

Digərlərinin diqqətini cəlb etməkdən ötrü bir iş görmək onu görməməkdən pisdir. Çünki digərlərindən ötrü bir iş görmək, savabın yoxluğu baxımından görməmək kimidir. Daha pis olması isə şirkə bulaşmış iş gördüyünə görədir. Bu iş haramdır və insanı Allahdan uzaqlaşdırır. Buna görə bizim hamımız harada və hansı mövqedə olsaq, işi ixlasla görməyə çalışmalıyıq. Əgər iş Allah üçün görülsə, niyyət yalnız Allah olsa, adətən işlərdə müşahidə olunan nöqsanlar qarşıya çıxmaz. Biz işi ayrıları üçün gördükdə həqiqi məsləhətləri onun-bunun sözünə qurban vermiş oluruq. İnsan işi Allah üçün görmək istəyəndə yalnız vəzifəsinin nə olduğuna baxır. Baxmır ki, kimin xoşu gələcək, kimin acığı; hörməti kimin yanında artacaq, kimin yanında azalacaq. Bu gün İslam Respublikasında bütün orqanlarda iş Allah üçün görülür. Bu ölkədə və bu quruluşda kim nə iş görürsə, onu Allah üçün görə, Ondan mənəvi mukafat və savab .qazana və özünü Allah yanında üzüağ edə bilər

Mən ixlas barədə qeyd etdiyim bir hədisi oxumaq istəyirəm. Əziz Peyğəmbərin (s) belə buyurduğu nəql olunmuşdur: Hər bir şeyin həqiqəti vardır. Bəndə Allah üçün gördüyü işlərdə təriflənməsini istəmədən həqiqi ixlasa nail ola bilməz.(١) Hər bir şeyin bir həqiqəti, ruhu və məğzi vardır. İnsan Allah üçün gördüyü hər hansı bir işdə digərlərinin onu tərifləməsini istəmədən həqiqi ixlası dərk edə bilməz. Bu çox çətin və çox yüksək dərəcələrdəndir. Məsələn, bir şəxs işini digərləri üçün görmür; Allahdan ötrü namaz qılır, Quran oxuyur, xeyir işlər görür, yoxsullara kömək edir, sədəqə verir, Allah üçün zəhmət çəkir, amma insanların o çox yaxşı insandır – deməsini sevir. İşini camaat üçün yox, Allah üçün görmüş və bitirmişdir, amma xalqın tərifindən də xoşu gəlir. Bu hədis buyurur ki, bu, ixlasın yüksək dərəcəsi deyil. İxlasın yüksək dərəcəsi odur ki, bunu da istəməsin. Ümumiyyətlə camaatla işi olmasın - istər bilsinlər, istər bilməsinlər, istər xoşları gəlsin, istər gəlməsin. Allahın ondan nə istədiyinə baxsın və onu dəqiqliklə .yerinə yetirsin

Mən çox yerlərdə imamda bu xüsusiyyəti və ruhiyyəni müşahidə etmişəm. Onun üçün fərqi yox idi ki, kiminsə xoşu gələcək, yaxud gəlməyəcək. O, vəzifəsini yerinə yetirirdi. Yük ağır, iş böyük və təhlükəli olanda daha çox ixlas lazım olur. Bu gün İslam .Respublikası belədir

**İxlasın mərhələləri və ixlaslıların dərəcələri**

Əgər biz ixlasla işləsək, əməldə və niyyətdə Allah üçün çalışan ixlaslı bəndə olarıq. Müxləs (xalisləndirilmiş) bəndələr ixlaslı bəndələrdən də üstündürlər. Mərhum Seyid Bəhrül-üluma aid edilən bir risalədə ixlaslı şəxslə

səh:۳۹

---

.Bihar əl-ənvar, c. ۶۹, səh: ۲۹۴ [۳۲] -۱

müxləs şəxs bir-birindən fərqləndirilir. Deyir ki, ixlaslı şəxs əməli yalnız Allah üçün yerinə yetirən və digərləri ilə işi olmayan şəxsdir, müxləs isə özünün bütün varlığını xalis şəkildə Allaha həsr edəndir. Onun bütün varlığı yalnız Allah üçündür. Bu, çox yüksək və həqiqətən əlçatmaz dərəcədir. Lakin mənim fikrimcə, bu dövrdə xüsusən gənclər, əməl, mübarizə və cihad meydanında çalışanlar bu dərəcəyə də nail ola bilərlər. Əlbəttə, bizim kimilər üçün çətin və çox çətindir. Biz çox uzaqdayıq, amma gənclər, xüsusən də mömin, pak və ixlaslı gənclər özlərinin nurlu və pak qəlbləri ilə buna nail ola bilərlər. Adıçəkilən risalə mərhum Bəhrül-üluma mənsubdur, amma onun olması qəti deyil. Sonra buyurur ki, Allah-Taala bu müxləslərə üç vəd və üç böyük imtiyaz vermişdir. Biri budur ki, buyurur: Və onlar (qiyamət günü) gətiriləcəklər. Yalnız Allahın müxləs bəndələrindən başqa!(١) Yəni qiyamətdə müxləs bəndələrdən başqa hamı məhşər ayağına çəkilib hesab verəcək. Lakin onların bütün əməl, nəfs və .hərəkətləri Allah üçün olduğundan məhşərə daxil olmaz, sorğu-sual edilməzlər

İkinci imtiyaz budur ki, buyurur: Siz ancaq etdiyiniz əməllərin cəzasını alacaqsınız. Allahın müxləs bəndələri isə müstəsnadırlar.(٢) Allahın müxləs bəndələrindən başqa hamı gördüyü əmələ uyğun mükafat alacaq. Bunların əməlləri və mükafatları isə bir-birinə uyğun deyil; əməlləri nə olur-olsun, mükafatları sonsuzdur. Çünki Allaha məxsus olan bu varlıq özünü Allaha həsr etmiş və başdan-ayağa ilahi məqsədlərin xidmətində .durmuşdur. O bütün varlığını Allah üçün xalis etmişdir

Mən bir hədis gördüm. Əlbəttə, bu hədislərin sənədinə baxmağa vaxt tapmıram və necə olduğunu bilmirəm, amma məzmunu bu idi ki, Allah-Taala buyurur: Əgər ixlaslı, yaxud müxləs bəndəmə bütün dünyanı da versəm, azdır. Buna əsasən, onun mükafatı gördüyü əmələ uyğun deyil. Onun bir namazı Allahın yaxşı bəndələrinin qıldığı minlərlə .namaz kimidir

Öncəki iki imtiyazdan üstün olan üçüncü imtiyaz budur: Allah (müşriklərin) Ona aid etdikləri sifətlərdən tamamilə uzaqdır. Allahın müxləs bəndələri isə istisnadır(٣). Yəni Allah-Taala müxləs bəndələrindən başqa bütün insanların etdiyi vəsflərdən pakdır; yəni onlar Allahı layiqincə vəsf edə bilərlər, digər bəndələr isə bu iş üçün uyğun deyillər, Allahı layiq olduğu kimi tanımırlar. İnsanların Allahı vəsf etməsi qüsurlu və yarımçıqdır, müxləs bəndələr isə belə deyillər. Onlar Allah-Taalanı layiqli şəkildə vəsf

Odur ki, insan imamlardan nəql olunan dualarla ünsiyyət və rabitə qursa, Allah-Taala ilə düzgün münacat etməyə və Onunla layiq olduğu kimi danışmağa ümid yarana bilər. Yeri gəlmişkən, ramazan ayı dua ayıdır, duaları unutmayın. Ramazan ayı üçün deyilən dualar nemət və fürsətlərdir. Onları qənimət sayın. Bu Əbu Həmzə duası, İftitah duası, Cövşən duası, ramazan ayının gündüzlərində, axşamlarında, gecələrində və digər saatlarında oxunan digər dualar həqiqətən Allahın böyük nemətləridir. Bunlardan .yaxşı istifadə edin

**Ramazan – gündəlik namazların nafilələrini qılmaq fürsəti**

Bir tövsiyə də yadıma düşdü. Gündəlik namazlar üçün deyilmiş bu otuz dörd rükət nafilə çox dəyərli ibadətdir. Ramazan ayı da yaxşı fürsətdir. Biz əksərən nafilə qıla bilmirik, amma ramazan ayında qılsaq, nə olar ki?! Oruc ağızla namaz qılmaqdan yaxşı nə ola bilər?! Dördrükətli zöhr namazından öncə səkkiz rükət nafilə qılınır; dörd ikirükətli namaz. Dördrükətli əsr namazından öncə onun səkkiz rükət nafiləsi qılınır. Bu nafilələri qılın. Şam namazının nafiləsi bunlardan əhəmiyyətlidir; həmçinin gecə nafiləsi on bir rükət, sübh namazının nafiləsi isə iki rükətdir. Bəzi adamlar üçün il boyu nafilə qılmaq, sübh namazından öncə gecə namazına oyanmaq çətin olur, amma bu gecələrdə məcburən və təbii şəkildə oyanırlar. Bu da Allahın bir nemətidir. Nə üçün .bundan istifadə etməyək?! Ramazan ayının fürsətlərini qənimət bilin

.Mübarək ramazan ayının birinci günündə çıxışdan: ۱۹۹۳

## Ramazan – dua və münacat fürsəti

Namazda iştirak edən bütün qardaş və bacıları ilahi təqvaya dəvət edirəm. Ramazan və Allah ziyafəti ayıdır. Bu bərəkətli qonaqlığın açarı təqvadır. Bu ayda bizim üzərimizə düşən vəzifələrdən, daha doğrusu, bizim üçün yaranan fürsətlərdən biri duadır. Dua barədə üç məsələyə toxunmaq istəyirəm. Duada mənim dediklərimdən daha çox .fayda, təsir və bərəkətlər olsa da, bu üç məqam və üç fayda əhəmiyyətli nöqtələrdir

Biz Haqq-Taalanın dərgahına dua etdikdə, əslində öz istəklərimizə nail olmaq üçün bir vasitə axtarır, bu istəklərə sarı bir yol keçir və ondan istifadə edirik. Bu bir növ dua etməkdir: istədiyini almaq üçün dua etmək. İnsanın bütün məqsədləri maddi vasitə və yollarla əldə edilmir. Bəzi şeylər dua ilə əldə olunur; sözsüz ki, yalqız və əməlsiz dua ilə yox. İnsanın əməl qapısını bağlayıb, dua ilə kifayətlənməsinin heç bir faydası yoxdur. Lakin əməlin yanında, işin yanında, iradə və səyin yanında Allahdan istəmək də lazımdır. Bu dua insanın istəklərini təmin edir. Görürsünüz ki, əziz Peyğəmbər (s) döyüş meydanında bütün işləri gördükdən sonra dua da edir. Deməli, dua etmək, bu yolla öz .istək və məqsədlərimizə nail olmaq bizim vəzifələrimizdən biridir

## Duanın qəbul olunmasının qayda və şərtləri

Dua digər vasitələrin yanında bir vasitədir. Bizim böyük tədqiqatçı və mütəfəkkirlərimizin sözü ilə desək, Allah-Taala varlıq aləmində onlarla vasitə və səbəb qoyub; dua da onlardan biridir. Duaların çoxunda hacət və istək irəli sürülür. Misal üçün, mübarək ramazan ayının çox yüksək məzmuna malik olan Səhər duasında Allah-Taalanı ad və atributlarına and verdikdən sonra deyir: "İstədiyini dua et və nəzərdə tutduqlarını Allahdan istə". Allah-Taalaya bu qədər and verdikdən sonra dua qəbul olunur. Əmirəlmöminindən (ə) nəql olunmuşdur ki, bəla gəlməzdən öncə dua ilə onu dəf edin(١). Bunlar həqiqətdir. Əlbəttə, bu o demək deyil ki, siz nə istəsəniz və onu Allah-Taalaya necə desəniz, qəbul olunacaq. Xeyr, bütün adi səbəblər və bütün istəklər kimi onun da şəraiti və qaydaları var. Əgər siz dostunuzdan da bir şey istəsəniz, onun da qaydaları və yolları var. Duaya məxsus qaydanı işlətmək lazımdır. Ən əsas qayda budur ki, insan Allah-Taalaya diqqət yetirsin və bütün qəlbi ilə Allahdan istəsin. İnsanın qəlbi yumşalıb Allaha yönəldikdə duanın zamanıdır. O zaman Allahdan

istəsəniz, adətən istəyiniz təmin olunar. Əgər Allahın elmində bəzi məsləhətlər mövcud olsa, heç. Biz bu mətləbləri bilmirik. Allah-Taala mənim və sizin dualarınıza görə yaradılışın, yaxud bir xalqın ümumi maraqlarını ayaq səh:۴۱

---

.Bihar əl-ənvar, c. ۹۰, səh. ۲۸۹ [۳۶] -۱

altına atmır. Əgər bizim istəyimizə böyük bir məsləhət mane olmasa və dua halında .lazımi diqqətə malik olsaq, dua qəbul olunar; ya tez, ya gec

Hədislərdə göstərilmişdir ki, hacətlər üçün dua etdikdə öz duanızı və istəyinizi çox bilməyin. Yəni nə qədər istəyirsinizsə, Allahdan diləyin. Deməyin bu çoxdur, azını istəyim ki, mümkün olsun. Duanı çox hesab etmək bizə qadağan olunmuşdur. Yəni Allah qarşısında duanı və istəyi çox saymayın. Allahdan böyük istəklər diləyin, Allah-Taala verəcək. Duaya ümid qapısını üzünüzə bağlamayın. Allah-Taalanın özü ilə bəndələri arasında yaratdığı bu yolu və vasitəni üzünüzə bağlamayın. Hədis kitablarında belə bir fəsil var: Duada tələsməmək. Yəni duada tələsməyin. Əgər bir şey istədinizsə və o sizin istədiyiniz zaman təmin olunmadısa, deməyin ki, Allah-Taala mənim duamı qəbul etmədi. Xeyr, hər şeyin öz zamanı var. Hədisdə gtöstərilir ki, Allah-Taala Bəni-İsraili xilas etməsini söz verdikdən sonra onlar qırx il dua etdilər və nəhayət baş verdi. Böyük iş görüldü. Fironun qərq olması və Musanın ona qələbə çalması üçün qırx il çalışmaq çox deyil. Tələsməyin, Allahı diqqətlə çağırın və nə istəyirsinizsə, Ondan diləyin. Bəzi dualarda buna işarə vurulub. Bir duada göstərilir ki, böyük arzular hər bir qapıdan və hər bir şəxsin yanından qaytarılır, lakin Sənin yanında .belə deyil. Sənin yanında böyük arzular da təmin edilir

### Məsumlardan nəql olunan dualarda dərin İslam bilgiləri

Duada mövcud olan digər cəhət budur ki, imamlardan bizə çatmış dualarda İslam bigilərinin böyük dərsləri yatmışdır. Əgər bu Səhifeyi-Səccadiyyəni mütaliə etsəniz və sözlərin dua cəhətinə diqqət yetirməsəniz, görərsiniz ki, onun hər bir duası İslam və Quran bilgilərinin uca bir dərsidir. Əgər insan Əmirəlmömininin (ə) Nəhcül-bəlağənin birinci xütbəsi olan Tövhid xütbəsini və Səhifeyi-Səccadiyyənin Allaha həmd barədə olan birinci duasını qarşısına qoysa, görər ki, onlar bir-birinə bənzəyir və fərqlənmirlər; xütbə və dərsdirlər. Əmirəlmöminin (ə) bir qrupun qarşısında dayanıb ilahi bilgiləri bəyan etmiş, İmam Səccad (ə) da dua etmiş və dua dili ilə həmin bilgiləri söyləmişdir. Yaxud Səhifənin səkkizinci duası bir əxlaq duasıdır. Mən onun bəzi hissələrini qeyd etmişəm. Sanki bir nəfərin oxuduğu bir xütbə, yaxud xalq üçün etdiyi və əxlaqi .uçurumları açıqladığı bir çıxışdır

İmam Səccad (ə) bu duada tamahkarlıqdan, hərisliyin artmasından, qəzəbin çoxluğundan, paxıllığın hakim olmasından, dözümsüzlükdən, qənaətin azlığından, kobudluqdan, çoxlu şəhvətbazlıqdan, haqsız təəssübkeşlikdən, nahaq tərəfdarlıqdan, ,öz günahını kiçik və itaətini böyük saymaqdan

ixtiyarımızda və tabeliyimizdə olan toplumu pis idarə etməyimizdən, zalıma kömək etməyimizdən və çarəsizə kömək etməməyimizdən Allaha pənah aparır. İmam Səccad (ə) bütün bu mətləbləri bir duada bu formada bəyan edir. Deyir ki, İlahi, bunlardan Sənə sığınıram. Bunlar əxlaq dərsləridir. Səhifeyi-Səccadiyyənin duaları, Əbu Həmzə Sumali duası, İftitah duası, ramazan ayının digər duaları, cümə gecəsində, gündüzündə və digər zamanlarda oxunan və imamlarımızdan bizə çatmış bütün bu dualar tövhid, nübüvvət, hüquq, cəmiyyətin vəziyyəti, əxlaq, hökumət və insanın bilməyə ehtiyacı olan bütün İslam məsələləri haqda İslam bilgiləri ilə doludur. Bu dualarda bizim üçün dua dili ilə bəyan olunmuş mətləblər var. Bizim imamlarımız tağutların hakimiyyəti dövründə bilgiləri bu yolla xalqa çatdıra bilmişlər. Bu da dua .barədə başqa bir baxışdır

**Duaya baxış növləri**

Bu iki baxışda dua vasitədir. Birinci baxışda dua insanın istək, məqsəd və arzularına çatması üçün, ikinci baxışda isə ilahi bilgiləri anlamaq üçün vasitədir. Duaya üçüncü baxış budur ki, insan dua ilə, yalvarmaqla və hacətini bildirməklə özünü Allah-Taalaya yaxınlaşdırsın. Dua etməyin özü Allah-Taalaya yaxınlaşmaqdır. Rəblə danışmağın, yalvarmağın özü, Allahla danışmağın, Allah-Taaladan üzr istəməyin, tövbə etməyin və bağışlanmaq diləməyin özü insan üçün bir məqsəddir. Bu, duada mövcud olan ən üstün cəhətdir. İnsanın Rəbb qarşısında dayanıb göz yaşı tökməsi, kiçik və dəyərsiz olduğunu bildirməsi onun üçün bir məqam ucalığıdır. Bəşər Allah-Taala qarşısında kiçilməklə yüksəlir və zirvəyə qalxır. İnsanın bədbəxtliyi Allah-Taaladan xəbərsiz olduğu, özünü Allaha ehtiyaclı bilmədiyi zaman başlayır. Bəşərin uğursuzluğu o zaman başlayır ki, həyatında Allahla ünsiyyət və əlaqə üçün heç bir yer ayırmır. Dünyada nə qədər pislik varsa, bundandır. Bəşər vücudunda nə qədər çirkinlik varsa, bundandır. İnsan özünü pis əməllərdən sığortalamaq üçün Allaha doğru getməli, Allahla ünsiyyət .və əlaqə yaratmalıdır. Bu hamının vəzifəsidir

Ramazan ayı belə dua etməyin zamanıdır. Heç bir eybi yoxdur, öz hacətinizi istədiyiniz duanı diqqətlə, yalvarışla və ürəkdən edin, ürəyinizi Allaha yaxınlaşdırın. Mənim və .sizin buna ehtiyacımız var. Mənim qardaşım və bacım! Duadan qafil olmayın

İslam Respubilkası – dünyanın quldurları ilə mübarizə aparmalı olan quruluş, fəsad dağları ilə vuruşmalı olan xalq, heç bir quldurun qarşısında baş əyməyən və bəşəriyyətin xilası üçün danışan cəmiyyət və quruluş öz fərdlərinin

daxilində və qəlbində dua və yalvarışa sarı qapılar açmalıdır. Bunsuz olmaz. Əgər düşmən qarşısında möhkəm olmağınızı istəyirsinizsə, dua qapısını açmalısınız. Əgər heç kimdən və heç kəsdən qorxmamaq istəyirsinizsə, Allahla əlaqənizi gücləndirməlisiniz. Əgər maddi gözəlliklər qarşısında möhkəm olmağınızı və sürüşməməyinizi istəyirsinizsə, özünüzü dua və münacatla sığortalamalısınız. Bu duadır. Bu bütün müsəlmanların mənəvi vəzifəsidir, insanın öz daxilindən Allah-Taalaya sarı açdığı yoldur. Buna görə siz görürsünüz ki, Əmirəlmöminin (ə) - o qorxmaz insan, o mücahid, o böyük insan, o qüvvəli və qüdrətli hakim, fikri, beyni, ağlı, hikməti və elmi dünyanın ən böyük filosof və həkimləri üçün dərs olan, diz qatlayıb öyrənməli olduqları bu şəxs, qarşısında bütün dünya dayansa da, arxa çevirməyən bu güclü insan öz dövrünün bütün insanlarından daha çox ibadət edir, Allah-Taala qarşısında daha çox ağlayır və yalvarırdı.

Ramazan ayını əldən verməyin; bu fürsətləri fövtə verməyin. Ramazan ayı dua və ibadət üçün çox əlverişli zamandır. Çalışıb dua qapısını üzümüzə açıq saxlayaq. Əgər kimsə dua etməyə müvəffəq olsa, diqqətlə və ürəkdən dua etsə, bilsin ki, Rəbbin lütfü ona şamil olmuşdur. Duanın qəbul olunması isə sonrakı mərhələdir. İslam cəmiyyəti gərək Allaha yalvaran, dua və tövbə edən cəmiyyət olsun.

Tehranın cümə namazı xütbələrindən: ۱۹۹۳.

Ümidvarıq Allah bu fitr bayramını bizim xalqımıza və digər xalqlara mübarək etsin! Hər şeydən mühüm olan və hər zaman, xüsusən də mübarək ramazan ayından sonra gələn fitr bayramında diqqət yetirməli məsələ budur ki, hər bir xalqın hərəkət və uğurunda əsas amil düşüncə, etiqad və ruh təməllərini bərpa etməkdən, .möhkəmlətməkdən ibarətdir

İslam bizə öyrədir ki, dünya və axirət məqsədlərinə çatmaq üçün insanın daxilində bir dəyişiklik baş verməlidir. Bir cəmiyyətdə və xüsusi olaraq müsəlman cəmiyyətlərində həmin dəyişiklik baş verməyincə, qəlblər Allahla tanış olmayınca, Allahın yoluna ən üstün və doğru yol kimi baxmayınca və üz tutmayınca müsəlman cəmiyyətlərin problemləri həll olunmayacaq. İlahi hədiyyə və ehtiyat olan, müsəlman xalqın ixtiyarına qoyulmuş ramazan ayının daxilində bizim üçün həmin istiqamətdə dəyərli ərməğanlar vardır. Bir tərəfdən bir təlim və riyazət olan ramazan ayının orucu nəfsə hakim olmaq üçün vasitədir. Nəfsə hakim olmadan, həvəs və ehtirastları cilovlamadan heç bir böyük işi uğurla görmək olmaz. Ramazan ayı öz orucu ilə bu istiqamətdə dəyərli bir təlimdir, məşqdir. Allahın lütfü ilə Əhli-beyt (ə) məktəbinin davamçıları məsumlardan nəql olunmuş duaların vasitəsi ilə bu mübarək ayın axşam, gündüz və gecələrində Allaha dua, Onunla raz-niyaz və münacatlar etdilər. İmam Səccadın (ə) zümzüməsi ilə tanış olan şəxs bizim Allah yolundan, mənəviyyatdan uzaqlaşmağımızın, bizim və bizim kimilərin mənəvi və ruhani dərəcələrdən məhrum olmasnın səbəbinin ehtiraslara uymaqdan və əmmarə nəfsə itaətdən doğan .problemlərin olduğunu yaxşı anlayır

İmam Səccad (ə) Əbu Həmzə duasında deyir ki, ey mənim Rəbbim, məni Sənin itaətindən saxlayan günahımdan ayır. Günah dedikdə əsas məsələ insanın öz ehtirasları və nəfsinə tabe olmasına görə düçar olduğu məsələlərdir. Bu duadan bəlli .olur ki, günahlar insanı ucalmağa qoymurlar

Biz bu ramazan ayında dəfələrlə dedik ki, İlahi, Öz gözəl halınla bizim uğursuz halımızı dəyişdir.(١) Allah-Taaladan istədik ki, bizim pis halımızı öz lütfü ilə yaxşı hala çevirsin. Əgər bu olsa, Allahın lütfü ilə bütün problemlər həll olunacaq. Ölkədə istər kiçik, istər

böyük bir vəzifədə çalışdığımız üçün bizim hər birimiz öz vəzifəmiz qədərincə bu halın dəyişməsinə daha çox ehtiyaclıyıq və pis halımıza görə daha çox dərd çəkməliyik. Mən özümü deyirəm. Mən bu dəyişikliyə sizdən çox ehtiyaclıyam. Bu bir ölkədə və bir xalqda hərəkət və yeniliyin açarıdır. Hər hansı bir tayfa öz vəziyyətini dəyişmədikcə, Allah da



---

.Bihar əl-ənvar, c. ۹, səh: ۱۲۰ [۳۷] -۱

onun vəziyyətini dəyişməz!(١) Onların nəfslərində və canlarında olan dəyişməlidir ki, .həyat da dəyişsin

## Ramazan – Allaha itaət və Onun razılığını qazanmaq yarışı

Mübarək fitr bayramı möminlər üçün mükafat, əziz Peyğəmbər (s) və onun canişinləri üçün bayram, şərəf və hörmət günüdür. Namazda iştirak edən siz müsəlman qardaş və bacıların hamısını təqvaya dəvət edirəm. Təqva Allahın yardımı ilə ramazan ayının .orucundan doğan nəticədir

Fitr bayramı Allahın nəzər yetirdiyi, möminlərə ilahi rəhmət və əfvin şamil olduğu gündür. Mübarək ramazan ayı kimi bu günün də qədrini bilmək lazımdır. Bir hədisə görə, İmam Müctəba (ə) fitr bayramında bir yerdən keçərkən bir qrup insanın əyləndiyini, bu günə əhəmiyyətsiz halda deyib-güldüyünü gördü. Onların yanında dayanıb buyurdu: Həqiqətən Allah ramazan ayını bəndələrinə yarış mövsümü etmişdir. Bu ayda insanlar Onun razılığını əldə etmək üçün bir-biri ilə yarışırlar.(٢) Buyurdu ki, ötən ramazan ayında bəziləri önə keçib qalib oldular, digərləri isə səhlənkarlıq etdilər, özlərini ilahi rəhmətə çatdıra bilmədilər, məyus oldular. Bir hədisdə deyilir ki, gülüb-əylənməklə məşğul olan insanlar qəribə insanlardır. Saleh əməl sahibləri savab tarlalarını yığacaqları gün onlar ziyan içərisində olacaqlar. Bu böyük gün qiyamət gününə bənzəyir. Ramazan ayında Allahın razılığını qazana bilmiş şəxslər fitr bayramında Allah-Taaladan öz mükafatlarını alırlar. Bu gün əhəmiyyətsiz yanaşılası bir gün deyil. İmam Həsən Müctəba (ə) sözünün davamında buyurdu ki, əgər bəsirət gözü açılsaydı və bizim gözlərimizin önündəki maddi pərdələr götürülsəydi, saleh insanların öz mükafatlarını və savablarını toplamaqda, pis insanların da öz .səhlənkarlıqlarının nəticəsini seyr etməkdə olduqlarını görərdik

## Ramazan ayının təsirlərini gələn il üçün saxlamaq

Ramazan ayı bütün xeyir və bərəkətləri, bütün səmərəli saat və anları, Allah-Taalanın o ayda mömin və saleh insanlara verdiyi bütün vədləri ilə keçdi. Bəzi adamlar bu aydan fayda götürdülər, öz qablarını doldurdular və növbəti ramazan ayına qədər bir il boyu özlərini sığortaladılar. Xoş onların halına! Ümidvaram ki, siz qardaş və bacılar da belə insanların sırasında olasınız. Ramazan ayında öz səyinizin nəticələrini qorumağa

çalışın, ürəkləri təmiz saxlayın, sizi Allahdan uzaqlaşdıran işlərlə məşğul olmayın, qəlbinizin Allahı



---

۱- [۳۸] Rəd/۱۱.

۲- [۳۹] Tühəf əl-üqul, səh: ۲۳۶.

xatırlamasını istəyin, onun qədrini bilin. Ramazan ayında əldə etdiyiniz nəticə və səmərələrlə ilin sonuna qədər öz səadətinizi təmin edin. Allahın lütfü ilə İran İslam Respubikasında yaxşı olmaq, yaxşı qalmaq və yaxşı yaşamaq istəyənlər üçün əlverişli şərait vardır. Müsəlman yaşamaq istəyənlər İslam Respublikasında müsəlman yaşaya və müsəlman qala bilirlər. Dünyanın çoxlu ölkələrində belə şərait yoxdur ki, gənc günah etməyə bilsin, günaha yaxınlaşmaq istəməyən şəxs bunu bacarsın. Bu şərait .İslam respublikasının səmərələrindəndir. Bunun qədrini bilməliyik

.Fitr bayramı namazının xütbələrindən: ۱۹۹۳

Ramazan ayı başqa bir cəhətə görə də çox diqqətəlayiqdir. Mən bu barədə bir neçə kəlmə danışmaq istəyirəm. Bu sözlər sizin üçün yeni deyil, özünüz bunları xalqa deyirsiniz, amma eşidənlər üçün bir xatırlatma olsun deyə söyləyirəm. Ramazan ayı Allahın bizim maddi dünyamızın qaynar cəhənnəmində yerləşdirdiyi bir cənnət parçası, bu ayda bu ilahi süfrənin başında özümüzü cənnətə daxil etmək üçün verdiyi bir fürsətdir. Bəzi adamlar bu otuz gündə cənnətə daxil olurlar, bəziləri bu otuz günün sayəsində bütün ili, bəziləri bütün ömürlərini cənnət edirlər, bəziləri də onun kənarından xəbərsiz ötürlər. Bu, təəssüflü və ziyanlıdır. Yalnız özünün yox, bu yüksək potensiala malik olan insan məxluqunun belə bir böyük süfrədən istifadə etmədiyini görən hər bir kəsin təəssüflənməyə haqqı var. Bu, ramazan ayı, Allahın ziyafəti və .qədr gecəsinin ayıdır

Bunları o qədər təkrarlamış, demiş və eşitmişik ki, bizə adi gəlir. Bu adi məsələlərin arasında həqiqətləri tapan insan kamillik yoluna çıxar. Maddi elm də belədir. Hamı ömür boyu almanın ağacdan ayrıldıqda yerə düşdüyünü görmüşdü; dünyada bundan da adi bir iş yoxdur. Amma bir nəfər bunun bir fenomen olduğuna diqqət yetirdi: nə üçün alma aşağıya enir; nə üçün ağacdan ayrılanda yuxarıya qalxmır? Və bununla cazibə qüvvəsi kəşf olundu, bəşər elmində yeni bir qapı açıldı. Bizim həyatımızın bütün adi məsələləri belədir. Qurana baxın: Nə üçün dəvənin necə yarandığına baxmırlar?(١). Dəvə ilə gəzən ərəb üçün dəvədən adi bir şey varmı?! Allah insanın diqqətini dəvəyə yönəldir. Biz ətrafımızdakı bu ilahi fenomenlərə diqqət yetirməliyik. Onlardan biri də ramazan ayıdır. Allah ziyafəti kiçik məsələ deyil. Eşitmişik ki, Allah ziyafəti qonaqlıqdır. Özü də elə bir qonaqlıqdır ki, ev sahibi bütün kainatın ixtiyar sahibi olan əzəmətli, elmli, səxavətli və qüdrətli Allahdır. Bu ilahi ziyafətdir və biz ona dəvət olunmuşuq. Bundan istifadə etmək lazımdır. Bundan necə istifadə etmək olar? Bizim ixtiyarımızda qoyulanlarla – orucla, namazla, müstəhəb işlərlə, dua ilə, ibadətlə, zikrlə, raz-niyazla. Əgər bu işlərlə məşğul olsaq və biz ruhanilər öz dinləyicilərimizi də bu işlərə cəlb edə bilsək, bu ölkə bir cənnət parçasına çevriləcək, dünya və axirət düzələcək: Əgər o məmləkətlərin əhalisi iman gətirib təqvalı olsaydılar, sözsüz ki, göyün və yerin bərəkət qapılarını onların üzünə açardıq(٢). Bunlar ilahi vədlərdir, şişirtmə deyil. Allah-Taala yerin və göyün bərəkətlərini təqvalı xalqa açacaq. Təqva da sözügedən işlərlə əldə

## Təqva – ramazan ayının yeganə məqsədi

Ramazan ayının orucunun ən böyük məqsədlərindən və bəlkə demək olar ki, yeganə məqsədi təqvadır: Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də vacib edildi ki, (bunun vasitəsilə) təqvalı olasınız(۱). Bu bizim əlimizdədir. İnsanların hər biri özlərini və əgər bacarsalar, digərlərini islah etməlidirlər. Bu yalnız ruhanilərə məxsus deyil. Lakin din alimlərinin, ruhanilərin, xətib və vaizlərin hazırlıqları var, Allah-Taala onlara bu imkanı, nitqi, zehni, ictimai mövqeyi və libası vermişdir. Biz bundan istifadə etməliyik. Ramazan ayında adi məsələlərdən biri də Allah-Taalanın bu aydın sözləridir: Qədr gecəsi min aydan xeyirlidir. O gecə mələklər və Ruh Rəbbinin izni ilə hər bir işdən ötrü yerə enərlər. O gecə dan yeri sökülənə kimi (büsbütün) salamatlıqdır(۲). Bir gecə səhərə qədər ilahi salamın timsalıdır; möminlərə, cənnət əhalisinə və Allahın ixlaslı bəndələrinə məxsus olan Rəhmli Rəbdən salam(۳). Bu, istifadə etməmiz üçün bizim ixtiyarımıza qoyulmuşdur. Mənim ramazan ayı barədə demək istədiyim budur. Bu, bütün işlərdə islahın açarıdır; hər şey buradan başlanır. .Necə ki, inqilabın özü buradan başlandı: məsciddən, dindən və təqvadan

Əgər böyük imama baxsanız, bu əzəmətli hərəkətin əsas təməlinin təqva olduğu daha çox məlum olar. İmam təqvanın, zikrin, ilahi dərkin, Allah üçün əməlin və ixlasın timsalı idi. Əgər bu olmasaydı, mümkün olmazdı. Əgər imam o qədər yaxşı, mənəviyyatlı və .mərifətli olmasaydı, bu iş belə nəticələnməzdi. Bu, islah üçün müqəddimədir

.Ruhanilərlə görüşdə çıxışından: ۱۹۹۴

səh:۴۹

---

.Bəqərə/۱۸۳ [۴۲] -۱

.Qədr/۳-۵ [۴۳] -۲

.Yasin/۵۸ [۴۴] -۳

### Ramazan – təqva vadisinə qədəm qoymaq ayı

Namazda iştirak edən bütün əziz qardaş və bacıları ilahi təqvanı qorumağa və ona riayət etməyə çağırıram. Təqva ayının, orucu insanın təqva vadisinə qədəm qoyması üçün vasitə olan ramazan ayının qədrini bilək və özümüzü təqva adlanan dindarlıq .mərhələsinə bacardıqca yaxınlaşdıraq

### Təqvanın fayda və təsirləri

Bu gün birinci xütbədə çox əhəmiyyətli olan bir Quran təcrübəsinə toxunacağam və söhbətim təqva barədə olacaq. Təqvanın insan həyatında çoxlu faydaları var. Onlardan biri budur ki, təqvalı insan həyatın uçurumlarında və çətin yollarında özünü qoruya bilir, təqvasız insan isə bunu bacarmır. Əgər insan özünə qarşı daimi ehtiyatdan, əməllərində, hətta fikirlərində və insana aid olan işlərdə özündə daimi diqqətdən ibarət olan təqva ruhunu yaratsa, nəticədə ilahi imtahanlardan sağlam çıxar. Çünki təqvanın mənası özünə baxmaqdan, diqqətdən, özündən ehtiyatlı .olmaqdan və diqqətsizlik etməməkdən ibarətdir

Mənim qardaş və bacılarım! İmtahan hamı üçündür. Bütün xalqlar həyatın eniş-yoxuşlarında imtahan olunmuşlar. Fərdi miqyasda baxdıqda da bütün insanların imtahan olunduğunu görürük. İmtahanlar müxtəlifdir, amma hamı üçündür. İnsanın qarşısına şəriətin ziddinə olan bir ləzzət çıxır və insan ona meyllənir - bu, imtahandır; insanın qarşısına onun əldə edə biləcəyi, lakin Allahın qanun və qaydalarının ziddinə olan pul çıxır - bu, imtahandır; insan bir söz deyir, o söz onun özü üçün faydalıdır, amma nahaq sözdür - bu, imtahandır; bir yerdə bir sözü demək lazımdır, Allah insandan onu deməsini istəyir, lakin bu iş təhlükəli və çətindir - bu, ilahi imtahandır. Ümmət və xalqlarda da belədir. Bir xalqın sərvətli və qüdrətli olması, nailiyyətlərlər əldə etməsi, elmi inkişafları həmin xalq üçün imtahandır. Əgər xalqlar qüdrətin zirvəsində olduqda özlərini sağlam saxlaya bilsələr, imtahandan başıuca çıxmışlar. Əgər cəmiyyət və xalqlar sıxıntı azaldıqdan sonra Allahı unutsalar, imtahandan uğursuz və başıaşağı çıxmışlar. Məhz buna görə Quran qısa Nəsr surəsində Peyğəmbərə (s) müraciətlə buyurur: (Ey Peyğəmbər!) Allahın köməyi və zəfər (Məkkənin fəthi) gəldiyi zaman, insanların dəstə-dəstə Allahın dininə daxil olduqlarını

gördüyün zaman.(۱) Bu bir Peyəğmbərin (s) iqtidarının zirvəsidir. Allah ona yardım və qələbə bəxş edir, insanlar qrup-qrup onun dininə gəlirlər. Bu halda ehtiyatlı olmaq lazımdır. Odur ki, ardınca buyurur: Rəbbini həmd-səna ilə təqdis et və Ondan bağışlanmağını dilə. Həqiqətən, O, tövbələri qəbul səh:۵۰

---

۱- [۴۵] ۱-۲/Nəsr.

edəndir!(١). Həmin qələbə anında Allahı xatırla, Onu uca tut, Ona şükür et. Çünki bütün .bu uğurların səbəbkarı sən deyilsən, Allahdır. Özünə baxma, ilahi qüdrətə bax

Əziz Peyğəmbər (s) kimi hikmətli və ilahi rəhbər belə yerlərdə ümmətin yolunu azmasından ehtiyatlanır. Bu halda təqva bir xalqın köməyinə çatır. Əgər bir xalq təqvalı olsa, inkişaf, iman və Allaha bəndəlik yolunu davam etdirər. Əgər xalqların təqvası olmasa, tarixin müxtəlif dövrlərində dünyanın iqtidarlı xalqlarının düçar olduğu bəlalar başlarına gələr. Onlar qürura, hegemonluğa, zülmə, kobudluğa və yayınmaya düçar oldular, insanları yoldan çıxardılar, dünyanı xarabalığa çevirdilər və axırda özləri də məhv oldular. Bunun bir nümunəsini yaxın illərdə dünyada mövcud olan iki böyük imperatorluqdan birində müşahidə etdiniz. Bu, təqvasızlığın nəticəsidir. Dünyanın istər fərdlərdən, istər xalqlardan ibarət olan bütün təqvasızları öz süqutlarını gözləməlidirlər. Bu, qaçılmaz taledir. Təqvasızlığın ardınca mütləq süqut gəlməlidir. .Əlbəttə, tam süqutdan öncə yayınma, fəsad və xarabalıqlar var

.Tehranın cümə namazı xütbələrindən: ١٩٩٤



---

.Nəsr/٣ [٤۶] -١

Əmirəlmöminin (ə) ramazan ayının on doqquzunda xəncərlə vurulduqdan sonra qısa vəsiyyət etmişdir. Bu gün Allahın izni ilə onu sizə tərcümə edəcəyəm. Səbəb budur ki, insan həyatının son anlarında ən yaxşı və ən etimadlı adamlarına özünün əsas fikirlərini deməyə çalışır. Əmirəlmöminin (ə) xilqətin möcüzəsidir, birinci dərəcəli müsəlmandır, əziz Peyğəmbərin (s) bilavasitə ardıcılıdır. Onun məqamı səmalarda yerdən daha məşhurdur. Onun səma mələkləri arasında mürid və sevənləri insanlardan çoxdur. O, bütün uca ilahi incəliklərə yiyələnmiş arif, Allah yolunun birinci dərəcəli mücahidi idi. O, həyatının bütün mərhələlərində layiqli şəkildə cihad etdi; birinci dərəcəli zahid, birinci dərəcəli siyasətçi, birinci dərəcəli rəhbər idi. Bu yüksək xüsusiyyətlərə malik olan insan dünyadan köçür. Vaxtı azdır. O, sui-qəsddən öncə də .bunu bilirdi, digərlərinə isə sonra bəlli oldu

Ömrün son saatlarını keçirir və övladlarına, Kufə əhalisinə, o dövrün və bütün tarixin çaşqın müsəlmanlarına qısa bir mesaj vermək istəyir. Sözləri çox dəqiq seçilmiş bu mesaj bir səhifəyə sığır. Adi gözlə baxanda bu vəsiyyətin cümlələri bəzən bir-birinə uyğun görünməyə bilər. Bizim adi baxışımıza və təhlilimizə görə bir yerdə çox əhəmiyyətli bir məsələyə toxunur, sonra birdən-birə bizim fikrimizcə çox da əhəmiyyəti olmayan bir mətləb haqda danışır. Amma Əli ibn Əbu Talibin (ə) baxışı ilahi baxışdır, dəqiqdir, Allah-Taalanın yaranmışlara baxışı kimidir. İlahi meyarda və Əli (ə) baxışında kiçik və böyük olan bizim baxışımızdakı kiçik və böyüklərlə fərqlənir. Əgər insan bu baxışla baxsa, - təbii ki, bizim imkanımız azdır, uzaqdan təhlil edirik - cümlələr .uyğun görünər. Mətləblər çox dəqiq tənzim olunmuşdur

O bu vəsiyyəti İmam Həsən (ə) və İmam Hüseynə (ə) etmişdir. Zərbə vurulandan sonra onları yanına çağırdı, onlarla danışdı və bu sözləri söylədi. Yaralıdır, zəhərin təsirindən bədəni qızdırmışdır. Zəiflik və xəstəlik adi insanların söz söyləməsinə mane olur, amma Əli ibn Əbu Talib (ə) kimi bir şəxsə mane ola bilmir. Bu qısa saatlar ərzində - zərbə vurulandan şəhidliyə qədər sürən ۴۸ saatdan az bir müddətdə bütün vacib, zəruri və birinci dərəcəli işləri görməlidir və gördü. Biri bu vəsiyyəti idi. O, belə başlayır: .Sizə təqvalı olmağı tövsiyə edirəm(۱). Müqəddiməsiz olaraq birinci söz təqvadır

### Təqvanın tərifi və şərtləri

Təqva bir insanın hər bir şeyi, bir xalqın dünya və axirəti və bəşərin getməyə məcbur olduğu bu uzun yolun əsl azuqəsidir. Əmirəlmömininin (ə)



---

۱- [۴۷] Nəhcül-bəlağə, səh: ۴۲۱.

sözünün əvvəli və sonu təqvadır. Buyurur ki, mənim oğullarım, özünüzdən ehtiyatlı olun; Allah yolunda və ilahi meyarla. Allah təqvası bu deməkdir, Allahdan qorxmaq deyil. Bəzi adamlar təqvanı Allahdan qorxmaq kimi tərcümə edirlər. Allahdan qorxmaq da bir dəyərdir, amma təqva başqa bir şeydir. Təqva odur ki, ehtiyatlı olub, etdiyiniz hər bir əməlin Allah-Taalanın sizin üçün nəzərdə tutduğu məsləhətə uyğun olub-olmamasına diqqət yetirəsiniz. Təqva elə bir şey deyil ki, insan onu bir an tərk edə bilsin. Yol sürüşkən və uçurum dərindir. Əgər tərk etsək, sürüşüb uçurumdan yuvarlanacağıq. Gərək əlimiz bir daşa, ağaca, kola ilişsin və özümüzü yuxarı darta .bilək

İlahi təqvası olanlara şeytandan bir vəsvəsə (zərər) toxunduğu zaman onlar (Allahı) xatırlayıb düşünər və dərhal (özlərinə gəlib həqiqəti) görərlər.(١) Təqvalı insan şeytanın təmasını duyan kimi tez özünə gəlir və diqqətini toplayır; çünki şeytan bizdən .uzaqlaşmır. Deməli, birinci tövsiyə təqvadır

### Təriflənmiş dünya və məzəmmət olunmuş dünya

Təqvanın ardınca başqa bir məsələ gəlir. Buyurur ki, dünya sizin arxanızca gəlsə də, siz dünyanın ardınca qaçmayın. Bu da ikinci məsələ və təqvanın şərtlərindən biridir. Əlbəttə, bütün yaxşı işlər təqvanın şərtlərindəndir, o cümlədən dünyanın ardınca qaçmamaq. Demir ki, dünyanı tərk edin, deyir ki, onun ardınca hərəkət etməyin, dünyanı istəməyin. Dünya nədir? Yəni Yer üzünü abadlaşdırmaq? Yəni ilahi sərvətləri dirçəltmək? Arzulanmayan dünyanın mənası budur? Xeyr! Dünya sizin özünüz üçün, öz istifadəniz və ləzzətiniz üçün istədiklərinizdir. Buna dünya deyirlər. Yer üzünü abadlaşdırmaq isə əgər yaxşı niyyətlə və bəşəriyyətin xeyrinə görülürsə, eynilə axirət işi kimidir. Bu, yaxşı dünyadır. Məzəmmət olunan və arxasınca getməyimiz yasaqlanan dünya bizim qüvvəmizi, səyimizi və iradəmizi özünə yönəldən, bizi yoldan saxlayan dünyadır. Bizim xudpəsəndliyimiz, eqoistliyimiz, sərvəti və ləzzəti özümüz üçün .istəməyimiz məzəmmət olunmuş dünyadır

Belə dünyanın haram növü də var, halal növü də. Özü üçün istəməyin bütün növləri haram deyil, onun hallaları da var. Lakin halalının da ardınca getməməyimizi tapşırıblar. Əgər dünya bu mənada olsa, onun halalı da yaxşı deyil. Maddi həyatın

təzahürlərini bacardığınız qədər ilahi istiqamətə yönəldə bilsəniz, qazanmış və udmuşsunuz. Axirətin mənası budur. Ticarət də xalqın məişətini rövnəqləndirmək üçün olsa, özünə sərvət toplamaq üçün olmasa, axirətin özü olur. Dünyanın bütün işləri belədir. Deməli, ikinci məsələ budur ki, dünyanın ardınca qaçmayın və onun üçün .hərəkət etməyin



---

.Əraf/۲۰۱ [۴۸] -۱

Əmirəlmömininin (ə) özü bu vəsiyyətnamədə buyurduqlarının canlı təcəssümü olmuşdur. O həzrətin həyatı onun qısa vəsiyyətnaməsində yer alan cümlələrin .xülasəsidir

Ardınca buyurur ki, əgər məzəmmət olunmuş bu dünyadan sizin əlinizə bir şey çatmasa, təəssüflənməyin; filan sərvətə, filan vəzifəyə və filan maddi imkana malik .olmadığınıza görə heyfsilənməyin. Bu da üçüncü cümlədir

Sonrakı cümlə budur ki, haqqı deyin, onu gizlətməyin. Həqiqət olduğunu düşündüyünüzü lazım olan yerdə bəyan edin, haqqı saxlamayın. Danışa bilənlər bəzən haqqı gizlədib nahaqı aşkarlayanda, yaxud nahaqı haqqın yerinə qoyanda haqqı görənlər və bilənlər onu desələr, haqq məzlum və qərib olmaz, batil tərəfdarları haqqı .məhv etməyə tamah salmazlar

Sonra buyurur ki, ilahi və həqiqi mükafat üçün işləyin. Ey insan, əbəs işləmə! Sənin bu işin, bu ömrün, bu nəfəs çəkmən sənin yeganə əsas sərmayəndir; bunu əbəs yerə xərcləmə. Əgər bir ömür yaşayırsansa, bir əməl edirsənsə, bir nəfəs çəkirsənsə, bir enerji sərf edirsənsə, bunların hamısını mükafat üçün et. Mükafat nədir? İnsanın mükafatı bir qədər puldur? Mənim sərf etdiyim ömrün mükafatı budur? Kiminsə xoşuna gəlməsi və tərifləməsi bir insanın mükafatıdır? İmam Səccad (ə) buyurur ki, sizin ömrünüzə münasib muzd və qarşılıq yalnız cənnətdir. Nə qədər az alsanız, .aldanmısınız. Deməli, axirət mükafatı və savabı üçün işləmək lazımdır

Sonra İmam Əli (ə) buyurur: Zalıma xəsm (iddialı düşmən) və məzluma kömək olun. Burada işlənmiş xəsm sözünün mənası düşmən deyil. Zalımın düşməni olmaq odur ki, insanın zalımdan acığı gəlsin və onu düşmən bilsin. Ancaq bu kifayət etmir. Xəsm sözünün mənası iddialı düşməndir. Yəni zalımın yaxasını tutan, onu buraxmayan düşməndir. Bəşəriyyət Əmirəlmömininin (ə) şəhadətindən bu günə qədər zalımların yaxasını tutmamasına görə bədbəxt olmuşdur. Əgər imanlı əllər zalımların yaxasını tutsaydılar, zülm dünyada bu qədər yayılmazdı, bəlkə də onun kökü kəsilərdi. Əmirəlmöminin (ə) bunu buyurur: Zalıma iddialı düşmən olun. Dünyada harada zülm və zalım varsa, sən özünü ona iddialı düşmən bilməlisən. Demirik ki, indi yola düş və dünyanın bu başından o başına gedib zalımın yaxasını tut; deyirik ki, mütləq öz

düşmənliyini göstər. Nə zaman və harada fürsət yaransa, ona düşmən olduğunu bildir və yaxasını tut. Bir zaman insan zalıma yaxınlaşıb düşmən olduğunu göstərə bilmir, odur ki, uzaqdan düşmənlik edir. Görün bu gün Əmirəlmömininin (ə) vəsiyyətinin bu bir kəlməsinə əməl etməməyə görə dünyada necə fəlakətlər yaranmış və bəşəriyyət hansı bədbəxtliklərə düşmüşdür. Görün xalqlar, xüsusən də müsəlmanlar necə məzlumdurlar! Əgər

Əmirəlmömininin (ə) bu bir vəsiyyətinə əməl olunsaydı, bu gün zülmlərin və onlardan
.yaranan fəlakətlərin çoxu olmazdı

Və məzluma kömək olun. Harada məzlum varsa, ona kömək ol. Demir ki, məzlumun
.tərəfdarı ol, xeyr, gərək bacardığın qədər kömək edəsən

Buraya qədər imamın vəsiyyəti İmam Həsənə (ə) və İmam Hüseynə (ə) müraciətdir.
.Təbii ki, bu sözlər yalnız onlara aid deyil. Onlara müraciətdir, amma hamıya aiddir

### **Əmirəlmömininin (ə) bütün dövrlərdə bütün nəsillərə vəsiyyəti**

Vəsiyyətin sonrakı cümlələrini Əmirəlmöminin (ə) ümumi şəkildə buyurur: Siz iki oğluma, bütün övladlarıma, ailəmə və bu vəsiyyətnamənin çatdığı hər bir kəsə
.vəsiyyət edirəm

Buna əsasən, burada əyləşən sizlər və bu vəsiyyətnaməni oxuyan mən də Əmirəlmömininin (ə) müraciət tərəfi sayılırıq. Buyurur ki, sizin hamınıza vəsiyyət edirəm. Nəyi? Yenə Allah təqvasını - yenə təqva! Əmirəlmömininin (ə) birinci və axırıncı sözü təqvadır. Onun ardınca buyurur: Və işinizdə nizam-intizamlı olmağı vəsiyyət edirəm. Bu nə deməkdir? Yəni həyatda gördüyünüz bütün işlər nizam-intizamlı olsun? Mənası budur? Bu da ola bilər, amma buyurmadı ki, işlərinizi nizam-intizama salasınız, buyurdu ki, işinizi. Yəni nizam-intizama salınmalı məsələ bir şeydir. Bunu cəm formasında deməmişdir. İnsan anlayır ki, bu iş hamı üçün müştərək bir məsələdir. Mənim fikrimcə, burada məqsəd İslam quruluşu, İslam hakimiyyətidir. Yəni hökumət
.və quruluş məsələsində nizam-intizamlı və planlı rəftar edin

İslam dünyası həmin nizamsızlıqlara və xudpəsəndliklərə görə bu vəziyyətə düşdü. Əgər Əmirəlmöminin (ə) İslam dünyasının rəhbəri seçiləndə, bütün İslam ümməti ona beyət edəndə həmin beyətə sadiq qalsaydılar, bu fəlakət və bədbəxtliklər baş verməzdi. Peyğəmbər (s) buyurub ki, əgər bir şəxs imam olsa, xalq onu qəbul etsə və bu işdə Allahın razılığı olsa, heç kimin ona qarşı çıxmağa haqqı yoxdur. Əgər Peyğəmbərin (s) bu cümləsinə əməl olunsaydı, o döyüşlər baş verməzdi; nə Cəməl döyüşü, nə Siffeyn döyüşü, nə Nəhrəvan döyüşü. Bəzi adamların öz istəklərinə görə xalqı sarsıtmaları, o tərəf-bu tərəfə çəkmələri, hakim sistemi və ölkənin ümumi nizam-

intizamını pozmaları böyük fəlakətdir. Əmirəlmöminin (ə) vəsiyyətnamənin bu .hissəsində onu qadağan edir və əksini tapşırır

Vəsiyyətin ikinci hissəsində buyurulan üçüncü qayda mehriban yaşamaqdır; yəni bir-birinizlə mehriban olun, ürəklər bir olsun, söz birliyiniz olsun, aranızda ixtilaf və ayrılıq olmasın. O, bu cümləni buyurarkən

Peyğəmbərin (s) sözündən bir məsəl də çəkir. Bəlli olur ki, bu məsələ üzərində xüsusi təkidi var və ondan qorxur. Bu o demək deyil ki, insanların mehribanlığı işin nizam-intizamlı olmasından daha əhəmiyyətlidir, əslində bu cəhətdən təhdidin daha güclü olduğuna görədir. Ona görə Peyğəmbərdən (s) belə bir sitat gətirir: Sizin babanızdan belə bir söz eşitmişəm: İnsanlar arasında mehribanlıq hər bir namaz və orucdan yaxşıdır. Demir ki, bütün namaz və oruclardan yaxşıdır; buyurur ki, hər bir namaz və orucdan yaxşıdır. Siz öz namaz və orucunuzla məşğul olmaq istəyirsiniz, amma fəziləti bunların hər ikisindən çox olan bir iş var. O nədir? O, insanlar arasında mehribanlıq yaratmaqdır. Əgər İslam ümməti arasında ixtilaf və ayrılığın olduğunu görsəniz, gedib .onu düzəldin. Bu, namaz və orucdan daha dəyərlidir

### Əmirəlmömininin (ə) vəsiyyətində yetimə nəvazişin əhəmiyyəti

Bu cümlədən sonra qısa, dərin və yanıqlı sözlərlə buyurdu ki, yetimlərin qayğısına qalın, onları heç zaman unutmayın. Bu çox mühüm məsələdir. Görün bu insanşünas, allahşünas, psixoloq və xeyirxah insan necə xırdalıqları görür! Bəli, yetimlərin qayğısına qalmaq yalnız fərdi və adi duyğusal mərhəmət deyil. Həyatın ən zəruri ehtiyaclarından biri olan atasını əldən vermiş uşağın uyğun ehtiyacını hansısa bir yolla təmin etməlisiniz. Bunu təmin etmək mümkün olmasa da, atasını itirmiş gəncin, yeniyetmənin və uşağın əldən çıxmasına imkan verməməlisiniz. Yetimlərin qayğısına qalın, onları ac qoymayın! Yəni belə olmasın ki, onlar hərdən yeməyə bir şey tapsınlar, hərdən yox. Onların məişət məsələsi ilə maraqlanın. Siz ola-ola onlar tələf olmasınlar, yaddan çıxmasınlar. Əgər siz olmasanız, xəbərsiz olsanız, heç, amma siz ola-ola heç bir yetim diqqətdən kənarda qalmasın. Məbada hər kəs öz işinin ardınca getsin və .yetim uşaq yalqız qalsın

### Qonşuların hüququ

Sonra buyurur ki, qonşularınızın qayğısına qalın, bu məsələni kiçik saymayın. Bu, çox mühüm məsələdir, böyük bir ictimai rabitədir. İslam dini insanların fitrətinə uyğun olan bu məsələyə böyük diqqət ayırmışdır. İnsan fitrətindən uzaq olan sivilizasiyalarda isə bu dəyərlər itmişdir. Biri bir neçə il bir evdə yaşayır, amma qonşusunun kim olduğunu və necə yaşadığını bilmir. Problem və müsibətlər zamanı insanların ehtiyacları ilə kim

!?maraqlanmalıdır

Qonşularınızla maraqlanın. Burada məqsəd yalnız iqtisadi və maddi cəhət deyil. Sözsüz ki, bu da mühüm məsələdir, amma məqsəd bütün insani cəhətlərdir. O zaman cəmiyyətdə necə ülfətin yarandığını və çarəsiz dərdlərin

necə sağaldığını görəcəksiniz. Sonra buyurur: Bu, peyğəmbərinizin (s) vəsiyyətidir. O, .qonşuları o qədər tapşırırdı ki, biz qonşu üçün də irsin təyin olunacağını düşünürdük

### Quranı dərk və ona əməl etmək

Sonra buyurdu ki, Quranı sizə tapşırıram; digərləri, Qurana etiqadı olmayanlar ona əməl etməkdə sizdən önə keçməsinlər və siz ona etiqadlı olduğunuz halda əməl etməyib geridə qalmayın. Bu hal indi yaranmışdır. Dünyada öndə gedənlər yorulmazlıqla, müntəzəm fəaliyyətlə, yaxşı çalışmaqla və Allah-Taalanın sevdiyi digər .xüsusiyyətlərlə önə keçdilər, fəsadları, şərabları və zülmləri ilə yox

Mən dəfələrlə demişəm: Əgər dünyada elmi inkişaf etdirən bu Qərb ölkələrində bəzi yaxşı xüsusiyyətlər olmasaydı, bu inkişaflara nail olmazdılar və başqalarına etdikləri zülm onları məhv edərdi. Yaxşı xüsusiyyətlər onların qalıb inkişaf etmələrinə bais oldu. Biz o xüsusiyyətləri tərk etmişik. Onlar işlərdə davamlıdırlar, vaxta qiymət verirlər, istehsal etdikləri məhsula əhəmiyyətli yanaşırlar. Əgər bizim fəhləmiz, tələbəmiz, müəllimimiz, ruhanimiz, tacirimiz, əkinçimiz və digər təbəqələrimiz bu müsbət və yaxşı xüsusiyyətlərə yiyələnsələr, ölkə birdən-birə gülüstana çevrilər. Biz yaxşı və müsbət xüsusiyyətlərə yiyələnməliyik və bu, Qurana əməl etmək deməkdir. Buyurur: Digərləri Qurana əməl etməkdə sizdən önə keçməsinlər. Bu o demək deyil ki, Əmirəlmöminin (ə) kiminsə Qurana əməl etməsini istəmir. Əgər bütün dünya Qurana əməl etsə, o həzrət daha çox sevinər. Deyir məbada Qurana etiqadı olmayanlar ona əməl edərək sizə hakim olsunlar, önə keçsinlər, siz isə geridə qalasınız. Davamında buyurur: Namazdan ehtiyatlı olun. Həqiqətən o, dininizin sütunudur. Allahın evindən ehtiyatlı olun. Nə qədər ki, varsınız, onun boşalmasına qoymayın. Əgər o boşalsa, sizə möhlət .verilməyəcək (yaxud yaşamaq imkanınız əldən çıxacaq

### Allah yolunda malla, canla və dillə cihad etmək

Allah yolunda malla, canla və dillə cihad etməyi sizə vəsiyyət edirəm. Bu işi tərk etməyin. Bu həmin cihaddır ki, İslam ümməti onu etdiyi zaman dünyanın nümunəvi xalqı idi, əldən verəndən sonra isə xar oldu. Məsihi yazıçılar İncil kitablarında Məsihin dilindən belə yazmışlar: Əgər bir üzünə sillə vursalar, o birini gətir; Biz əsla müharibə tərəfdarı deyilik, mütləq şəkildə barış və mehribanlıq tərəfdarıyıq. Bu onların şüarıdır.

Hələ də deyirlər. Hələ də utanmadan müsəlmanları məzəmmət edirlər ki, siz cihad, müharibə və xəncər

tərəfdarısınız. Bunu o qədər dedilər ki, axırda müsəlmanlar utandılar; müsəlman yazıçı və alimlər dedilər ki, bizdə cihad yoxdur, bizim cihadımız əslində müdafiədir. Allah-Taala deyir ki, cihad et, müsəlman alim isə deyir ki, cihad müdafiədir. Allah buyurur: Ey iman gətirənlər! Kafirlərlə bir yerə toplaşdıqları vaxt rastlaşsanız, dönüb onlardan qaçmayın!(١) Onlara arxa çevrməyin, onlarla vuruşun: Ey iman gətirənlər! Yaxınlığınızda olan kafirlərlə vuruşun!(٢) Müsəlman yazıçı deyir ki, Allah yolunda cihad əslində cihad deyil, hücum deyil, müdafiədir. Bütün bunlar məsihilərin təbliğatının təsiridir. Sülh və barışdan o qədər danışdılar, o qədər Müharibə pisdir, döyüş pisdir, heç kimə hücum etməyin – dedilər ki, cihad tərəfdarı olan və cihadla izzətlənmiş müsəlmanları təcrid etdilər. Lakin sülh tərəfdarı olan o cənabların özləri harada imkan tapdılarsa, müsəlmanların günlərini qara etdilər. Bu gün Bosniya-Herseqovinada və işğal olunmuş Fələstinin Xəlil ər-Rəhman məscidində müsəlmanları qırmaqda olanlar Amerika və Avropadan gələnlərdir. Həmin avropalılar, amerikalılar və qərblilər bir ömür müsəlmanlara dedilər ki, siz cihad tərəfdarısınız və cihad pisdir. Eyni zamanda xaç yürüşlərindən bu yana məsihilər bir formada, o birilər də başqa formada .bacardıqları qədər müsəlmanlara qarşı mübarizə apardılar, vuruşdular və öldürdülər

Bu hadisələri biz burada deməli deyilik. Xülasə, qəribə hadisələrdir. Tarixi oxuyan və bilən şəxs belə hadisələrdən ötrü qan ağlayar; həm edilən zülmlərə görə, həm də ikiüzlülüklərə görə. Sülhdən bu qədər dəm vururlar, eyni zamanda bu qədər gizli və .aşkar xəncərləri var

Sözsüz ki, müəyyən həddi-hüdudu olan İslam cihadı isə zülm deyil. Cihadda insanların hüquqlarına zülm və təcavüz yoxdur. Cihadda yeri gəldi-gəlmədi onu-bunu öldürmək yoxdur. Cihadda müsəlman olmayan hər bir kəsi öldürmək yoxdur. Cihad – Allahın çox .möhtəşəm bir hökmüdür. Əgər cihad olsa, xalqlar başıuca olarlar

Sonra buyurur ki, bir-birinizlə əlaqəniz olsun, bir-birinizə kömək edin, əl tutun, bir-birinizə arxa çevirməyin, əlaqələrinizi kəsməyin. Buyurur ki, yaxşı işlərə dəvət etmək və pis işlərdən çəkindirmək əməlini heç vaxt tərk etməyin. Əgər tərk etsəniz, yaxşı işlərə dəvət edən və pis işlərdən çəkindirən olmasa, pislər iş başına gələr, hakim olarlar. Əgər insanlar pisləri və pislikləri məzəmmət etməyə adət etməsələr, pislər hakimiyyətə gələrlər. Sonra siz yaxşılar İlahi! Bizi bu pislərin şərindən qoru! – deyə dua

.edərsiniz, amma duanız qəbul olunmaz



---

۱- [۴۹] Ənfal/۱۵.

۲- [۵۰] Tövbə/۱۲۳.

Əmirəlmöminin (ə) bu vəsiyyətində təxminən iyirmi ən mühüm mövzunu bəyan etmişdir. Sonra da əsaslı və həssas bi məsələyə toxunur. O əsas məsələ nədir? İntiqam almaq məsələsidir. Buyurdu ki, ey Əbdülmüttəlib övladları! Ey özlərini qisas sahibi bilən qohumlarım! Məndən sonra onun-bunun canına düşməyin, möminlərin əmiri öldürülüb deyə, kiminlə haqq-hesabınız varsa, ortaya atıb insanları məhv etməyə çalışmayın. Əgər ölsəm, məndən sonra yalnız qatilimi öldürün. Əgər bu yaradan dünyamı dəyişsəm, ona yalnız bir zərbə vurub qisas alın; bir zərbəyə qarşı .yalnız bir zərbə

Bədbəxt və xəbis İbn Mülcəmin üstünə düşüb, onu tikə-tikə etmək qorxusu vardı. Buna görə allahşünas, Allahı axtaran və diqqətli insan olan Əmirəlmöminin (ə) camaatın qəzəb və qisas hissi ilə düşməni parçalamasından ehtiyatlanıb buyurdu: Onun bədən üzvlərini kəsməyin. Mən Allah Rəsulunun belə dediyini eşitmişəm: Hətta !quduz iti də parçalamayın

Bu, Əmirəlmömininin (ə) son vəsiyyətidir və onun müraciət tərəfi bizik. Biz bu .vəsiyyətə əməl etməliyik

.Tehranın cümə namazı xütbələrindən: ۱۹۹۴

səh:۵۹

Fitr bayramı münasibəti ilə namazda iştirak edən siz əzizlərin hamısını, böyük İran xalqını və bütün dünya müsəlmanlarını təbrik edirəm. Bu, çox əzəmətli gündüz və gecələrdən sonra gələn böyük bir gündür. Əmirəlmöminin (ə) fitr bayramı namazının xütbələrinin birində belə buyurdu: Ey insanlar! Bu gün saleh adamların Allahdan mükafat aldıqları gündür. Bu gün saleh insanlar Allah-Taaladan ramazan ayının orucunun, ibadətlərinin, imsaklarının və nəfsə qarşı müqavimətlərinin mükafatını alır, yanlış əməlli insanlar isə pis işlərinin zərərini görürlər. Bu gün cəza günüdür. Bu gün qiyamət gününə ən çox bənzəyən gündür. Bayram namazı qılmaq üçün evinizdən çıxdığınızda Rəbbinizə sarı getmək üçün qəbirlərdən çıxacağınız günü yada salın; namazda ayaq üstə durduğunuzda (qiyamət günü) Rəbbinizin önündə duruşunuzu yada salın; (namazdan sonra) evinizə qayıdarkən (qiyamət günü) cənnətdəki mənzillərinizə qayıtmanızı yada salın.

Sonra buyurdu ki, ey Allahın bəndələri! Ramazan ayının sonunda Allah-Taalanın oruc tutanlara verəcəyi ən az mükafat budur: Ramazan ayının son günündə bir mələk onları çağırıb deyir: Müjdə! Ey Allahın bəndələri! Allah sizin günahlarınızı bağışlamışdır.

Bu, Ramazan ayının mükafatıdır. Əziz Ramazan ayının son saat və dəqiqələrində bir düzgün oruca, bir dərin məzmunlu əmələ və bir ixlaslı ibadətə belə mükafat verilir: Allah sizin günahlarınızı bağışlamışdır. Günahların bağışlanması kiçik mükafat deyil. Görün bu gündən başlayan yeni dönəmə necə başlayırsınız! Məbada fikirləşib öz-özünüzə deyəsiniz ki, günah edək, gələn ramazan ayında yenə bağışlanarıq. Heç kim gələn ramazan ayına qədər sağ qalacağını deyə bilməz. Ötən il bu yerdə və bu bayram namazında olanların bəzisi bu il burada deyillər. Gələn il də bizim hansımızın olub-olmayacağı məlum deyil. Bundan əlavə, cəsarətlə və qəsdən edilən günah insanın qəlbini qaraldır. Belə bir insan daha asanlıqla ixlaslı ibadət eləyə bilməz ki, onun hesabına günahları da bağışlansın. Günahlardan çəkinməyə və saleh işlər görməyə çalışın və çalışaq. İnsanı xoşbəxt edən budur.

۱۹۹۴: Fitr bayramı namazının xütbələrindən.

səh:۶۰

Bu gün fitr bayramı münasibəti ilə və Əmirəlmömininin (ə) nurlu kəlamlarından sonra bir əxlaqi məsələ haqda qısaca danışmaq istəyirəm. İmam Səccad (ə) Səhifeyi-Səccadiyyənin sübh namazı ilə onun nafiləsi arasında oxunan duanın sonunda Allah-Taaladan altı istək diləyir. Deyir ki, İlahi, mənə kamil ağıl, güclü iradə, dərin məzmun – mən bu üçüncü istək üzərində dayanacağam – təmiz qəlb, çoxlu elm, gözəl və parlaq .ədəb-ərkan bəxş et

Üçüncü istək dərin məzmundur. Bunun mənası odur ki, işimin məğzi və məzmunu onun zahirindən və formasından çox olsun. Görün İmam Səccad (ə) Allahdan nə istəyir! Mən siz möminlərə, böyük İran xalqına, qəlbləri iman nuru ilə işıqlanmış, öz sözləri və əməlləri ilə bir dünyanı işıqlandırmış insanlara bunu təkrarlamaq istəyirəm: !dərin məzmun

İnsanlar iki qisimdir: Bir qisim insanların nəyi varsa, zahirindədir; zahiri gözəl, gözoxşayan və bəzən heyranedici, daxili isə boş və puçdur, içində heç bir şey yoxdur. Bu, böyük işlər görmək istəyən ən pis insan qismidir. Bundan Allaha sığınırıq! Başqa bir qisim isə daxili zahirindən üstün olandır; zahiri necədirsə, daxili daha yaxşı və daha .dərindir. İmam Səccad (ə) bizə öyrədir ki, Allahdan belə insan olmağı istəyək

Bilirik ki, dualar yalnız Allahdan istəmək deyil, onlarda bizim üçün dərslər də vardır. Riyakarlıq, puçluq və məzmunsuzluq birinci qisim insanlara məxsusdur. Belə bir insan nə müharibədə işə yarayır, nə çətinlikdə köməyi toxunur, nə ağır vəzifələri qəbul edə bilir. Nəyi varsa, yalnız zahirindədir. İslam tərbiyəsi isə belə deyil. İslam tərbiyəsi deyir ki, zahirini qorumalısan, amma daxilin zahirindən yaxşı olmalıdır. Kimsə düşünməsin ki, zahir necə olur-olsun, əsas daxildir. Bəli, əsas daxildir, amma zahir daxilin göstəricisi olmalıdır: Zahir daxilin sərlövhəsidir. Zahiri də düzəltmək lazımdır. Heç kəs zahirdə yanlış işlərə təmayül nümayiş etdirməməlidir. Bir insanın zahirində və simasında Allaha ibadət əlamətləri görünsə, çox yaxşı təsir buraxar. Lakin eyni zamanda daxil zahirdən .daha yaxşı və daha ağır olmalıdır

.Fitr bayramı namazının xütbələrindən: ۱۹۹۴

### Səadət və mənəviyyat qazanmaqda ramazan ayının dəyəri

Hikmətli Allah Öz kitabında buyurmuşdur: İnsanlara doğru yolu göstərən, bu yolu açıq dəlilləri ilə aydınlaşdıran və (haqqı batildən) ayıran (Quran) ramazan ayında nazil (edilmişdir.(١)

Namazda iştirak edən bütün əziz qardaş və bacıları bu gündən və bu aydan istifadə etməyə çağırıram. Biz bu bərəkətli günlərə, faydalı saatlara, gündüzlərə, gecələrə və dəqiqələrə həqiqətən açıq gözlə və işıqlı qəlblə baxsaq, öz səadətimiz, mənəviyyatımız, gələcəyimiz və dünyamız üçün onların dəyərini biləcəyik. Çünki bu günlərə və saatlara hər şeyin sahibi və bütün məxluqların yaradanı olan Allah şərafət və dəyər bəxş etmiş, bu saatlardan, gündüz və gecələrdən istifadə etməmizə icazə .verməsi və hidayəti ilə bizə şərəf vermişdir

Bu dəyərli saatlarda toplanan ən yaxşı ehtiyat Allah-Taala ilə ünsiyyət, Ona üz tutmaq, könül vermək, Ondan istəmək və Onunla danışmaqdır. Bu günlərdə və bu ayda Allahdan istədiyiniz ən əziz şey təqva olsun: İlahi! Məni təqvanla xoşbəxt et, günahla bədbəxt etmə! Səadət təqvadadır; dünya təqvadadır; axirət təqvadadır; zəfər və qələbə təqvadadır; bütün işlərin uğuru və ilahi qurtuluş təqvadadır. Onda Allahdan bizə təqvalı qəlb verməsini istəyək. Yəni bizim qəlbimizin nəfsin istəklərinə cəzb olunmasının, dünyəvi, maddi və şəxsi maraqların bizi özünə sarı çəkməsinin yerinə Allahın iradəsi bizi cəzb etsin, Onun məhəbbəti bizi özünə çəksin və bu, bizim bütün !işlərimizə nur saçsın

### Ramazan İmam Səccadın (ə) baxışında

Ramazan ayı haqda Səhifeyi-Səccadiyyənin həmin aya aid olan qırx dördüncü duasından bir neçə cümlə seçmişəm. İndi həmin cümlələri sizə tərcümə edəcəyəm. Amma öncə xahiş edirəm mənim əzizlərim, xüsusən də gənclər Səhifeyi-Səccadiyyə ilə ünsiyyət qursunlar. Çünki zahirən duaya aid olan bu kitabda əslində hər şey vardır. İmam Səccad (ə) Səhifeyi-Səccadiyyənin digər duaları kimi bu duada da Allahla danışır və Ondan diləyir, amma danışması sanki məntiqi bir formul, iddia və dəlilin, nəticə və səbəbin ardıcıl düzülüşüdür. Mənim diqqət yetirdiyim qədərincə, Səhifeyi-Səccadiyyənin əksər duaları belədir; hər şey sıra ilə düzülmüşdür. Sanki bir nəfər bir

dinləyici önündə oturub məntiqlə danışır. Səhifeyi-Səccadiyyədə mövcud olan aşiqanə .nalələr də eynilə belədir

Burada da elədir. İmam sözügedən duanın əvvəlində deyir: Allaha şükür olsun ki... bizi şükür edənlərdən etdi. Biz Allahın nemətlərini unutmur və Ona



---

.Bəqərə/۱۸۵ [۵۱] -۱

şükür edirik. O, şükrünə çatmaq üçün bizim önümüzdə yollar açmış və bizi bu yollarla .getməyə vadar etmişdir

### Ramazan – Allah ayı

Sonra belə deyir: Allaha şükür olsun ki, Öz ayı olan ramazan ayını bu yollardan biri etmişdir.(١) Allaha şükür olsun ki, bizi Ona, kamilliyə və əzəmət mənbəyinə qarşı ayıqlığa qovuşduran yollardan biri bu ramazan ayıdır. İmam burada Öz ayı sözünü işlətmişdir. Allah ayını bu yollardan biri etmişdir. Bu çox mənalıdır. Bəllidir ki, bütün aylar Allah ayı və Allaha məxsusdur. Lakin bütün varlıq aləminin sahibi onun bir hissəsini ayırıb Özünə aid etdikdə, bu hissəyə xüsusi əhəmiyyət göstərdiyi bəlli olur. Bu hissələrdən biri bu Allah ayıdır. Ramazan ayının fəziləti üçün bu nisbətin özü yetər. Ramazan ayı – oruc ayı, İslam ayıdır.(٢) Bu ayın orucu mənəvi paklıq üçün çox təsirli .vasitələrdən biridir. Çünki onda aclıq, nəfslə və istəklərlə mübarizə var

### Ramazan – İslam ayı

İslam ayı – Allah qarşısında təslimçilik ayı deməkdir. Gənc bir insan oruc tutanda acır, susayır, bütün instinktləri onu bir istəyə sarı çağırır, o isə bütün bunların qarşısında dayanır. Nə üçün? Allahın əmrini yerinə yetirməkdən ötrü. Bu, Allah qarşısında təslimçilikdir. Bir müsəlman ilin digər günlərində heç vaxt adi formada Allah qarşısında .bu qədər təslimçilik göstərmir. Deməli, İslam ayı təslimçilik ayı deməkdir

### Ramazan – paklayan ay

İmam duanın davamında buyurur: (Ramazan ayı) paklayan aydır. Bu ayda bizim ruhumuzu paklayan amillər mövcuddur. O amillər hansılardır? Biri orucdur, biri Quran oxumaqdır, biri dua və yalvarışdır. Bütün bu dualar Allah-Taalanın Özünün bu biraylıq ziyafətində xalq üçün açdığı ilahi süfrələrin pak və gözəl nemətləridir. İmamın sözünün .məzmunu budur ki, Allah bu ziyafətdə sizə oruc təklif edir

Oruc Allahın bir süfrəsidir. Quran da bu böyük ziyafətdə süfrələrdən daha birisi sayılır. Bu süfrələrdən bacardıqca istifadə edin. O zaman mənəvi təməlləriniz güclənəcək, kamilliyə və yüksəlişə doğru hərəkətin ağır yüklərini daha asanlıqla çəkməyi .bacaracaqsınız. O zaman xoşbəxtlik sizə daha yaxın olacaq

Sonra buyurur: (Ramazan ayı) saflaşma ayıdır. Məqsəd budur ki, bu ayda saflaşıb xalis olaq.

Mənim əzizlərim! Sizin vücudunuzda qiymətli qızıl vardır. Ancaq təəssüf ki, bu qızıl çox zaman torpaqla, mislə, ucuz metallarla qarışır. Sizin daxilinizdə ot-ələf basmış bir xəzinə vardır. Allahın peyğəmbərlərinin bütün zəhməti mənim və sizin həmin qızılı – qiymətli elementi saflaşdırmamız üçün idi. Dünyanın imtahan və çətinlikləri bundan ötrüdür. Allah-Taalanın bəzi şəxslərə təyin etdiyi ağır vəzifələr bundan ötrüdür. Allah yolunda cihad bundan ötrüdür. Allah üçün bu qədər dəyərli olan şəhidin bütün dəyəri ondan ötrüdür ki, böyük fədakarlıq göstərib canını qurban verməklə özünü saflaşdıra bilmişdir; saflaşdırılmış xalis qızıl kimi.

Bu ay saflaşma ayıdır. Əgər diqqətlə baxsaq, görərik ki, bu ayda saflaşmaq digər üsullarla saflaşmaqdan asandır. Biz oruc tutmaqla və nəfsimizlə mübarizə aparmaqla özümüzü saflaşdıra bilərik. Mövcud sapqınlıqların əksəri ya etdiyimiz günahlara, ya da daxilimizdə olan pis xislətlərə görədir: Allahın ayələrini yalan hesab edib onları məsxərəyə qoymaqla pislik edənlərin aqibəti sonra lap pis oldu!(١) Günahın sonu sapqınlıqdır; insanın qəlbində tövbə işığı yandıqda isə heç. Bizə həmişə demişlər ki, bir günah edən kimi onun ardınca tez tövbə edin, günahı təkrarladığınıza görə peşman olun və bir də günah etməməyə qərar verin. Bu ondan ötrüdür ki, günah bataqlığında qərq olmaq təhlükəli işdir və bəzən insan elə bir həddə çatır ki, daha geriyə yol qalmır.

Biri sapqınlığa bais olan günah, biri də xoşagəlməz xarakterlərdir. Çirkin xislətlər insanı günahlardan daha çox sapqınlığa çəkir. Əgər biz hər bir işdə, sözdə və düşüncədə xudpərəst və eqoist olsaq, bir-birimizi pisləsək, yalnız mən düzgün düşünür və düzgün edirəm – deyə heç bir məsləhətə, dəlilə və məntiqə fikir verməsək, heç bir haqq sözü dinləməsək, vücudumuzda paxıllıq kök salsa, bu səbəbdən gözəli çirkin görsək, parlaq həqiqəti təsdiqləməkdən boyun qaçırsaq, şan-şöhrət, vəzifə və var-dövlət sevgisi haqqı qəbul etməmizə mane olsa, onda təhlükəli və azdırıcı xislətlərə düçar olmuş sayılacağıq.

Doğru yoldan uzaqlaşdığını gördüyünüz adamların əksəri bu vasitələrlə yoldan

çıxıblar; çünki hər kəs pak fitrətlə doğulur.(۲) Bütün ruhlarda paklıq və hamının haqqı görən vicdanı olur, amma bu işıqlı və parlaq bulağı nəfslə, bəzisi irsi olan, bəzisi isə .sonradan qazanılan pis xislətlərlə bulaşdırırlar



---

.Rum/۱۰ [۵۴] -۱

.Əl-Kafi, c. ۲, səh: ۱۳ [۵۵] -۲

## İnadkarlıq – insan sapqınlığının amili

Bu gün bəşəri elmlərdən biri sayılan əxlaq elminin alim və mütəxəssisləri – mənim və sizin üçün dəyərli olan əməli əxlaqdır, amma nəzəri əxlaqda ixtisaslaşmış şəxslər də var – deyirlər ki, insan irsi xarakterlərini də dəyişdirib əvəzləyə bilər; məsələn, irsi tənbəlliyi, tamahkarlığı, xəsisliyi, paxıllığı və inadkarlığı dəyişmək mümkündür. Bəzi adamlar inadkardırlar; həqiqəti necə aydın göstərirsənsə-göstər, öz mövqelərində inadkarlıqla dayanırlar. Bu hal insanı həqiqətdən uzaqlaşdırır. İnadkar insan əvvəldə həqiqətin işığını bir qədər anlayır və inadkarlıq etdiyini hiss edir. İnadkarlığı təkrar olduqda isə daha həqiqətin azca işığını da görmür, onda yalançı etiqad və düşüncə yaranır. Bu zaman özünə gəlib dərindən düşünəndə zehninədkinin düşüncə olmadığını, ürəkdən və candan gəlmədiyini görür, amma inadkarlıq onun həqiqət meləyini, mənəviyat və haqq mesajını dinləməsinə qoymur. Bəzi şəxslərin İslam, İslam inqilabı, imamın buyruqları, İran xalqının aydın və məzlum haqlılığı qarşısında dayanıb .inadkarlıq etdiklərini və bu inadkarlığın onların azğınlığı ilə nəticələndiyini gördünüz

## İran xalqının məzlumluğu

Doğrudan, İran xalqı necə də məzlumdur! Ey möminlərin əmiri! Ey Əli ibn Əbu Talib! Ey tarixin ən qüdrətli və ən məzlum insanı! Bu gün dünyada sənin ardıcıllarından, sənin özün kimi ən qüdrətli və ən məzlum olan bir xalq yaşayır. İran xalqı bu gün ən güclü xalqdır. Aydın bir hesablama ilə dünyada heç bir xalqın bu qədər güclü olmadığını bilmək olar. O hesablama budur ki, elmi, iqtisadi və sənaye qüdrətlərinə, işdə müntəzəmlik kimi bəzi yaxşı xüsusiyyətlərinə rəğmən, dünya xalqlarının nəfsi istəklərinin önündə düz-əməlli hasar və maneə yoxdur. İran xalqı isə dinə və təqvaya sarılmanın sayəsində nəfsin istəklərini özündən uzaqlaşdırmışdır. Bu xalqın gənci digər xalqlarda heç bir gəncin göz yummadığı ləzzətlərdən üz çevirir. Dünyanın harasında belə gənclər tanıyırsınız? Ey dünyanın insaflı adamları və inadkarlıq etməyənlər! Sizi Allaha and verirəm, bu suala cavab verin: Siz dünyanın harasında sağlam və qüvvətli gəncin onun üçün mümkün olan haram ehtiraslardan çəkindiyini, adi ləzzətlərə göz yumduğunu eşitmisiniz? Bu gün İran gənclərinin bir nəfəri, iki nəfəri, yüz nəfəri, min nəfəri yox, böyük bir qismi belədir. Düzdür, şəhvətpərəst və pis gənclərimiz də var. Onlar da dünyanın digər gəncləri kimi yaşayırlar. Amma İranın hər yerində olan

mömin, təqvalı, Allahdan qorxan, ibadətçi və sağlam gənc təbəqə dünyanın daha hansı yerində var?!

Bizim xalqımız belə qüdrətli ola-ola həm də məzlumdur. Çoxları bu xalqın məzlumluq mesajını eşitmədi, inadkarlıq üzündən onun haqq sözünü dinləmək istəmədi. Şübhəsiz ki, inadkarlıq azğınlıq gətirir. Və siz bilin ki, böyük və əsaslı çirkin xislətlər kiçik .məsələlərdən başlayır

**Ramazan – xatırlama və diqqət yolu ilə səhvləri düzəltmə imkanı**

Ramazan ayında xatırlama və diqqət yolu ilə xoşagəlməz əməlləri düzəltmək mümkündür. Əbu Həmzə Sumali duasında çox təsirli bir hissə var. Dua edən deyir ki, ey mənim Allahım! Mən Sənə ümidi Səndən qeyrisinə ümidə tərcih etdim, digərlərinə sığınmağı Sənə sığınmaqla əvəzlədim və mən Sənə doğru gedən yolun yaxın olduğunu (biliram...(١

Haradasınızsa, kimsinizsə, hansı libasdasınızsa, hansı yaşdasınızsa... Ey gənc! Ey gənc oğlan və qız! Ey ortayaşlı kişi və qadın! Ey qoca kişi və qadınlar! Ey yoxsullar! Ey varlılar! Ey alimlər! Ey orta savadlılar! Kimsinizsə, hər bir sağlam insan kimi siz də Allaha ehtiyac duyursunuzsa, bilin ki, Allah yaxındır. Bir an qəlbinizi Allaha yönəldin, cavabı eşidəcəksiniz. Mümkün deyil bir şəxs Allahla ürəkdən danışsın, amma cavab eşitməsin. Allah bizə cavab verir. Əgər birdən-birə qəlbiniz döndüsə, bu, Allahın cavabıdır. Göz yaşınız axdısa, qəlbiniz titrədisə, istək sizin bütün vücudunuzdan səsləndisə, bilin ki, bu, Allahın cavabıdır. Bu, Allahın sözügedən cavabıdır və sonrakı cavab istəyin həyata keçməsidir. Quranda buyurub ki, Allahın lütfündən (mərhəmətindən) diləyin,(٢) Allahdan istəyin. İstəməyi tapşırmaq, amma onu verməmək Sənin xüsusiyyətlərindən deyil!(٣) Deyin, istəyin, məgər mümkündür ki, siz istəyəsiniz, Allah isə verməyə?! Əlbəttə, Allahdan istəməkdə zamanın və məkanın tələbləri və digər xüsusiyyətlər də .təsirlidir

Ramazan ayının qədrini bilin, öz xoşbəxtliyiniz üçün, təqvanız üçün, gələcəyiniz, övladlarınız üçün, bu böyük xalqın və böyük inqilabın inkişafı üçün, bu vəziyyətin iradəsinə, imanına, təqvasına və hərəkətinə borclu olduğu o böyük insanın ruhu üçün dua edin. Allah onun ruhunu yüksək ruhani aləmdə peyğəmbər və övliya ruhları ilə !yanaşı etsin

.Tehranın cümə namazı xütbələrindən: ١٩٩٥

Bir məsələ budur ki, duanın üç faydası vardır. Hər bir duada bu üç faydanın ikisi vardır; istər məsumlardan nəql olunan dualarda, istərsə də bir insanın özünün ehtiyac .üzündən Allaha etdiyi dualarda. Bunların hamısında iki fayda mütləq vardır

Bəzi dualarda bu iki faydadan əlavə çox mühüm olan üç məsələ də var. Bu üç məsələnin biri duanın ümumi məqsədindən ibarətdir – yəni Allah-Taaladan istəmək və almaq. Biz insanların çoxlu ehtiyaclarımız var, vücudumuz başdan-ayağa ehtiyac içindədir. Əgər öz vücudunuza diqqət yetirsəniz, görərsiniz ki, nəfəs almaqdan və yeməkdən tutmuş yol yeriməyə, qulaq asmağa və görməyə qədər hər bir şey biz insanların ehtiyacından xəbər verir. Yəni biz Allah-Taalanın verdiyi bir qrup imkanlarla yaşaya bilirik. Onların hamısı da Allahın iradəsi altındadır. Bu qüvvə və imkanların hər hansı birində qüsur yaransa, misal üçün, bir qan, yaxud sinir damarı işdən düşsə, bir əzələdə problem yaransa, insan öz həyatında əsaslı problemlə üzləşər. Nəhayət, insan vücudundan xaric olan məsələlərdə, yaxud psixoloji və ya ictimai məsələlərdə bəşər .başqan-ayağa ehtiyac içindədir

Bu problemlərin aradan qaldırılmasını və bu ehtiyacların təmin edilməsini kimdən istəməliyik? Bizim ehtiyaclarımızı bilən Allah-Taaladan: "Allahın lütfündən (mərhəmətindən) istəyin! Şübhəsiz ki, Allah hər şeyi biləndir".(١) Allah sizin nə istədiyinizi, sizə nəyin lazım olduğunu və ondan nəyi dilədiyinizi bilir. Buna görə Allahdan istəyin. Başqa bir yerdə buyurur: "Rəbbiniz buyurdu: "Məni çağırın, sizə cavab verim!"(٢) Əlbəttə, bu cavab vermək istəyi təmin etmək demək deyil. Deyir cavab verərəm və ləbbeyk deyərəm. Lakin Allahın bu cavabı çox zaman sizin istəyinizi verməklə yanaşı olur. Deməli, bu birinci məsələ: insanın ehtiyacları var və o bu ehtiyacların aradan qaldırılmasını Allahdan istəməli, Allahın qapısına getməli və .digərlərinə yalvarmağa ehtiyac duymamalıdır

Bu gün cümə günü, əziz Peyğəmbərin (s) və imamların sözlərini xatırlamaq günü olduğundan bir neçə qısa hədis oxumaq istəyirəm. Bir hədisdə deyilir ki, ən fəzilətli ibadət duadır.(٣) Digər hədis Peyğəmbərdəndir (s). O həzrət öz səhabələrinə belə buyurdu: "Sizi düşmənlərinizdən xilas edəcək və ruzilərinizi çoxaldacaq bir silah

göstərimmi?” Bu, ehtiyacları təmin etmək üçün



---

۱- [۵۹] Nisa/۳۲.

۲- [۶۰] Qafir/۶۰.

۳- [۶۱] nəql olunmuşdur (ə) Əl-Kafi, c. ۲, səh. ۴۶۶. Hədis İmam Baqirdən.

Allahdan istəməkdir. Səhabələr dedilər: Bəli, buyurun. Peyğəmbər (s) buyurdu: Gecə-gündüz Allaha dua edin.(١) Həqiqətən möminin silahı duadır!(٢)

Həzrət Səccaddan (ə) nəql olunan bir hədisdə deyilir ki, dua sizə gəlmiş və hələ gəlməmiş bəlaları uzaqlaşdırır.(٣) Yəni əgər dua etsəniz, o bəla sizə gəlməyəcək.

Çox mühüm məsələdir. Allah-Taala insana elə bir vasitə verib ki, o, müstəsna yerlərdən başqa öz istəklərini onunla təmin edə bilər. Bu vasitə nədir? Allah-Taaladan istəməkdir.

## Dua – ilahi xəzinələrin açarı

Əmirəlmömünindən (ə) bir kəlam nəql olunmuşdur. Rəvayətə əsasən, o buyurur: Allah-Taala Ondan istəmək icazəsi verməklə Özünün bütün xəzinələrinin açarını sənə tapşırmışdır. Deməli, Allah-Taalanın Ondan hər bir şeyi istəməyə dair verdiyi icazə bütün ilahi xəzinələrin açarıdır. Əgər insan bu açarı düzgün işlətsə - Allahdan istəsə, şübhəsiz, onu insanın ixtiyarında qoyar və onun vasitəsilə istədiyi zaman Allah xəzinələrinin qapılarını açar.(٤) Bu, çox mühüm məsələdir. Nə üçün insan özünü bu mühüm vasitədən məhrum etsin?!

Burada bir neçə sual ortaya çıxır: Biri budur ki, əgər duanın belə möcüzəli rolu varsa, bəs dünyəvi vasitələr, texnikalar, elm, sənaye və digər bu kimi amillər nə üçündür? Cavab budur ki, dua maddi vasitələrin rəqibi deyil. Belə deyil ki, insan səfərə çıxmaq istəyirsə, maşınla, qatarla, ya təyyarə ilə getməlidir, ya da dua ilə. Həmçinin belə deyil ki, insan bir şey istəyəndə ya pul verib onu almalıdır, ya da pulu yoxdursa, dua etməklə əldə etməlidir. Duanın mənası budur ki, siz Allahdan bu vasitələri yaratmasını istəyin; maddi səbəblərin hər biri isə öz yerində durur. Qəbul olunan dua belədir.

Bir hacətinizin təmin olunmasını istəyib, dua etdiyinizdə Allah-Taala o duanı qəbul etsə, deməli, bu istəyin maddi və adi vasitələrini hazırlayacaq; yəni necə deyərlər, Allah düzüb-qoşacaq. Misal üçün, bir şəxs sizə borcludur və borcunuzu qaytarmır. Lakin birdən ürəyinə düşür və gəlib borcunuzu qaytarır. Bu, bir vasitədir. Nə üçün dua insan üçün bu vasitəni hazırlaya bilməz?!

Dünyanın bütün vasitələri belədir. Buna əsasən, dua kiminsə tənbəllik etməsinə səbəb

,olmamalıdır. Dua kiminsə elmdən, bilikdən, maddi vasitələrdən

səh:۶۸

---

.Yenə orada, c. ۴, səh: ۳۰۲ [۶۲] -۱

.Yenə orada, c. ۲, səh: ۴۶۸ [۶۳] -۲

.Yenə orada [۶۴] -۳

.Bihar əl-ənvar, c. ۷۴, səh. ۲۰۴ [۶۵] -۴

təbii səbəb və nəticədən əl üzməsinə bais olmamalıdır. Xeyr, dua onların rəqibi deyil, .onlarla vertikal əlaqədə və onları təmin edəndir

Sözsüz ki, əksərən belədir. Bəzən Allah-Taala möcüzə də göstərir; bu başqa məsələdir. Möcüzə müstəsna hallarda baş verir. Ümumilikdə isə dua təbii prosesi təmin edir. Siz Allahdan ehtiyacınız olan bir işin baş verməsini istəyəndə duanın kənarında özünüz də çalışmalısınız. Misal üçün, siz tənbəlliyə tutulmuş və Allah-Taalanın onu sizdən uzaqlaşdırması üçün dua edirsinizsə, duanın yanında gərək iradə və əzmkarlıq da göstərəsiniz. Yəni burada da başqa bir təbii və maddi vasitə var və o, iradə göstərməkdir. Gərək iradə və əzmkarlıq göstərəsiniz. Heç kəs düşünməsin ki, evdə oturub heç bir iş görməsək, hətta iradə də etməsək və yalnız dua ilə məşğul olsaq, Allah bizim istəklərimizi təmin edəcək. Xeyr! Belə bir şey imkansızdır. Deməli, dua çalışmağın yanında və çalışmaqla birgə olmalıdır. Bəzən çalışmaq nəticə vermir, .amma dua edən kimi nəticə hasil olur. Bu bir məsələ

**Duanın qəbul olunmasının şərtləri**

Başqa bir mətləb budur ki, bəzən insan nə qədər dua edirsə, qəbul olunmur. Səbəb nədir? Dini rəvayətlər bu problemi həll etmişdir. Məsələn, rəvayətlərdə deyilmişdir ki, duanın şərtləri mövcud olmasa, qəbul olunmaz. Hər halda, duanın da şərtləri var. Din böyükləri buyurmuşlar ki, qeyri-mümkün işləri Allah-Taaladan istəməyin. Rəvayətdə göstərilir ki, bir gün əziz Peyğəmbərin (s) səhabələrindən biri onun yanında dua edib dedi: "İlahi, məni məxluqlarının heç birinə möhtac eləmə!" Peyğəmbər (s) buyurdu ki, belə demə, məgər bir insan heç kimə möhtac olmaya bilər?! Belə dua eləmə! Bu, bəşər təbiətinin, ilahi qanunun və Allahın insanda yaratdığı xislətlərin ziddinədir. Nə üçün deyirsən ki, məni heç kəsə möhtac eləmə? Bu dua qəbul olunmayacaq. O şəxs dedi ki, ey Allahın rəsulu, bəs necə dua edim? Buyurdu ki, belə de: "İlahi, məni pis bəndələrinə möhtac eləmə!"(١) Məni şər adamlara ehtiyaclı eləmə; məni səviyyəsiz insanlara möhtac eləmə. Bu mümkündür, Allahdan bunu istə. Deməli, Allah-Taaladan qeyri-.mümkün və dünyanın normal qanunlarına zidd bir şey istəsək, qəbul olunmayacaq

Duanın qəbul olunmasının şərtlərindən biri də onu edəndə diqqətli olmaqdır. Bəzən dil "İlahi, bizi bağışla!", "İlahi, bizə ruzi ver!", "İlahi, bizim borcumuzu ödə!" kimi cümlələrə

vərdiş edir. İnsan on il belə dua edir, lakin qəbul olunmur. Bunun faydası yoxdur. Duanın şərtlərindən biri diqqətli olmaqdır. Allah-Taala buyurdu ki, nə istədiyinə və kiminlə danışdığına diqqət



---

۱- [۶۶] Bihar əl-ənvar, c. ۹۰, səh. ۳۲۵.

yetirməyən qafil ürək sahibinin duasını qəbul etməz.[١] Bəllidir ki, bu xüsusiyyətlərə malik olan dua qəbul olunmaz. Yalvarmaq və ciddi istəmək lazımdır. Allah-Taaladan .israrla diləyin, yenə diləyin. Bu zaman Allah-Taala, sözsüz ki, duaları qəbul edəcək

Dua barədə başqa bir mətləb budur ki, istəklərə çatmaq üçün heç bir istəyi o qədər böyük sayıb deməyək ki, daha bunu Allahdan istəmək olmaz, bu çox böyükdür. Xeyr, əgər istək yaranış qanunlarının və təbiətin ziddinə olmasa, qeyri-mümkün olmasa, nə qədər böyük olsa da, problemi yoxdur, Allah-Taaladan istəyin. Siz ramazan ayında hər gün namazdan sonra məsumdan nəql olunmuş bu duanı deyirsiniz: "İlahi, bütün yoxsulları varlandır!" Allahdan istəyirsiniz ki, bütün yoxsulları zənginləşdirsin. Təkcə İranın yoxsullarını yox, bütün müsəlman yoxsulları deyirsiniz. Bunlar çox əhəmiyyətlidir. Mən ikinci cəhət haqda danışanda bu mövzuya inşallah yenə də qayıdacağam. Bu böyük istəkdir. "İlahi, bütün yoxsulları zəngin et!" deyirsinizsə, bəli, Allahdan istəyirsiniz, nə üçün qəbul olunmasın? Əgər zənginləşməyin maneələri aradan qaldırılsa, nə üçün olmasın? Yoxsulluq məsələsi cəmiyyətdə zəruri bir məsələ deyil. Cəmiyyətdə yoxsulluq məcburən yaradılmış bir məsələdir. Yoxsulluğu dünyanın zülmkar, hegemon və tamahkar qüvvələri insanlara və xalqlara məcburən yaratmışlar. Əgər bu qüvvələr məhv olsalar, bu dua nə üçün qəbul olunmamalıdır? .Belə bir istəyin də qəbul olunması mümkündür

Bu duanın davamında deyirsiniz: "İlahi, bütün acları doyur! İlahi, bütün çılpaqları geyindir!"[٢] İnsan Allahdan bu qədər böyük hacət istəyir. Cümə gecəsinin müstəhəb olan çox qısa duası da yaxşı duadır. Əgər nəsib olsa, bu duanı mütləq oxuyun. Əvvəl Allahdan bəzi istəklər dilənir, sonra isə bu cümlələr gəlir: İlahi, bu böyük və nəhəng arzular, mühüm istəklər ümidsizliyə məhkumdur; Sənə deyiləndə isə belə olmur. Bizim .istək karvanlarımız dayanmağa məhkumdur; Sənin evinə sarı gələndə isə belə deyil

Allah insanın böyük diləklərindən qorxmur. Allahdan daha böyük istəklər diləyin. İnsan öz-özünə deməsin ki, mən bunu özüm üçün istəyirəm, bu mümkündür, lakin bütün insanlar üçün sağlamlıq istəmək çox böyükdür, bunu necə Allahdan istəyim? Xeyr, istəyin, bəşəriyyət üçün istəyin, bütün insanlar üçün istəyin, bəzi məsələləri bütün müsəlmanlar üçün istəyin. Həmin duada "İlahi, müsəlmanların işlərindəki bütün fəsadları düzəlt!"[٣] duası müsəlmanlara məxsusdur, İslam əhlinə aid olan bir duadır.

.Təbii ki, bunun da səbəbləri var



---

.(Bihar əl-ənvar, c. ۷۴, səh. ۱۲۵. Hədis Peyğəmbərdəndir (s [۶۷] -۱

.(Müstədrək əl-vəsail, c. ۷, səh. ۴۴۷. Hədis Peyğəmbərdəndir (s [۶۸] -۲

.(Müstədrək əl-vəsail, c. ۷, səh. ۴۴۷. Hədis Peyğəmbərdəndir (s [۶۹] -۳

Bəlkə də bu, müsəlmanlardan qeyrisi üçün mümkün deyil. Bəlkə də İslamın hakimiyyəti olmadan, Allah-Taalanın bütün fəsadları aradan qaldırması mümkün deyil, .ümumiyyətlə olmaz, bunun şərti İslamdır. Deməli, məsələnin bir tərəfi budur

Yeri gəlmişkən, istəyin kiçik olmasından da qorxmayın, ən kiçik istəkləri də Allahdan diləyin. Hədisdə göstərilir ki, hətta çox dəyərsiz bir şey olan ayaqqabı bağını da Allahdan istəyin. Bir hədisdə İmam Baqir (ə) buyurur: Kiçik istəkləri dəyərsiz saymayın. .Çünki Allah-Taala üçün ən sevimli mömin ən çox (dua edib) istəyəndir

Bəli, insanın ayaqqabı bağına ehtiyacı var. Mağazaya gedib alar, bunun üçün də dua lazımdırmı? Bəli, ayaqqabı bağına və belə kiçik olan hər hansı bir şeyə ehtiyac duyan kimi ürəyinizi Allaha yönəldin və deyin ki, İlahi, mənə bunu da yetir. Yetirməsi hansı yolladır? Yolu budur ki, cibimə pul qoyub küçənin başına gedim, mağazadan alım və sonra da istifadə edim. Hər halda, Allahdan istəməlisiniz. Mağazaya gedərək pul verib ayaqqabı bağı alsanız da, onu yenə Allah sizə vermişdir. Allahdan qeyrisinin vasitəsi ilə .insanın əlinə bir şey çatmır. Bizə nə çatırsa, Allah verir

Allahın verdiyini öncə Allahdan istəməliyik. Nə üçün istəməliyik? Kiçik istəkləri də Allahdan istəməyimizi tövsiyə etmələrinin səbəblərindən biri budur ki, öz ehtiyaclarımıza, acizliyimizə, kiçikliyimizə və yoxsulluğumuza diqqət yetirək, nə qədər yoxsul olduğumuzu görək. Əgər Allah-Taala kömək etməsə, imkan yaratmasa, güc verməsə, düşüncə verməsə, təşəbbüs verməsə və vasitələri hazırlamasa, həmin ayaqqabı bağını da tapmayacağıq. Əgər siz ayaqqabı bağını almaq məqsədilə evdən çıxsanız və yolda pullarınızı oğurlasalar, yaxud pulunuz itsə, yaxud istədiyiniz mağaza bağlı olsa, yaxud yolda hər hansı hadisə baş versə və siz qayıtmağa məcbur olsanız, ayaqqabı bağını əldə edə bilməyəcəksiniz. Buna əsasən, hər şeyi Allahdan istəyin. Hətta ayaqqabı bağını, hətta kiçik şeyləri və hətta özünüzün gündəlik ruzinizi də. Qoyun özünü çox böyük sanan bu yalançı “mən” sınsın. Biz "mən” deyəndə elə bilirik ki, bütün qüvvələr bizdə cəm olub. Bu “mən” insanları bədbəxt edir. Bu da duaya dair bir .mətləbdir: insan öz istəklərini dua ilə əldə etməlidir

İndi öz istəklərinizə, müsəlmanların istəklərinə, ölkənizin istəklərinə, mömin qardaşlarınızın istəklərinə, xəstələrə, xəstəsi olanlara, müsibət görənlərə, qəmgin

ürəklərə, nigaran gözlərə, sizin ətrafınızda, sizin ölkənizdə, İslam dünyasında və Yer kürəsində olan insanların ehtiyaclarına baxın, bu qədr gecələrində bütün bu hacətləri .bir-bir Allahdan istəyin

Duada mövcud olan ikinci məsələ bilgilərdir. Bu, məsumlardan bizə çatmış dualara məxsusdur. İmam Səccad (ə) Səhifeyi-Səccadiyyəni dua formasında tənzimləmiş və ümumiyyətlə dua etmişdir. Lakin bu kitab ilahi və dini bilgilərlərlə doludur. Səhifeyi-Səccadiyyədə xalis tövhid var. Səhifeyi-Səccadiyyədə İslam Peyğəmbərinin (s) müqəddəs məqamına eşq və nübüvvət var. Bu kitabda məsumlardan nəql olunmuş digər dualar kimi yaradılış bilgiləri var. Gecələrə məxsus olan Əbu Həmzə Sumali duası (onu oxumağa və mənaları üzərində diqqətlə düşünməyə çalışın) və cümə gecələri oxunan Kumeyl duası İslam bilgiləri ilə dolu olan dualardandır. Orada həqiqətlər dua dili ilə bəyan olunmuşdur. Belə deyil ki, İmam Səccad (ə) dua etmək istəməmiş və duanı vasitə seçmişdir. Xeyr, dua etmiş, münacat etmiş və Allahla danışmışdır, lakin qəlbi Allahla və ilahi bilgilərlə tanış olan insanın danışması belə olur, ondan hikmət .aşıb-daşdığından duası da başdan-ayağa hikmətdir

Bizim oxuduğumuz dualar hikmətlə doludur. İmamlardan bizə çatmış dualarda həqiqətən insanın ehtiyacı olan bilgilərə aid məqamlar var. Bu böyüklər bu məqamları .dualara salmaqla bizə Allahdan nə istəməyimizi öyrədirlər

Mən sizin üçün şərafətli Əbu Həmzə Sumali duasından bir neçə cümlə oxumaq istəyirəm. Bu uzun duada qəribə münücat halı vardır. Mən üçüncü hissədə bu barədə danışacağam. Lakin bu münacatların arasında insanların həqiqi ehtiyacları yatmışdır. O həzrət Allah-Taaladan onların həqiqi ehtiyaclarını istəyir. Məsələn, bir yerdə Qadir Allaha müraciətlə deyir: Həyatımı gözəl et! Həyatın gözəlliyi nə puldan, nə qızıldan, nə də güc və qüdrətdən asılıdır. Çünki bütün bunlara malik olan bir insanın həyatı gözəl olmaya da bilər. Həyatı gözəl olmağa qoymayan bir nigaranlığı ola bilər, ailə problemi, övladının problemi ola bilər – bundan Allaha pənah aparırıq - övladlarının birinin pis əxlaqı ola bilər, daha həyat onun üçün gözəl olmaz. İnsana pis bir xəbər çatar, həyat onun üçün acı və xoşagəlməz olar. Bu insanın həm pulu, həm gücü, həm geniş imkanları var - hər şeyi var, amma gözəl həyatı yoxdur. Çox sadə həyatı olan, kiçik bir daxmada ailəsi və uşaqları ilə yoxsul vəziyyətdə dolanan kasıb bir insanın həyatı, hər .şeyə malik olan bu sərvətli və qüdrətli şəxsin həyatından daha gözəl ola bilər

Görün həzrət Səccad (ə) necə mühüm bir nöqtəyə diqqət çəkir. Deyir: "Həyatımı gözəl et və alicənablığımı aşkarla!"(١) Güman ki, ikinci hissənin mənası budur: elə şərait yarat

ki, mən onda alicənablıq xüsusiyyətini aşkara çıxara bilim, nəinki xalq mənim alicənab olduğumu görsün. Çünki alicənablığın



---

.Yenə orada [۷۰] -۱

aşkara çıxmasını istəsək, gərək alicənablıq edək. Alicənablığın insanın daxilində olması kifayət etmir. İnsan alicənablığı əməl mərhələsinə çıxarmalı və kiməsə qarşı .alicənablıq etməlidir

Davamında buyurur: "Mənim bütün hallarımı və işlərimi düzəlt!" Mənim bütün işlərimi və hallarımı islah et! Mənim dua halımı düzəlt, mənim və ailəmin adi yaşayış vəziyyətini düzəlt, çalışdığım işin vəziyyətini düzəlt, mənim bütün xüsusiyyətlərimi islah et! Hər bir işin düzəlməsi, özünə görə kamil və hərtərəfli bir duadır. Sonra deyir ki, məni yaxşı əməllə, kamil ilahi nemətlə, Rəbbin razılığı ilə və gözəl həyatla uzun ömür sürən !?şəxslərdən et! Bundan yaxşı bir şey varmı

Məsumlar Allahdan nə istəməyi öyrədirlər. Allahdan istəməli olduğumuz onların dedikləridir. Bəzi insanlar dünyada maddiyyatın çoxluğunu düşünürlər. Deyirlər ki, filan ticarət işim düzəlsin, filan səfər düzəlsin, filan işə düzəlim və sair. Nə üçün insan əsas məsələləri Allahdan istəməsin? Din rəhbərləri bizə öyrədirlər ki, belə dua edin və belə .şeyləri Allahdan istəyin. Əlbəttə, onların bizə öyrətdiyi duaların növləri olduqca çoxdur

**İnsanın əməllərində zəif nöqtələr**

Başqa bir məsələ budur ki, onlar sözügedən duaların arasında mənəvi cəhətdən zəif nöqtələri bizə öyrədirlər, bu nöqtələrdən vurulub təhlükəyə düşə biləcəyimizi xatırladırlar. Şərafətli Əbu Həmzə duasında buyurur ki, İlahi, mənim tərəfimdən görülən işləri riyasız et, onun-bunun görməsi üçün olmasın, ağız-ağız gəzməsi üçün olmasın, camaatın "xəbəriniz var filankəs necə yaxşı iş gördü, necə yaxşı ibadət etdi?" deməsi üçün olmasın, lovğalıq və qürur üçün olmasın. Çünki insan bəzi işləri lovğalıq və qürur üzündən görür. Özü ilə öyünüb deyir ki, bəli, bu işi görən biz idik. Bunlar olmasın. Bunlar zəif nöqtələrdir. İnsan çoxlu işlər görür, lakin azca riya ilə o işləri hədər verir, tüstü kimi havaya sovurur. Məsumlar bizə xəbərdarlıq edib buyururlar ki, ehtiyatlı olun .belə olmasın

Deməli, ikinci məsələ budur ki, bu dualarda çoxlu bilgilər yatmışdır. Misal üçün, Kumeyl duasının əvvələrində hamımız belə oxuyuruq: "İlahi! Mənim həya pərdələrini yırtan günahlarımı bağışla! İlahi! Mənim əzab göndərən günahlarımı bağışla! İlahi! Mənim nemətləri dəyişdirən günahlarımı bağışla!" Pərdələri yırtan günahlar vardır, insana

Allah bəlasını endirən günahlar vardır, insanlardan nemətləri alan günahlar vardır. “İlahi! Mənim duanı həbs edən günahlarımı bağışla!”(۱) Elə günahlar da var ki, duanı .həbs edir



---

.Əl-Bələd əl-əmin, səh. ۱۸۸ [۷۱] -۱

Allaha sığınırıq. İnsan elə günaha düçar ola bilər ki, nə qədər dua etsə də, təsirsiz və .faydasız olar. Duanın təsirsiz olması haradan bilinir? Bu zaman dua halı insandan alınır

Bu barədə böyük bir şəxsiyyətdən bir söz nəql etmişlər. Hədisin məsum, yoxsa qeyri-məsum bir şəxsin sözü olmasını bilmirəm. İstənilən halda hikmətamiz bir ifadədir. Deyir ki, mən duanın qəbul olunmasından daha çox onun özünün məndən .alınmasından qorxuram

Bəzən dua halı insandan alınır. Bu, pis əlamətdir. Əgər dua zamanı, yalvarış zamanı, diqqət və yaxınlaşmaq zamanı duaya həvəs və hövsələmiz olmursa, bu, yaxşı əlamət deyil. Lakin onu düzəltmək olar. İnsan diqqətlə, ciddi şəkildə yalvarmaqla və istəməklə Allahdan dua halını ala bilər. Buna əsasən, Kumeyl duasında da bilgilərin olduğunu .gördük. Bu da ikinci məsələ

Duada üçüncü və sonuncu məsələ isə duanın əsas cəhətidir. O nədir? Rəbbin qarşısında kiçilmək. Duanın əsas cəhəti budur. Peyğəmbərin (s) belə buyurduğu nəql olunub: "Dua ibadətin məğzidir".(۱) Çünki duada Rəbbə mütləq bağlılıqdan və onun qarşısında kiçilməkdən ibarət olan bir vəziyyət var. İbadətin əsas cəhəti də budur. Məhz buna görə Rəbbiniz buyurdu: "Məni çağırın, sizə cavab verim! ayəsinin davamında buyurur: Mənə ibadət etməyi təkəbbürlərinə sığışdırmayanlar zəlil halda cəhənnəmə girəcəklər!(۲) Duanın əsas cəhəti budur ki, insan Allah-Taala qarşısında özünü yalançı bəşər qürurundan endirsin. Duanın əsas cəhəti Rəbbin qarşısında .kiçilməkdir

Mənim əzizlərim! Siz istər öz ətrafınızda, istər ölkənizdə, istər bütün dünyada olan pislik və fəsadlara diqqətlə baxdıqda o pisliyin və fəsadların kökünün və qaynağının mənəmlikdən, təkəbbürlülükdən, hegemonluqdan və insani qürurdan ibarət olduğunu .müşahidə edəcəksiniz. Dua bunu sındırmalıdır

.Tehranın cümə namazı xütbələrindən: ۱۹۹۵



---

.(Vəsail əş-Şiə, c. ۷, səh. ۲۷. Hədis Peyğəmbərdəndir (s [۷۲] -۱

## Fitr bayramı – mənəvi həyatın yenidən başlanması

Hər bir fitr bayramı ayıq müsəlman üçün həqiqi bir bayram ola bilər. Mənəvi və ruhi həyatın yenidən başlandığı gün olan fitr bayramı təbiət üçün bahar fəsli kimidir. İl boyu müxtəlif çirkab və günahlara bulaşmış, nəfsi, pis xüsusiyyət və xarakterləri səbəbindən özünü ilahi rəhmətdən tədricən uzaqlaşdırmış insan üçün hər il Allah tərəfindən müstəsna bir fürsət yaranır. Bu fürsət mübarək ramazan ayıdır. Ramazan ayında ürəklər yumşalır, ruhlar təmizlənir, insanlar Allahın xüsusi rəhmət vadisinə qədəm qoymağa hazırlıqlı olurlar, hər kəs öz istedadı, səyi və zəhməti qədərincə böyük ilahi ziyafətdən bəhrələnir. Bu mübarək ay sona çatanda fitr bayramı gəlir – yəni yeni il başlayır. Həmin gün insan ramazan ayının faydalarından istifadə edib .düzgün ilahi yola çıxa və sapqınlıqdan qurtula bilər

Bütün peyğəmbərlər, onların canişinləri, övliyalar, saleh və çox sadiq insanlar çalışmışlar ki, insan öz əmmarə nəfsindən ibarət olan daxili düşmənini kəşf etsin və ondan qorunsun. Bu, mənəvi və ilahi zirvələrə ucalmağın böyük sirridir. İnsan bunun vasitəsi ilə mələkdən də yüksəyə ucala bilər. Bu gün həmin gündür. Mənim əzizlərim! Bu mübarək ramazan ayını arxadan qoyanlar və bizim hamımız o ziyafətdən, Allahın geniş süfrəsindən öz səy və istedadımız qədərincə istifadə etmişik. Hər kəs ramazan ayından bir ehtiyat və azuqə toplamışdır. Gəlin hamımız bu ehtiyatlara arxalanıb bu gündən etibarən mənəvi eyiblərimizin bir hissəsini özümüzdən uzaqlaşdıramağa çalışaq. Bu bizim əlimizdədir: (Allah yolunda) çalışan (cihad edən) ancaq özü üçün çalışar (cihad edər)(١). Bu çalışmanın faydası birinci növbədə bizim özümüzə aid olacaq. Gəlin daxilimizdəki yanlış və çirkin xarakterləri tapaq. Bu, sözügedən səyin çətin hissəsidir. Gərək xudpəsənd olmayaq, eyiblərimizi görək, onları bir siyahı kimi önümüzdə tutaq, sonra ramazan ayından əldə etdiyimiz ehtiyatdan – ürək yumşaqlığından iradədən, paklıqdan, saflıqdan və inşallah qəbul olunan ibadətlərdən istifadə edib bu siyahını bir qədər azaltmağa çalışaq. Əgər paxılıqsa – paxıllığı, inadkarıqsa – inadkarlığı, tənbəl və passiviksə – tənbəlliyi, bədxah və pis niyyətliyiksə – bədxahlığı, sözümüzdə zəifiksə – zəifliyi, əhdimizi pozuruqsa – vəfasızlığı, bizdə olan hər bir əxlaqi eybi ramazan ayı və fitr bayramı sayəsində bacardığımız qədər pis əməllərimizin qara siyahısından silək. Bilin ki, Allah-Taala bu yolda çalışanlara kömək edəcək. Allah-Taala sizi kamilliyə doğru cihadda yalqız qoymayacaq və bu işdə birinci

xeyir hər bir şəxsin özünə çatacaq. Bundan əlavə, nəfslə mübarizənin, nəfsi islahın və Allah yolunda böyük cihad sayılan daxili cihadın faydaları yalnız özünüzə aid



---

۱- [۷۴] Ənkəbut/۶.

olmayacaq. Cəmiyyətin, ölkənin, xalqın vəziyyəti, siyasi vəziyyət, beynəlxalq iqtidar, iqtisadi vəziyyət, məişət vəziyyəti, xülasə, xalqın dünya və axirəti bu yolla rövnəqlənəcək, gözəlləşəcək. Bu zaman Allahın yardımı ilə uzun illər boyu öz ləyaqətini sübuta yetirmiş bu xalq digər xalqların gözü önündə parlaq bir məşəl kimi işıq .saçacaq; ondan istifadə edəcək və əxlaqını örnək götürəcəklər

Allahdan kömək alıb bu yola qədəm qoyaq, biri o birinin ardınca bütün günahları tərk edək, biri o birindən sonra bütün pis xarakterləri özümüzdən uzaqlaşdıraq, özümüzü Quranın və İslamın istədiyi kimi edək. O zaman Allah-Taala da bu xalqa verdiyi bütün .sözlərinə əməl edəcək və siz bir-bir bütün xeyirləri görəcəksiniz

.Fitr bayramı namazının xütbələrindən: ۱۹۹۵

səh:۷۶

Bu gün mübarək ramazan ayının on doqquzu və Şəfəq ongünlüyüdür. İran xalqı və .hətta bütün İslam dünyası üçün il ərzində bu gün kimisi azdır

Birinci xütbədə İslam tarixinin bu günlərdə şəhid olmuş böyük şəhidi haqda bir qədər danışmaq, əzəmətli və möhtəşəm məclisimizi Əmirəlmömininin (ə) xatirəsi ilə bir .qədər nurlandırmaq istəyirəm

Əmirəlmöminin (ə) barədə natiqlər, yazıçılar, mütəfəkkirlər, şairlər, mərsiyəçilər, Əhli-beyt (ə) məddahları, müsəlman və qeyri-müsəlman, şiə və qeyri-şiə olan çoxlu insanlar ۱۴۰۰ ilə yaxındır danışırlar, qiyamətə qədər də danışacaqlar. Lakin bununla yanaşı, o həzrətə dair mövzular o qədər çeşidlidir ki, hər bir cəhətdən deyilməmiş sözlər çoxdur. Mən düşünürdüm ki, bu gün Əmirəlmömininin (ə) şəxsiyyəti haqda ümumi bir nəticə göstərmək istəsəm, nə deməliyəm? Məqsədim bu ilahi insanın ruhani və əlçatmaz cəhəti deyil; mənim kimilər bu barədə danışa bilməzlər. Məqsədim onun kimliyinin və şəxsiyyətinin insanların görə, düşünə və örnək ala biləcək hissəsidir. Gördüm ki, bu da bir xütbənin və bir saatın işi deyil. Bu şəxsiyyətin çox əzəmətli cəhətləri vardır. Həmin cəhətləri bir yerə toplayıb dinləyiciyə demək olmaz ki, Əmirəlmöminin (ə) budur. Bəli, müxtəlif cəhətlərdən danışa, öz səyimiz, məlumatımız və dərkimiz qədərincə onun haqqında bəzi sözlər deyə bilərik. Mən fikirləşib gördüm ki, Əmirəlmöminində (ə) bəlkə də yüz belə xüsusiyyət - yüz sözünü bəzi böyüklər də işlətmişlər - tapmaq olar; istər mənəvi xüsusiyyət, məsələn, elm, təqva, zahidlik, səbirlilik və dözümlülük, istərsə də onun bir ata, bir ər, bir vətəndaş, bir əsgər, bir komandir, bir hökumət başçısı kimi xüsusiyyətləri və yaxud onun xalqla rəftarında təvazökar bir insan kimi, cəmiyyəti idarə edən ədalətli bir hakim və bir qazi kimi xüsusiyyətləri. Əmirəlmöminin (ə) üçün belə xüsusiyyətlərdən bəlkə də yüzünü sadalamaq olar. Əgər kimsə bu yüz xüsusiyyəti kompleks, səlis və aydın şəkildə bəyan edə bilsə, o həzrətə dair nisbətən kamil təsəvvür yaratmağa qadir olar. Lakin bu xüsusiyyətlərin dairəsi o qədər geniş və əhatəlidir ki, hər bir xüsusiyyət üçün ən azı bir kitab yazmaq lazımdır; məsələn, Əmirəlmömininin (ə) imanı barədə. Əlbəttə, bu gün .mənim söhbət etmək istədiyim xüsusiyyət iman deyil

Əmirəlmöminin (ə) mömin bir insan idi. Onun vücudunun dərinliklərində bir düşüncə, iman və etiqad oturuşmuşdu. Bəli, bu bir sözdür. Biz Əmirəlmömininin (ə) imanının əzəmətini aşkara çıxarmaq üçün bu imanı kiminlə müqayisə edək? Onun özü buyurur: Əgər qeyb aləminin pərdələri götürülsə, yəni Allah-Taalanın müqəddəs zatını, mələkləri, cənnəti, cəhənnəmi və bütün dinlərin qeyb və ruhani aləm haqda dediklərinin hamısını bu zahiri

gözlə görsəm, mənim yəqinim artmaz. Yəni bu yəqin və iman hər şeyi zahiri gözlə .görən şəxsin yəqini kimidir

Əgər bütün məxluqların imanını tərəzinin bir gözünə və Əmirəlmömininin (ə) imanını o biri gözünə qoysalar, Əlinin (ə) imanı ağır gələr. Yaxud götürək onun İslamda birinciliyini. O, yeniyetməlik çağında Allaha iman gətirdi, bu yolu qəbul etdi və bütün .varlığı ilə sona qədər davam etdirdi. Bunu da bir kəlmə ilə bəyan etmək olmaz

O həzrətin şəxsiyyəti olduqca əzəmətli və genişdir. Biz çoxlu böyüklər görmüş, tanımış, yaxud kitablarda həyatlarını oxumuşuq. Elə böyük insanlar olub ki, insan onları təsəvvür edəndə həqiqətən hörmət duyur, sanki başını səmaya qaldırıb Ayı, Veneranı, Yupiteri, Saturnu, yaxud Merkurini görür. Bu ulduzlar nə qədər uca, nə qədər böyük, nə qədər işıqlıdır! Amma bizim yaxıngörən və zəif gözümüz məsələn, Yupiterlə Veneranın, yaxud Venera ilə güclü teleskoplarla görünən və bizdən işıq sürəti ilə milyon illər, yaxud bir kəhkəşan uzaqda olan ulduzların fərqini alaya bilmir. Hər ikisi ulduzdur, bizim gözümüz gecələr hər ikisini göydə görür, amma bu hara, o hara. Biz möhtəşəmlikdən o qədər uzağıq ki, bəşərin tarixdə, İslamda, kitablarda, elm aləmində və hər hansı bir sahədə gördüyü böyüklərlə Əmirəlmömininin (ə) fərqini ayırd edə bilmirik. Əmirəlmöminin (ə) möhtəşəm varlıqdır. Bu gün mən və siz Əli ib Əbu Talibin (ə) şiəsi sayılırıq və onun yolu ilə getməliyik. Əgər o həzrətin şəxsiyyətinin hansısa bir cəhətini bilməsək, kimliyimizdə nöqsan yaranar. Əgər ortada iddia olmasa, heç, amma bizim iddiamız var. Biz Əli (ə) yolu ilə getmək və cəmiyyətimizi Əli (ə) cəmiyyəti etmək istəyirik. Biz şiələr birinci növbədə, qeyri-şiə müsəlmanlar da ikinci növbədə belə bir məsələ qarşısındadırlar. Əlbəttə, bütün müsəlmanlar Əmirəlmöminini (ə) qəbul edirlər, .lakin şiələr o həzrəti ayrı-formada və xüsusi əzəmət sahibi kimi görür və tanıyırlar

### Əmirəlmömininin (ə) şəxsiyyətində şücaət xüsusiyyəti

Mən düşündüm ki, bu gün Əmirəlmömininin (ə) şücaəti haqda bir qədər danışım. Əgər vaxt qalsa, o həzrətin xüsusiyyətlərindən başqa birisi haqda da söhbət edəcəyəm. Şücaət çox böyük və faydalı bir xüsusiyyətdir. Döyüşdə şücaət nəticəsində insan təhlükədən qorxmur, təhlükəyə atılır, öz qüvvəsini işlədir və nəticədə düşmənə qələbə .çalır

İnsanlar şücaəti belə anlayırlar, amma şücaətə müharibədən başqa yerlərdə də ehtiyac var. Bəzi yerlərdə şücaətin təsiri döyüşdən də əhəmiyyətli olur; həyat, haqq və batilin toqquşduğu yer, düşüncə sahəsi, həqiqətləri izah

etmək zamanı və həyat boyu insanın mövqe bildirməli olduğu yerlər belədir. Şücaət belə yerlərdə də öz təsirini bağışlayır. Şücaətli bir insan haqqı görəndə qəbul edir, heç nədən qorxmur və heç bir şey onu saxlamır; xudpəsəndlik ona mane olmur; düşmən, yaxud müxalif cəbhənin böyüklüyü ona mane olmur. Şücaətsiz bir insan isə belə deyil. Söhbət bundan gedir ki, bəzən insanların, xüsusən də cəmiyyətdə yüksək mövqe tutan insanların şücaətli olmaması həqiqətin məhvinə gətirib çıxarır. Başqa sözlə desək, bəzən bir insanda fikir bildirmə şücaətinin olmamasına görə bir haqq nahaq olur və nahaq haqq libasına bürünür. Əgər burada döyüş meydanında şücaətdən .üstün olan əxlaqi şücaət və ictimai şücaət olsa, belə məsələlər qarşıya çıxmaz

Şücaətlilərin ən böyüyü olan Əmirəlmöminin (ə) döyüşdə heç zaman heç bir düşmənə arxa çevirmədi. Bu kiçik məsələ deyil. Siz erkən İslam çağının döyüşlərində Əmirəlmömininin (ə) şücaətindən xəbərdarsınız. Xəndək döyüşündə hamı qorxanda Əli (ə) önə çıxdı; Xeybərin fəthində, Ühüddə, Bədrdə və Hüneyndə də həmçinin. Bu döyüşlərin bəzisində o həzrətin iyirmi dörd, bəzisində iyirmi beş, bəzisində otuz yaşı olmuşdur. İyirmi yeddi-iyirmi səkkiz yaşlı bir gənc döyüşdəki şücaəti ilə İslamı qalib etdi və bəlli əzəmətləri yaratdı. Bu, Əmirəlmömininin (ə) döyüş şücaətinə aiddir, amma mən deyirəm: Ey böyük Əli (ə)! Ey Allahın sevimlisi! Sənin həyatdakı şücaətin döyüşdəki şücaətindən dəfələrlə yüksək olmuşdur. Nə zamandan? Yeniyetməlik çağından. Siz o həzrətin İslamda birinciliyinə baxın. Əli (ə) elə bir vaxtda dəvəti qəbul etdi ki, hamı dəvətə arxa çevirmişdi, heç kəsdə İslamı qəbul etmək cəsarəti yox idi. Bu, şücaətin bir nümunəsidir. Əlbəttə, siz həmin hadisə kimi bir hadisəni fərz etsəniz, müxtəlif cəhətlərdən və müxtəlif xüsusiyyətlər üçün misal ola bilər, amma hələlik bu işə onun şücaətli iş olması baxımından yanaşırıq. Əziz Peyğəmbər (s) bir cəmiyyətdə Allahın sözünü təbliğ edirdi. O cəmiyyətin bütün amilləri o sözün əleyhdarı sayılırdılar. Xalqın cəhaləti və məğrurluğu, xalqa hakim olan zadəganların zadəganlığı, onların maddi və sinif maraqları o sözün qarşısında dayanmışdı. Belə bir cəmiyyətdə bu sözün aqibəti necə olar? Əziz Peyğəmbər (s) belə bir sözü bəyan etdi və əvvəlcə öz yaxınlarına dedi. Allah ona buyurmuşdu ki, yaxın qohumlarını qorxut. Lakin Peyğəmbər (s) canlarının bir parçası olsa da, ona qarşı qohumluq təəssübkeşlikləri olsa da – o zaman hamıda belə təəssübkeşlik vardı və bəzən bir qohumdan ötrü on il vuruşurdular – onun həqiqətlərə etinasız yanaşan təkəbbürlü əmiləri bu haqq sözün qarşısında məsxərəyə başladılar,

.gözlərini yumdular və ondan üz çevirdilər

Bəli, İslam məşəlini ucaldanda qohumları etinasızlıq etdilər, hörmətsizlik və təhqir etdilər, ələ saldılar, amma yeniyetmə Əli (ə) ayağa qalxıb dedi ki, ey

əmioğlu, mən iman gətirirəm. Düzdür, o öncədən iman gətirmişdi, amma ailə iclasında imanını aşkara çıxardı. Əmirəlmöminin (ə) besətin on üç ili ərzində ilk bir neçə gündən başqa heç zaman imanını gizli saxlamadı. Başqa müsəlmanlar bir neçə il imanlarını .gizlətdilər, amma hamı bilirdi ki, Əli (ə) əvvəldən iman gətirmişdir

Bunu yaxşı təsəvvür edin: qapı-qonşu təhqir edir, cəmiyyətin böyükləri təhqir edir, sıxışdırır, şair məsxərə edir, natiq məsxərə edir, pullu məsxərə edir, rəzil insan təhqir edir, amma ağır müxalif dalğalar arasında bir yeniyetmə dağ kimi möhkəm dayanıb Mən Allahı və bu yolu tanımışam deyir və o sözün üstündə dayanır. Şücaət budur. Əmirəlmömininin (ə) həyatının bütün mərhələlərində bu şücaət aydın görünür. Bu .şücaət Məkkədə vardı, Mədinədə vardı, Peyğəmbərlə (s) beyət zamanı vardı

Əziz Peyğəmbər (s) müxtəlif səbəblərə görə bir neçə dəfə xalqdan beyət almışdır. Bu beyətlərin biri və bəlkə də hamısından çətini Hüdeybiyyə hadisəsində olan Şəcərə (ağac), yaxud Rizvan beyətidir. Vəziyyət ağırlaşanda əziz Peyğəmbər (s) ətrafında olan min neçə yüz adamı toplayıb buyurdu ki, sizdən ölümə beyət alıram; gərək qaçmayasınız, o qədər vuruşasınız ki, ya qələbə çalasınız, ya öldürüləsiniz. Zənnimcə, o həzrət başqa heç bir yerdə müsəlmanlardan belə beyət almamışdır. O cəmiyyətin arasında hər cür insan vardı. O beyətdə zəif imanlı və nəql olunana əsasən münafiq insanlar da vardı. Ayağa qalxıb ey Allahın rəsulu, beyət edirəm – deyən birinci şəxs isə həmin gənc (Əli ibn Əbu Talib (ə)) idi. Otuzdan az yaşı olan bu gənc əlini uzadıb dedi ki, səninlə ölümə beyət edirəm. Sonra digər müsəlmanlar cürətləndilər və biri o birindən sonra Peyğəmbərlə (s) beyət etdilər. Ürəyi istəməyənlər də beyət etməyə məcbur oldular: (Hüdeybiyyədə) ağac altında sənə beyət etdikləri zaman Allah möminlərdən (razı oldu.(١

Əmirəlmömininin (ə) şücaəti belə idi. Peyğəmbərin (s) dövründə nə zaman layiqli insana ehtiyac duyulurdusa, o həzrət qarşıya çıxır və bütün çətinliklərdə birinci olmağa can atırdı. Bir rəvayətə görə, bir kişi Abdullah ibn Ömərin yanına gedib dedi: Mən Əliyə (ə) düşmənəm. Bəlkə də o kişi həmin ailənin Əli (ə) ilə yaxşı münasibətinin olmadığını bilir və yaltaqlanmağa çalışırdı. Abdullah ibn Ömər dedi: Allah sənə düşmən olsun! Sən elə bir insana düşmənsən ki, onun xeyir işlərdə birinciliyi bütün dünyadan və dünyada .olanlardan üstündür

Bu, böyük Əmirəlmömininindir (ə). Bu, tarixin parlaq Əlisidir (ə); əsrlərlə parlayan və parıltısı günbəgün çoxalan günəş. O həzrət vücuduna ehtiyac



---

.Fəth/۱۸ [۷۵] -۱

duyulan hər bir yerdə hazır idi, başqa heç bir kəs olmasa da. O buyurmuşdur: Tərəfdarlarının azlığına görə hidayət yolunda qorxuya düşməyin. Əgər azlıqdasınızsa, dünya əhalisinin hamısı, yaxud əksəriyyəti sizə qarşı pis münasibətdədirsə, yolunuzu qəbul etmirsə, qorxmayın və yoldan dönməyin. Düzgün yolu seçdikdən sonra bütün vücudunuzla o yolla gedin. Bu, Əmirəlmömininin (ə) məntiqidir. O, öz həyatında bu cəsarətli məntiqi rəhbər tutdu. Beş ildən az sürən hakimiyyəti zamanı da Əmirəlmömininin (ə) məntiqi bu idi. Nə qədər baxırsınızsa, şücaət görürsünüz. Beyətinin ertəsi günü o həzrətdən qabaq ona-buna bağışlanan torpaqlar, bağlar barədə buyurdu: And olsun Allaha! Əgər kimlərinsə məndən öncə haqsız olaraq sizə verdiyi bəxşişləri xanımlarınıza mehr etmiş, yaxud satıb pulu ilə kəniz almışsınızsa, fərqi yoxdur, hamısını qaytaracağam. Sonra işə başladı və bəlli düşmənliklər yarandı. Bundan üstün şücaət ola bilərmi?! O ən inadkar şəxslər qarşısında şücaətlə dayandı; İslam cəmiyyətində adlı-sanlı şəxslərin qarşısında şücaətlə dayandı; Şamda toplanmış və qarşısında on minlərlə döyüşcünü sıraya düzən sərvətin qarşısında şücaətlə dayandı. Allahın yolunu təyin etdikdən sonra heç kimdən çəkinmədi. Bu şücaətdir. Öz qohumlarının qarşısında da heç nəyi nəzərə almadı. Bu sözləri demək asan, onlara əməl etmək isə çox çətindir. Bir zaman biz bu sözləri İmam Əlinin (ə) həyatının örnəkləri başlığı altında deyirdik və etiraf etməliyəm ki, o zaman bunları tam dərk etmirdik, amma bu gün İslam cəmiyyətini idarə etməkdən ibarət olan əsas vəzifə bizim kimilərin üzərinə düşdüyündən və bu məsələlərlə tanış olduğumuzdan Əlinin (ə) .nə qədər böyük olduğunu anlayırıq

Mənim əzizlərim! Namazda iştirak edən mömin qardaş və bacılar! Mən bu sözləri daha çox özümə və İslam cəmiyyətinin idarəsində rolu olan şəxslərə desəm də, bunlar hamıya aiddir, yalnız xüsusi bir təbəqəyə və ya qrupa məxsus deyil. Öz şəxsiyyəti sayəsində milyonlarla insana İslamı və həqiqəti tanıtdıran Əmirəlmöminin (ə) belə yaşadı. Minbərlər üzərində yüz ilə yaxın lənət oxunan və İslam dünyasının hər bir yerində pislənən Əmirəlmöminin (ə), özünün və sözlərinin əleyhinə minlərlə hədis quraşdırılıb düşüncə bazarına göndərilən bu misilsiz şəxsiyyət elə yaşadı ki, uzun illər sonra xurafat pərdələri arxasından çıxıb uca qamətini tarixin önündə saxlaya bildi. Əli (ə) kimi bir gövhər qalır, ot, ələf, zibil və palçıq onu bulaşdırıb dəyərini azalda bilmir. Bir almaz parçasını palçığa atsalar da, almazdır və nəhayət özünü göstərəcək. Belə bir

gövhər olmaq lazımdır. Hər bir müsəlman bu əzəmətli məşəli öndə tutub ona sarı .hərəkət etməlidir

Heç kəs iddia etməyib ki, biz Əli ibn Əbu Talib (ə) kimi hərəkət edə bilərik. Əbəs yerə ona-buna demək olmaz ki, siz nə üçün Əli (ə) kimi deyilsiniz. İmam Zeynəlabidinin (ə) özü məsum idi, amma rəvayətə əsasən, Əmirəlmömininin (ə) ibadətindən söz düşəndə ağlayıb buyurdu: Biz hara, Əmirəlmöminin (ə) hara! Məgər biz Əli (ə) kimi ola bilərik?! İndiyədək dünya böyüklərindən heç kim bunu bacarmamışdır; nə iddia, nə xəyal etmiş, nə də beyninə belə bir səhv fikir düşmüşdür ki, Əmirəlmöminin (ə) kimi hərəkət edib işləyə bilər. Önəmli olan budur ki, istiqamət Əmirəlmömininin (ə) istiqaməti olsun. O həzrət Osman ibn Hüneyfə yazdığı və Nəhcül-bəlağədə mövcud olan bir məktubda özünün məişət vəziyyəti haqda danışandan sonra deyir: Elə .bilməyin ki, siz də mənim kimi edə bilərsiniz

O, əlçatmaz bir varlıqdır, amma örnəkdir. Bu örnəyə oxşamağa çalışaq. Heç kəs Əli (ə) kimi şücaətli ola bilməz. Cənab Abdullah ibn Abbas Əmirəlmömininə (ə) ən yaxın insan, onun əmisi oğlu, şagirdi, dostu, sirdaşı idi, ona dərin hörməti və həqiqi sevgisi vardı, amma bir dəfə öz payı olduğunu düşünərək beytülmaldan bir qədər nə isə götürüb Məkkəyə getmişdi. Əmirəlmöminin (ə) ona elə bir məktub yazdı ki, oxuyanda insanın tükü biz-biz olur. Məktubda Əmirəlmöminin (ə) Abdullah İbn Abbasa deyir ki, sən xəyanət etdin, əgər dediyimi etməsən, əlimə düşəndə Allah yanında özümü sənin işində üzrlü edəcəyəm; yəni səndən ötrü Allah yanında xəcalətli və başıaşağı olmamağa çalışacağam. "Səni elə qılıncla vuracağam ki, onunla vurduqlarımın hamısı cəhənnəmə getmişdir". Bu cümlə isə daha güclüdür: "And olsun Allaha! Əgər sənin gördüyün bu işi Həsən və Hüseyn (ə) də görsəydilər, mənim yanımda heç bir üzrləri olmazdı, onların xeyrinə heç bir qərar çıxarmaz və bunu onlardan alardım". Əmirəlmöminin (ə) Həsən və Hüseynin (ə) məsum olduğunu bilir, amma deyir ki, belə .bir iş baş versə, yazığım gəlməz. Bu, şücaətdir

Əlbəttə, bu növ rəftarın müxtəlif adları vardır. Bir baxımdan ədalətlilikdir, başqa bir baxımdan qanuna riayət və hörmət etməkdir, amma başqa bir baxımdan da şücaət və özünə hakim olmaq gücüdür. Bu gün mənim, sizin və bütün İran xalqının bu şücaətə ehtiyacımız var. Kim bu hökumətdə vəzifə tutmuşsa, əli müsəlmanların beytülmalına çatırsa və xalqın ona daha çox etimadı varsa, bu şücaətə daha çox ehtiyaclıdır. Bugünkü dünya daha Əbu Ləhəb və Əbu Cəhl kimi cahillərdən təşkil olunmur. Bu gün

kafirlər, müxaliflər və dünyanın birinci dərəcəli qoçaqları ən mühüm siyasi və təbliğat məsələlərini əllərində saxlayanlardır. Bu gün dünyanı idarə edənlərin, xalqları idarə edənlərin, hökumətləri dəyişənlərin, dünyanın müxtəlif bölgələrini ələ keçirənlərin, müharibə yaradanların, müharibə bitirənlərin, quruluşları

devirənlərin, bir quruluşu iş başına gətirənlərin – dünyanın bu birinci dərəcəli fırıldaqçıları və hiyləgərlərinin hamısının diqqəti İslam Respublikasına yönəlmişdir. İslam Respublikası quruluşunu və İran xalqını təhqir edir, ələ salır, pisləyir və deyirlər ki, siz dünyada qəbul olunmuş normalara uyğunlaşmamaqla səhv edirsiniz. Siz Amerikanın və digər supergüclərin qlobal və beynəlxalq siyasətlərinə təslim olmamaqla səhv edirsiniz; Fələstin məsələsində səhv edirsiniz; Bosniya məsələsində .və digər müsəlmanlara aid olan hadisələrdə səhv edirsiniz və sair

Bu gün siyasət budur. Yalnız bu gün yox, inqilabın əvvəlindən İran xalqını günahlandırırlar. İranın məmurlarını və onlarla daha ciddi müxalif olan hər bir kəsi daha çox günahlandırırlar. Hansı işdən daha çox zərər görürlərsə, onu daha çox ələ salırlar. Qadınla rəftarı ələ salırlar, universiteti ələ salırlar, ibadəti ələ salırlar, camaat namazını ələ salırlar, spirtli içkilərdən istifadə etməməyi və ilahi cəzaların tətbiqini ələ .salırlar

Mənim əzizlərim! Bəzən həmin məsxərələr, təhqirlər və aşağılamalar böyük insanları da çarəsiz və yazıq edir, məcburən onlarla həmrəng olurlar. O zaman supergüclər gizlicə əllərini qarınlarına qoyub uğunur, istədiklərinə nail olduqlarına və bir maneəni dəf etdiklərinə görə gülürlər. Hansısa inqilabçı cərəyanı dünyada o qədər məsxərə edirlər ki, özünün inqilabçı amallarını, arzu və şüarlarını açıq-aşkar geri götürsün, yaxud pisləsin və yaxud hətta məsxərə etsin. Dünya siyasətində göründü ki, bir şəxs camaatla həmrəng olmaqdan ötrü özünün dünənki düşmənlərinin hüzurunda dayanıb bu gününü ələ saldı və onlar güldülər. Əlbəttə, onlar belə bir şey görəndə könüllərini xoş edib deyirlər ki, bəh-bəh, siz nə qədər sivil və düşüncəli insansınız, amma əslində .önlərindən bir maneəni götürmüş olurlar. Onlar maneələri bu yolla dəf edirlər

Belə yerdə Əli ibn Əbu Talibə (ə) etiqadlı olan şiə o həzrətin şücaətindən dərs almalıdır. Tərəfdarlarının azlığına görə hidayət yolunda qorxuya düşməyin. Qorxmayın, düşmənin arxa çevirdiyinə görə tənhalıq hissi keçirməyin. Düşmənin əlinizdə olan qiymətli gövhəri ələ saldığına görə etiqadınız zəifləməsin. Sizin əlinizdə qiymətli bir cəvahirat var və böyük bir iş gördünüz. Siz öz ölkəniz daxilində tükənməz bir xəzinə kəşf etdiniz, İslamı qazandınız, müstəqilliyə və azadlığa qovuşdunuz, özünüzü böyük güclərin boyunduruğundan xilas etdiniz. Bir zaman bu məmləkət, bu universitet, bu

Tehran, bu qarnizonlar, bu silahlı qüvvələr, bu dövlət idarələri, bu nazirliklər, bu təhlükəsizlik qurumları hamılıqla Amerikanın mülkü idi. Bu gün əgər ölkənin ən ucqar nöqtələrində, ən kiçik kəndlərində də heç kimin bir Amerika tərəfdarını görməyə gözü ,yoxdur. Bir zaman bu məmləkətdə xalq yox idi

səsvermə yox idi, parlament yox idi, seçkilər yox idi; hər şey zahiri, formal, yalançı və süni idi. Pəhləvi dövrü bu xalq üçün doğrudan da qəribə dövr idi. Sanki bir salon içində böyük bir zavod düzəldirlər. Baxdıqda görürsünüz ki, zavoddur, zavodun imkanları var, yaxınlaşdıqda isə görürsünüz ki, hamısı neylondan və plastikdəndir; hündür tavanı, dirəkləri və mücəssəmələri olan böyük bir imarət kimi oyuncaq düzəldilmişdir. İnsan bunun möhtəşəm saray olduğunu güman edir, amma yaxınlaşdıqda görür ki, qardan .düzəldilmişdir

Universitet, ziyalılıq, jurnal, qəzet, parlament və hökumət – hamısı formal idi. Yalnız ümumxalq cərəyanı olan din cərəyanı həqiqi idi. Ona da nifrət və ədavətlə baxırdılar. Düzdür, ətrafda zəif və çox kiçik formada vətənpərvəlik cərəyanı da vardı. Bu xalq üçün belə bir vəziyyət yaratmışdılar. Siz gəlib hər şeyi əsaslı şəkildə qurdunuz. Bu gün bu məmləkətdə elm inkişaf edir, sənaye inkişaf edir, universitet inkişaf edir, insanların şəxsiyyəti inkişaf edir, düşüncələr inkişaf edir, sözün həqiqi mənasında azadlıq inkişaf edir, təhsil inkişaf edir. Bu xalqın hərəkəti yavaş-yavaş elə bir həddə çatacaq ki, dünyada öz mövqeyini tapacaq. Dünən dünyada heç kəs İran xalqına etina etmirdi. Buraya gələnlər bu xalqın özündən vəhşilik haqqı alırdılar. Siz bu gün bir xalq və mühüm rəy sahibisiniz. Dünyanın hər hansı bir mühüm məsələsində İran xalqının ciddi şəkildə müxalif olduğu iş baş tutmur. Bu gün bu xalq, bu quruluş, bu hökumət və bu böyük ölkə Allahın lütfü ilə dünyada belə bir mövqeyə malikdir. İran xalqının əzəməti tədricən gözləri özünə cəlb edir. Siz bunu əldə etmisiniz. Qoyun düşmən təhqir etsin, .nə istəyir desin

Əli ibn Əbu Talibin (ə) onu məcbur etmək istədikləri haqsızlıq qarşısında şücaət və müqaviməti bu gün bizim danışdıqlarımızdan böyük dərsdir. Mən siz əzizlərin hamısına tövsiyə edirəm ki, qeyd olunan mənada ilahi təqvanı çox ehtiyatla diqqətdə saxlayın və o yolla irəliləyin. Allah kömək edəcək. Bu on yeddi ildə Əmirəlmömininin (ə) adının sayəsi bu xalqın başı üzərində olub və bu xalq o həzrətin nurundan istifadə edib; düşmənin acığına bundan sonra daha çox istifadə edəcək, irəliləyəcəyik və bizim .cəmiyyətimiz həqiqətən Əli (ə) cəmiyyəti olacaq

.Tehranın cümə namazı xütbələrindən: ۱۹۹۶

**Fitr bayramı – növbəti ramazan ayına hazırlıq üçün ciddi qərar günü**

Fitr bayramı münasibəti ilə bütün dünya müsəlmanlarını, əziz İran xalqını və namazda iştirak edən siz əziz bacı və qardaşları təbrik edirəm. Bu gün böyük gündür. Peyğəmbərlərin (s) sonuncusu olan əziz İslam Peyğəmbərinə (ə) və tarix boyu bütün İslam ümmətinə məxsus gündür. Elə bir gündür ki, müsəlmanlar mübarək ramazan ayının islah və tərbiyə edən mühüm imtahanından keçib, sanki böyük Allah qarşısında hesaba durur və ramazan ayında etdiklərini Rəblərinə təqdim edirlər. Fitr bayramının gecə və gündüzünün dualarında buna işarə vurulmuşdur: Ramazan ayını bizdən qəbul .et

Fitr bayramına dair başqa bir məsələ növbəti ramazan ayında iştirak etmək üçün il boyu hazırlıq görməyə ciddi qərar verməkdir. Əgər bir şəxs hər il ramazan ayının ilahi ziyafətində, qədr və digər mübarək gecələrində iştirak etmək istəsə, özünü əvvəldən hazırlamalıdır. İl boyu görüləcək bu hazırlığa bu gün qərar verməlisiniz. İl boyu elə yaşamağa çalışın ki, növbəti ramazan ayı sizi qəbul etsin, ilahi ziyafət sizə şirin gəlsin. Bu, insanın götürə biləcəyi ən böyük fayda, dünyaya, axirətə, insanın özünə, .yaxınlarına və İslam cəmiyyətinə aid olan bütün işlərdə uğur amilidir

**Dünya – yaranışın əsas məqsədinə çatmaq üçün əməl düşərgəsi**

Əziz qardaş və bacılar! Qısaca deyim ki, bu dünyada insanlar bir mərhələdən o birinə keçmək üçün düşərgəyə aparılanlar kimidirlər. Bir qrup şagirdi, hərbçini və ya idarə işçisini bir mərhələdən keçmək, səviyyəsini yüksəltmək və bəzi məlumatlar toplamaq üçün bir düşərgəyə aparırlar. Onlar üçün müxtəlif proqramlar təşkil edir, düşərgədə yaşayış imkanları hazırlayır və bu mərhələni keçirəndən, bilməli olduqlarını biləndən .sonra düşərgədən çıxarırlar ki, daha yüksək bir mərhələyə keçsinlər

Bura həmin böyük düşərgədir. Hər gün milyonlarla insan bu düşərgəyə qoşulur və milyonlarla insan bu düşərgədən çıxıb özlərini yaranışın əsas məqsədinə və həqiqi .mənzil başına yaxınlaşdırırlar

Bu düşərgədə bizim üçün bəzi proqramlar nəzərdə tutulmuşdur. Biz onlarla özümüzü yüksəldə, islah edə, insan yaranışının son və həqiqi mənzilinə – Allaha qovuşmağa

hazırlaya bilərik. Dinlər insanların bütün həyatı üçün belə proqramlar təqdim etmişlər. :Onlar bir neçə növdür

Bu proqramların bəzisi mənəvi və ruhi baxımdan insanın Allah-Taala ilə əlaqəsini bərqərar edir. Namaz, Allahı yada salmaq, münacat, dua və digər ibadətlər bu .növdəndir

Bəzi proqramlar insanın xarakterlərini və təbiətini düzəldir, onun psixoloji nöqsanlarını aradan qaldırır. Məsələn, əxlaqi tövsiyələr bizdən təkəbbürlülüyü, paxıllığı, pisliyi, rəzilliyi, yalançılığı və xəyanəti uzaqlaşdırır, insanı səxavətli, məhəbbətli, bağışlayan və .gözəl insani xislətlərə sahib edir

Bəzi proqramlar bizim fərdi və ictimai əlaqələrimizi, bu dünyada – bu böyük düşərgədə yaşayan digər insanlarla ictimai münasibətlərimizi tənzim edir. Hətta əşya və heyvanlarla münasibətləri də bizə öyrətmişlər. Bəzi təlim və proqramlar bu əlaqələri tənzimləyir. Bu proqramların bəzisi mühiti yaşamağa qabiliyyətli edir. Məsələn, hökumət qurmaq, yaxşı işlərə dəvət etmək, pis işlərdən çəkindirmək, zalımlara düşmən olmaq, mömin insanlara yaxşılıq etmək, dünyanın və cəmiyyətin islahına və yoxsulluğu aradan qaldırmağa kömək etmək, dünyaya, mühitə və cəmiyyətlərə aid olan digər proqramlar bu qəbildəndir. Bu böyük düşərgənin və bu həyat dövrünün .proqramları bizim üçün hazırlanmışdır

Bunlardan əlavə, adı dünya olan bu böyük təlim və tərbiyə düşərgəsində bəşərin rahatlığı üçün də şərait yaradılmış, onun fiziki və cinsi ləzzətlərinə də diqqət yetirilmişdir. Bu ləzzətlər onun gözünü, qulağını, ruhunu və ağlını oxşayır, onu razı salır. Əgər bu ləzzətlərdən düzgün istifadə olunsa, bu düşərgədə yaşamaq həm də ləzzətli olacaq. Yəni həm inkişaf və tərəqqi olacaq, həm özümüzü kamilliyə yaxınlaşdırmış, həm yaranışın son mənzilinə hazırlaşmış, həm də bu dünyada Allahın bəxş etdiyi halal ləzzətlərdən istifadə etmiş olacağıq: (Ey Peyğəmbərim!) De: "Allahın Öz bəndələri üçün (yaratdığı zinəti və təmiz (halal) ruziləri kim haram etmişdir?(١

Siz ramazan ayında və böyük ibadət imkanlarında əslində bu proqramları düzgün yerinə yetirmək üçün özünüzü hazırlayırsınız. Bu proqramlara düzgün əməl edən, lazım olanları yerinə yetirən, öz həyatını və rəftarını düzəldən şəxs düşərgədən çıxan .zaman qorxmur; çünki əli doludur

Ramazan ayında hər bir namazdan sonra oxunması müstəhəb olan duada Allaha belə deyilir: İlahi, müsəlmanların işlərindəki bütün fəsadları düzəlt! İlahi, Öz sərvətinlə bizim yoxsulluğumuzu aradan qaldır! İlahi, Öz gözəl halınla bizim pis halımızı dəyişdir!(٢) .Allahdan bunu istəmişik. Bu bizim öz əlimizdədir

Gərək ehtiyatlı olaq və ramazan ayından qabaqkı on bir ay boyu özümüzü hazırlayaq. Əgər ramazan ayı çatanda lazımi hazırlıqları əldə etmiş olsaq, ilahi ziyafətdən daha çox istifadə edəcək və növbəti il üçün bir dərəcə, bir səviyyə və



---

۱- [۷۶] Əraf/۳۲.

۲- [۷۷] Müstədrək əl-vəsail, c. ۷, səh: ۷۴۴.

bir sinif yüksələcəyik. O zaman həm öz nəfsinizdə və qəlbinizdə, həm də ictimai .mühitdə sizi razı salacaq halları müşahidə edəcəksiniz

İslamın tərbiyə sisteminin və bütün həyat proqramlarının əsası bunlardır. Hər kəs özünə nəsihətçi olmalı, özündən muğayat olmalı, səhvə düşməsinin qarşısını almalı, yaxşı işlərə dəvət etməli və pis işlərdən çəkindirməlidir. Özünü yaxşı işlərə dəvət etmək, pis işlərdən çəkindirmək və özünə nəsihət vermək digərini dəvət etməkdən, çəkindirməkdən və digərinə nəsihət verməkdən birinci olmaldır. Bu, bizdən istənilən ilahi təqvadır. Təqvanı saxlayaq, bunu bir-birimizə tövsiyə edək. Mən də siz qardaş və bacılara tövsiyə edirəm ki, ilahi təqvanı unutmayın. Ramazan ayının ən böyük səmərəsi təqvadır. Əldə etdiklərinizi qoruyun, onu növbəti illərdə və inşallah .ömrünüzün sonuna qədər artırın

.Fitr bayramı namazının xütbələrindən: ۱۹۹۶

## Ramazan – tövbə, yalvarış, dua və dilək ayı

Allah ayı, tövbə, yalvarış, dua və dilək ayı olan mübarək ramazan ayı münasibəti ilə siz əzizlərin hamısını və bütün dünya müsəlmanlarını təbrik edirəm. Bu ayın bəzi xüsusiyyətləri haqda söhbət edəcəyim birinci xütbənin əvvəlində namazda iştirak edən siz əzizlərin hamısını ilahi təqvaya çağırıram. Bu ay təqva ayıdır və oruc təqvanı yaradan amildir. Təqva isə həm mömin şəxsin, həm də mömin cəmiyyətin dünya və axirət azuqəsidir. Ümidvarıq ki, Allah bu ayda bizim hər birimizə, əzəmətli və .müsəlman İran cəmiyyətinə bu dəyərli ehtiyatı bəxş etsin

Mübarək ramazan ayının gündüzlərində oxunması müstəhəb olan bir duada belə deyilir: Bu, Allaha qayıdış, tövbə və cəhənnəmdən qurtuluş ayıdır(١). Bu gün məhz buna .görə birinci xütbədə Allahdan bağışlanma diləmək haqda bir qədər danışacağam

## Bağışlanma diləyinin tərifi, əhəmiyyəti, şərtləri və təsirləri

Bağışlanmaq istəyi – günahlar üçün ilahi əfvi diləməkdir. Əgər bu düzgün baş versə, ilahi bərəkətlərin qapısını açar. Bir fərdin və bir cəmiyyətin ilahi lütflərdən ehtiyacı olan hər bir şey – ilahi lütf, ilahi rəhmət, ilahi nurluluq, ilahi hidayət, Rəbb tərəfindən uğur, işlərdə kömək, müxtəlif sahələrdə yardım qapısı bizim günahlarımızın vasitəsi ilə bağlanır, günah bizimlə ilahi mərhəmət və lütf arasında pərdə olur. Bağışlanmaq istəyi bu pərdəni götürür, Allahın rəhmət yolunu açır. Bağışlanmaq istəyinin faydası budur. Buna görə, siz Quranın bir neçə yerində bağışlanmaq istəyi üçün dünya və bəzən də axirət faydalarının nəzərdə tutulduğunu görürsünüz. Məsələn, buyurur: Ey camaatım! Rəbbinizdən bağışlanmanızı diləyin. Sonra Ona tövbə edin ki, göydən sizə bollu yağış göndərsin.(٢) Bunların hamısının izahı belədir ki, bağışlanmaq istəyi sayəsində insanın və cəmiyyətin qəlbinin və cisminin Allahın bu nemətlərinə yolu açılır. Odur ki, .bağışlanmaq istəyi çox mühüm məsələdir

Bağışlanmaq istəyi əslində tövbənin bir hissəsidir. Tövbə də Allaha sarı qayıdışdır. Buna əsasən, tövbənin şərtlərindən biri bağışlanmaq istəyi, yəni Allah-Taaladan əfv diləməkdir. Bu, Allahın böyük nemətlərindən biridir. Yəni Allah-Taala bəndələr üçün tövbə qapısı açmışdır ki, kamal yolunda irəliləyə bilsinlər və günah onları iflic etməsin. Çünki günah insanı uca zirvədən endirir. Günahların hər biri insanın ruhuna, saflığına,

mənəviyyatına və ruhi yüksəlişinə bir zərbə vurur, insan ruhunun şəffaflığını yox edir və onu qaraldır. Günah



---

۱- [۷۸] .Əl-Kafi, c. ۴, səh: ۷۵

۲- [۷۹] .Hud/۵۲

insanda olan və onu bu maddi dünyanın digər məxluqlarından ayıran mənəvi cəhətini .öldürür, heyvanlara və cəmadata yaxınlaşdırır

**İnsanın həyat və fəaliyyətlərində günahın təsiri**

Günahlar insanın həyatında mənəvi cəhətdən əlavə, bəzi uğursuzluqlara da səbəb olur. Bəşər fəaliyyətinin bir çox sahələrində etdiyi günahlarına görə uğursuzluğa düçar olur. Əlbəttə, bunların elmi, fəlsəfi və psixoloji izahı da var, gözüyumulu qəbul etmir, yaxud danışmırıq. Necə olur ki, günah insanı iflic edir? Misal üçün, Ühüd döyüşündə bəzi müsəlmanların səhlənkarlığı və təqsiri üzündən ilk qələbə məğlubiyyətə çevrildi. Yəni müsəlmanlar əvvəl qalib oldular, amma sonra dağın yarıq hissəsində oturub cəbhənin arxasını mühafizə etməli olan oxçular qənimət tamahından səngərlərini buraxıb meydana gəldilər və düşmən də onları mühasirəyə alıb qəfil hücumla .müsəlmanları tar-mar etdi. Ühüd məğlubiyyəti bundan yarandı

Ali-İmran surəsində bu məğlubiyyət barədə bəlkə də ١٠-١٢, yaxud daha çox ayə vardır. Müsəlmanlar psixoloji cəhətdən çox gərgin durumda olduqlarına və bu məğlubiyyət onlar üçün çox ağır tamamlandığına görə, Quran ayələri onları həm sakitləşdirir, həm hidayət edir, həm də başa salırdı ki, sizin bu məğlub olmanıza nə bais oldu və bu hadisə haradan qaynaqlandı. Nəhayət bu şərafətli ayəyə çatır: İki ordu qarşılaşdığı gün sizdən üz döndərənləri şeytan, məhz etdikləri bəzi əməllərlə yoldan çıxmağa məcbur etdi. Yəni gördünüz ki, Ühüd döyüşündə sizin bir qrupunuz düşmənə arxa çevirdi və məğlubiyyətə uğradı; bunun amili qabaqcadan mövcud idi. Onların daxili qüsurları vardı. Şeytan bunları qabaqca gördükləri işlərin köməyi ilə səhvə vadar etdi. Yəni qabaqkı günahlar təsirini cəbhədə göstərir; hərbi cəbhədə, siyasi cəbhədə, düşmənlə mübarizədə, quruculuq işində, təlim və tərbiyə işində, müqavimətin lazım olduğu yerdə, dəqiq dərkin lazım olduğu yerdə, insanın polad kimi kəsib irəliləməli və maneələri dəf etməli olduğu yerdə. Sözsüz ki, Nəsuh tövbəsinin edilmədiyi və həqiqi .bağışlanmağın istənmədiyi günahlar belədir

Həmin surədə başqa bir formada eyni məzmunu çatdıran bir ayə də var.(١) Quran demək istəyir ki, sizin məğlub olmanız və döyüşdə sizin üçün problemin yaranması təəccüblü deyil. Bu hadisələrdən indi də baş verir, öncə də baş vermişdir. Buyurur:

Neçə-neçə peyğəmbər bir yığın allahpərəstlə birlikdə (düşmənə qarşı) vuruşmuşlar. Lakin onlar Allah yolunda çəkdikləri müsibətlərə görə nə zəiflik, nə acizlik göstərmiş, nə də (kafirlərə) boyun əymişlər. Yəni sizə nə olub? Ühüd döyüşündə məğlub olduğunuza və bəzilərinizin



---

١- [٨٠] Ali-İmran/١۶۶.

öldürüldüyünə görə hamınız gərgin və narahat, bəziləriniz isə ümidsizsiniz. Xeyr! Öncəki peyğəmbərlər üçün də döyüş meydanında bəzi hadisələr baş verirdi. Onlar baş verənlərə görə zəiflik və ümidsizlik hiss etmirdilər. Sonra buyurur: Onların: "Ey Rəbbimiz, günahlarımıza və işlərimizdə həddi aşdığımıza görə bizi bağışla! Qədəmlərimizi möhkəmləndir və kafirlərə qələbə çalmaqda bizə kömək et!" – deməkdən başqa sözləri olmamışdır. Yəni keçmişdə peyğəmbərlərin səhabə və həvariləri döyüşlərdə və müxtəlif hadisələrdə çətinliyə düşəndə Allaha dua edib deyirdilər: Ey Rəbbimiz, günahlarımıza və işlərimizdə həddi aşdığımıza görə bizi bağışla! İlahi! Bizim günahlarımızı, israfçılıqlarımızı və işlərimizdə etdiyimiz diqqətsizlikləri bağışla! Bu əslində onu göstərir ki, hadisə və müsibət sizin günahlarla hazırladığınız vəziyyətdən irəli gəlir.

### Mənəviyyatın zəifləməsində, iradə və müqavimətin azalmasında günahın rolu

İnsanın etdiyi günahlar, bu müxtəlif yayınmalar, ehtirasdan, günyagirlikdən, tamahkarlıqdan, dünya malına hərislikdən, dünya məqamından yapışmaqdan, insanın əlində olan sərvətlərə qarşı xəsislikdən, həmçinin paxıllıqdan, tamahkarlıqdan və qəzəbdən irəli gələn bu işlər insanın vücudunda iki qəti təsirini buraxır. Biri mənəvi təsirdir; ruhu ruhanilikdən salır, nuranilikdən çıxarır, insanda mənəviyyatı zəiflədir, ilahi rəhmət yolunu bağlayır. Digər təsir budur ki, ictimai mübarizələrdə, əzmkarlığa, müqavimətə, insan iradəsinin iqtidar göstərməsinə ehtiyac duyulan yerdə bu günahlar insanın yaxasını tutur; əgər bu zəifliyi düzəldə bilən başqa bir amil olmasa, insanı çökürdür. Əlbəttə, bəzən digər amillər, məsələn, insanda yaxşı bir xüsusiyyəti və yaxud iş olub onu düzəldə bilər. İndi o yerlərdən söhbət getmir. Lakin öz-özlüyündə günahın təsiri budur.

### Allahın bəxş etdiyi bağışlanma və tövbə neməti

Allah-Taala insana bağışlanmaqdan ibarət olan böyük bir nemət vermiş və buyurmuşdur ki, siz təsirinin qaldığı bu işə görə peşman olmusunuzsa, tövbə və bağışlanmaq qapısı açıqdır. Siz etdiyiniz günahla sanki öz bədəninizə bir yara vurmuş, yaxud mikrob daxil etmisiniz. Bu zaman xəstəlik qaçılmaz olur. Əgər bu yaranın, xəstəliyin və bu zərbənin sizin bədəninizdəki təsirinin məhv olmasını istəyirsinizsə, bilin

ki, Allah-Taala məhz bu məqsədlə bir qapı açmışdır və o, tövbə, bağışlanmaq istəyi, Allaha qayıdış qapısıdır. Əgər

qayıtsanız, Allah-Taala bunu düzəldəcək. Bu, Allah-Taalanın bizə verdiyi böyük .nemətdir

Səhifeyi-Səccadiyyə kitabının ۴۵-ci duası olan mübarək ramazan ayı ilə vidalaşma duasında İmam Səccad (ə) Müqəddəs Rəbbin dərgahına deyir: Sən bəndələrinin əfvi üçün bir qapı açmış və onun adını Tövbə qoymusan. Qurandan və vəhydən bu qapın üçün bir bələdçi təyin etmisən ki, bəndələrin orada azmasınlar.(۱) Bir neçə cümlədən sonra yenə deyir ki, bu açıq qapıdan və ilahi bağışdan istifadə etməmək üçün heç bir bəhanə yoxdur. İlahi bağışın yolu da bağışlanmaq istəmək və tövbə etməkdir. .Allahdan bağışlanmaq istəməlisiniz

Əziz İslam Peyğəmbərindən (ə) nəql olunan bir rəvayətə əsasən, o həzrət bir gün səhabələrinə buyurdu ki, Allah-Taala bağışlamaq istəmədiyi şəxsdən başqa bütün günahkarları bağışlayar. Səhabələr soruşdular ki, ey Allahın rəsulu, Allah-Taalanın bağışlamaq istəmədəyi şəxs kimdir? Buyurdu ki, o şəxs tövbə etməyən şəxsdir. Deməli, bağışlanmaq istəmək tövbə və bağış qapısının açarıdır. Bağışlanmaq istəyi ilə ilahi əfvi qazanmaq olar. Bağışlanmaq istəyi bu qədər əhəmiyyətlidir. Allahdan .bağışlanma diləmək budur

Bu barədə iki-üç qısa məqama toxunmaq istəyirəm. Bəlkə bu ramazan ayında bunlardan istifadə edib Allah-Taalaya bir qədər yaxınlaşaq və Allahın bu açıq rəhmət qapısından bəhrələnək. Bu, bizim xalqımızın və cəmiyyətimizin dünya və axirəti və .bizim qarşımızda olan müxtəlif sahələrdə inkişaf üçün olduqca lazım və faydalıdır

## Qafillik və qürurdan uzaqlaşmaq – bağışlanma diləyinin mühüm şərti

Bir məsələ budur ki, əgər bağışlanmaq və bu ilahi neməti əldə etmək istəsək, iki xisləti özümüzdən uzaqlaşdırmalıyıq: qafilliyi və qüruru. Qafillik odur ki, insan ondan günahın baş verdiyini ümumiyyətlə bilməsin və buna diqqət yetirməsin. Bəzi insanlar belədirlər. İndi sayları ilə, az, ya çox olmaları ilə işim yoxdur. Hər halda, dünyada və insanlar arasında belə adamlar var. Onlar qafildirlər, günah edirlər, lakin onun baş verməsinə diqqət yetirmirlər. Yalan danışırlar, təxribat aparırlar, qeybət edirlər, zərər vururlar, dağıntı yaradırlar, qətl törədirlər, müxtəlif günahsız insanlara torba tikirlər, uzaq yerlərdə və geniş miqyasda xalqlar üçün qorxulu yuxular görürlər, xalqı azdırırlar və

bu səhv işləri gördüklərinə əsla diqqət də yetirmirlər. Əgər kimsə ona günah edirsən - !?desə, laqeydliklə qəhqəhə çəkib ələ salması da mümkündür: Günah?! Nə günahı



---

۱- [۸۱] Səhifeyi-Səccadiyyə, dua ۴۵.

Bu qafil insanların bəzilərinin ümumiyyətlə savaba və əzaba etiqadları yoxdur. Bəzilərinin isə etiqadları da var, lakin qəflət içərisindədirlər və ümumiyyətlə nə iş gördüklərini bilmirlər. Əgər bunu öz gündəlik həyatımızda bir qədər kiçiltsək, görəcəyik ki, həyatımızın bəzi hissələri qafillərin həyatına bənzəyir. Qafillik çox qəribə bir iş və böyük təhlükədir. Bəlkə də insan üçün heç bir təhlükə qafillikdən ciddi, heç bir düşmən .qafillikdən böyük deyil. Bəziləri belədirlər

Qafil insan heç zaman bağışlanmaq barədə düşünmür, ümumiyyətlə günah etdiyini xatırlamır. Günaha qərq olub, məst və yuxuludur, yuxuda hərəkət edən adam kimidir. Buna görə əxlaq və irfan alimləri əxlaqda və nəfsi paklamada yolçuların mənzillərini .bəyan edərkən insanın qafilikdən çıxdığı bu mənzilin adını Oyanış mənzili qoyurlar

Quran terminlərində bu qafilliyin qarşı tərəfi təqvadır. Təqva – sayıq olmaq və daim özünə nəzarət etməkdir. Əgər qafil insan onlarla günah edir və günah etdiyini əsla hiss etmirsə, təqvalı insan onun tam qarşı tərəfidir. Azca günah da etsə, tez başa düşür və onu düzəltmək fikrinə düşür: Allahdan qorxanlara şeytandan bir vəsvəsə toxunduğu (pis işlərə təhrik edildiyi) zaman onlar xatırlayıb düşünərlər. Şeytan onun yanından keçən kimi, şeytanın küləyi ona dəyən kimi tez şeytanın toxunduğunu, səhvə və .diqqətsizliyə uğradığını hiss edir və xatırlayır. Belə adamın gözü açıqdır

Mənim əzizlərim! Qardaşlar və bacılar! Kim olsanız, diqqətli olun. Bu müraciət xalqın xüsusi bir qrupuna aid deyil ki, məsələn, az məlumatlı insanlar, savadsız insanlar, yaxud gənc və azyaşlı insanlar ona diqqət yetirsinlər. Xeyr! Hamı diqqətli olmalıdır. Alimlər, görkəmli şəxsiyyətlər, böyüklər, kiçiklər, pullular, yoxsullar – hamı diqqətli olmalıdır; çünki ən azı bəzən qafillik onların da yaxasını tutur və diqqətsizlik edirlər; .günah edirlər, lakin günah etdiklərinin fərqinə varmırlar. Bu çox böyük təhlükədir

Mən və siz etdiyimiz günaha diqqət yetirmirik. Günah etdiyimizi bilmədiyimizdən ona görə tövbə də etmir və bağışlanmaq istəmirik. Qiyamət günü gözlərimiz açıldıqda görəcəyik ki, əməl dəftərimizdə qəribə şeylər var. İnsan təəccüb edəcək ki, mən bu işləri nə vaxt görmüşəm; ümumiyyətlə xatırlamayacaq. Bu, qafilliyin günahı və onun .eybidir. Deməli, bağışlanmaq istəyinin bir maneəsi qafillikdən ibarətdir

İkinci maneə qürurdur. İnsan kiçik bir iş görən kimi məğrur olur. Dua və

rəvayətlərimizdə Allah qarşısında məğrurluq ifadəsi işlənib. Səhifeyi-Səccadiyyənin cümə günləri oxunan ۴۶-cı duasında çox təsirli ifadələr mövcuddur. Deyir: Bədbəxtlərin .ən böyüyü Sənin qarşında məğrur olandır

Ən böyük bədbəxtlik Sənə məğrur olan şəxsə məxsusdur. Qürur belədir. Məğrur insan çox bədbəxtdir. Nə üçün? Çünki kiçik bir iş görən kimi, iki rükət namaz qılan kimi, məsələn, xalqa bir xidmət göstərən kimi, hansısa qutuya pul salan kimi, yaxud Allah yolunda bir iş görən kimi tez məğrur olur ki, biz Allah-Taala yanında işimizi düzəltmiş, borcumuzu ödəmişik və heç bir şeyə ehtiyacımız yoxdur. Bunu dillə söyləmir, lakin .qəlbində belə düşünür

Ehtiyatlı olun! Allah-Taalanın tövbə qapısını açıb "Mən günahları bağışlayaram" deyə buyurmasının mənası o deyil ki, günahlar kiçik və əhəmiyyətsizdir. Xeyr! Bəzən günahlar insanın bütün həqiqi vücudunu tələf edir, məhv edir, uca insani həyat dərəcəsində olan bir insanı çirkin və dəyərsiz yırtıcıya çevirir. Günah belədir. Elə bilməyin ki, günah kiçik şeydir. Yalan danışmaq, qeybət etmək, insanların ləyaqətini .alçaltmaq, bir sözlə olsa belə zülm etmək az və kiçik günahlar deyil

### **Günahı kiçik saymaqdan çəkinmək**

İnsanın günahkarlıq hissi keçirməsi üçün mütləq uzun illər günaha qərq olması lazım deyil. Xeyr! Bir günah da günahdır. Günahı kiçik saymaq olmaz. Rəvayətlərimizdə günahları kiçik saymaq bölməsi var, bunu məzəmmət etmişlər. Allah-Taalanın bağışlayarıq - deyə buyurmasının səbəbi budur ki, Allaha qayıdış çox mühümdür, nəinki günah az və kiçikdir. Günah çox təhlükəli bir şeydir, lakin Allaha qayıdış, diqqət və Allahın zikri o qədər əhəmiyyətlidir ki, əgər insan bunu səmimi və düzgün şəkildə yerinə yetirsə, o zaman əlacı çətin olan o xəstəlik sağalar. Buna görə yaxşı işlə məğrur olmaq sizin bağışlanmaq istəyi haqda düşünməmənizə gətirib çıxara bilər. Həmin yaxşı işi də biz yaxşı hesab edirik, əslində o qədər də yaxşı, yaxud çox da əhəmiyyətli .olmaya da bilər

İmam Səccad (ə) başqa bir duada deyir: Ey Allahım! Sən hətta ən sadiq bəndələrinin də Sənə yaxınlaşmaları ilə qürur etməmələrinə layiqsən. Baxın, bu duada həqiqətən çox gözəl məzmun və məna vardır. Yol budur. O buyurur ki, insanların bəndəlik məqamının yüksək dərəcəsinə nail olmuş ən sadiqlər də Allahın yolunu düzgün getdiklərinə, daha işləməyə və çalışmağa ehtiyaclarının qalmadığına görə məğrur olmamalıdırlar. Xeyr! Bu da bağışlanmaq istəyinə maneədir. Əgər qəflət olmasaydı, qürurlanmaq da

.olmazdı, aldanmaq və özünə heyranlıq da olmazdı və insan bağışlanmaq istəyərdi

## Bağışlanma istəyinin həqiqi və zahiri növlərinin fərqi

Bir məsələ də budur ki, həqiqi və ciddi bağışlanmaq istəyi təsirli olur. Fərz edin sizin böyük bir probleminiz var və Allah-Taaladan onun həll olunmasını istəyirsiniz. Məsələn, Allah eləməmiş, əzizlərinizdən biri üçün bir problem yaranmışdır. Siz adi yollarla onun problemini həll etməyə çalışmış, amma bacarmamısınız. İndi isə Allah-Taalaya üz tutub dua edir və yalvarırsınız. Görün insan belə bir halda, məsələn, övladının, yaxud əzizinin bir xəstəliyə tutulduğu, Allahın qapısına getdiyi və onda dua halının yarandığı zaman Allahdan necə istəyər?! Günahlarınızın bağışlanmasını Allahdan belə istəyin. Bağışlanmağı həqiqətən istəyin və həmin günahı bir daha təkrar .etməməyə qərar verin

Əlbəttə, insanın günah etməmək qərarı ola və sonradan yenə də onu təkrarlaya bilər. Bu zaman yenə tövbə etməlidir. Əgər insan yüz dəfə tövbəsini sındırsa da, yüz birinci tövbənin qapısı da açıqdır. Lakin tövbə edən və bağışlanmaq istəyən insanda əvvəldən .həmin səhv və günah işi təkrarlamaq qərarı olmamalıdır. Belə olmaz

Kitabda imamların birindən belə bir hədisin söyləndiyini gördüm: Dili ilə bağışlanmaq istəyən, amma qəlbində günahına görə peşman olmayan şəxs özünü məsxərə etmişdir. Yəni qəlbində günaha görə peşman olmayan və çox sevinən, amma dili ilə əstəğfirullah deyən şəxs özünü ələ salır. Bu neçə bağışlanmaq istəyidir?! Bu, bağışlanmaq istəyi deyil. Bağışlanmaq istəyi odur ki, insan qayıtsın; həqiqətən və ciddi şəkildə Allah-Taaladan onu bağışlamasını istəsin. Bu zaman insan həmin işi təkrarlamaq niyyətində ola bilərmi?! Belə bir insanın Allah-Taaladan bağışlanma !?diləməyə üzü gələrmi

Bu necə bağışlanmaq istəməkdir?! Bu bağışlanmaq istəyi kifayət etmir. Bağışlanmaq istəyi ciddi və həqiqi olmalıdır. Bağışlanmaq istəyi müəyyən bir qrupdan olan insanlara məxsus deyil ki, deyək onlar çox günah etmişlər və bağışlanmaq istəməlidirlər. Xeyr! Bütün insanlar, hətta peyğəmbərlər də bağışlanmaq istəməlidirlər. Allah sənin əvvəlki .və sonrakı günahlarını bağışlayacaq. Peyğəmbər (s) də bağışlanmaq istəməlidir

Bağışlanmaq istəyi ya bizim etdiyimiz günaha görədir, ya da əxlaqi günahlara görə. Fərz edin bir insan heç bir günah etməmişdir; nə yalan danışmış, nə qeybət etmiş, nə zülm etmiş, nə qanunu pozmuş, nə ehtiraslara uymuş, nə bir kəsi aşağılamış, nə xalqın

malına təcavüz etmişdir. Sözsüz ki, belə insanlar çox azdır. Lakin bu növ fiziki günahları etməyən insanların çoxu da duyğu günahlarına – əxlaqi günahlara düçar olurlar. Əgər heç bir günah etməyən həmin adam xalqa baxıb bu bədbəxt camaatın hamısı günah edir, amma biz Allahın lütfü ilə özümüzü saxlamışıq və günah etmirik – desə, yəni

özünü onlardan üstün hesab etsə, bunun özü bir günah, tənəzzül və süqutdur və onun üçün bağışlanma diləmək lazımdır. İnsanları təhqir etmək, özünü digərlərindən üstün tutmaq, öz işinə xalqın işindən daha çox dəyər vermək, yaxud insanlarda olan bəzi pis əxlaqi xarakterlər, məsələn, paxıllıq, tamahkarlıq və eqoizm üçün də bağışlanma .diləmək lazımdır

Fərz edək bu günahları etməyən bir insan da var, amma məsələn, tövhid elmini yüksəldə bilməmişdir. Bu bir qüsurdur və onun üçün bağışlanmaq istəməlidir. Tövhid və Allaha etiqad elmi məhdud və bağlı bir sahə deyil, sonsuz yoldur. Bütün peyğəmbər və övliyalar bu yolda inkişaf və təkamüldə olmuş, Pərvərdigarın müqəddəs zatı və Həzrət Haqqın kamal sifətləri barədə daha çox məlumat toplamağa çalışmışlar. Belə şəxslər bu yolda nə qədər inkişaf etməsələr, bu bir qüsur, gerilik, mənəvi acizlikdir və .onun üçün bağışlanmaq istəmək lazımdır

Bağışlanma diləmək hamı üçündür. Görürsünüz ki, bu dualarda imamların necə yanğısı var. Bəziləri elə bilirlər ki, İmam Səccad (ə) digərlərinə öyrətmək üçün belə yanğılı dua etmişdir. Bəli, işin həm formasında, həm də məzmununda digərlərinə öyrətmək var, lakin məsələnin məğzi bu deyil. Məsələnin məğzi bu saleh bəndənin, uca və böyük insanın özünün istəmək halətidir. Bu yanğı onun özünə aiddir. Allah qarşısında belə yalvarış onun özünə aiddir. Allah əzabından bu qorxu, Allaha yaxınlaşmağa və Allahın razılığına meyl onun öz hissləridir. Bu bağışlanmaq istəyi və Allahdan diləmək .həqiqətən onun özünə aiddir

O ucalıqda olan bir insanın nəzərində həyatın halal işlərinə – halal ləzzətlərə və halal işlərə diqqətin də bir növ süqut və tənəzzül hesab olunması mümkündür. Ürəyi istəyirdi ki, maddi və fiziki zərurətlər çərçivəsində qərarlaşmasın, həyatın halallarına və adi məsələlərinə bu yarımçıq baxışı da olmasın, mərifət yolunda, ilahi razılığa və ilahi dərkin cənnətinə sarı sonsuz vadidə daha çox irəliləsin. Bu baş tutmadıqda isə, .bağışlanmaq istəyir. Buna əsasən, bağışlanmaq hamı üçündür

Mənim əzizlərim! Bağışlanmaq istəyi üçün ramazan ayını qənimət sayın, Allah-Taaladan əfv diləyin. Bizim xalqımızın bu fədakar ruhiyyəsinə, göstərdiyi bu müqavimətə, gördüyü bu böyük işə, malik olduğu bu nurlu və yaxşı gənclərə, – bizim

cəmiyyətimizdən başqa heç bir yerdə bu qədər gənc yoxdur – bu qadınlara, kişilərə, analara və bu xalqın göstərdiyi müxtəlif fədakarlıqlara görə maddi və mənəvi, dünya və axirət sahələrində onun böyük inkişaf potensialı vardır. Bu xalq bağışlanmaq istəyi .ilə ilahi rəhməti özünə cəlb etməlidir

Hamınız bağışlanmaq istəyin. İbadət adamı olanlar, ibadətdə orta səviyyədə olanlar, hətta ibadət işində zəif olan və yalnız vacib əməllərlə kifayətlənənlər, hətta hərdən Allah eləməmiş, bəzi vacib ibadətlərini də tərk edən şəxslər – hamı və hamı bilməlidir ki, işləri aparan amil onlarla Allah arasındakı bu əlaqədir. Allah-Taaladan bağışlanmaq istəyin, əfv diləyin, Allahdan bu günah maneəsini götürməsini, Özünün lütf və mərhəmət günəşinin önündən buludları qaldırmasını, lütfünü bu qəlblərə və ruhlara .saçmasını diləyin. O zaman inkişaf və irəliləyişi görəcəksiniz

**Allah dərgahına dua**

Ey mənim Allahım! Səndən istəyir, Səni çağırır və Səni əzəmətli, ən böyük, ən izzətli, ən !şanlı və ən kəramətli adına, adlarının və övliyalarının hörmətinə and veririk

İlahi! Bizi öz saleh bəndələrindən et! İlahi! Bizə tövbə etmək, Sənə doğru qayıtmaq və sözün həqiqi mənasında bağışlanma diləmək səadəti nəsib et! İlahi! Müxtəlif sahələrdə həmişə bu xalqa bəxş etdiyin lütf və mərhəmət nurunu bu xalqa yenə də və öncəkindən artıq bəxş et! İlahi! Bizim səhlənkarlıqlarımızı, qüsurlarımızı və israflarımızı bağışla! İlahi! Səhvlərimizdən, nadanlıqlarımızdan və hörmətsizliklərimizdən ötrü bizə Öz rəhmətini və əfvini şamil et! İlahi! Pak və yaxşı bəndələrinin hörmətinə, bizim cəmiyyətimizdə, xalqımızda və burada iştirak edənlər arasında mövcud olan nurlu qəlblər hörmətinə, bizim qəlblərimizdən cəhalət tozunu və zülmət pərdəsini götür! İlahi! Səni tanımağı bizə nəsib et! İlahi! Öz yolunla və insani kamillik yolu ilə getmək səadətini bizim hamımıza nəsib et! İlahi! Bizim günahlarımızı bağışla! İlahi! Öz xeyir və lütfünü bu xalqa artır! İlahi! Bu xalqın, bu ölkənin, bu inqilabın düşmənlərinin – Sənə yad olanların, Səndən küsənlərin, Səndən uzaq gəzənlərin və Səninlə əlaqəsinə görə bu xalqla düşmən olanların şərini bu xalqdan uzaqlaşdır! Onların şərini özlərinə qaytar! Bu xalqı bütün işlərdə qalib et! İlahi! Bu ayda Quranla ünsiyyət və Quran bilgilərini dərk etmək səadətini bizə nəsib et! Öz rəhmət və əfvini ölənlərimizə, xüsusən böyük !imamımıza və əziz şəhidlərimizin pak ruhlarına şamil et

.Tehranın cümə namazı xütbələrindən: ۱۹۹۷

Əmirəlmömininin (ə) xüsusiyyətlərindən başqa birisi o həzrətin əfv diləməsidir. Mən bu xütbənin sonunda bu barədə bir neçə cümlə demək istəyirəm. Əmirəlmömininin (ə) duasının, tövbəsinin və əfv diləməsinin çox böyük əhəmiyyəti var. Bu şəxsiyyət vuruşur, mübarizə aparır, döyüşləri idarə edir, ölkəni idarə edir, o dövrün ən böyük ölkəsinə beş ilə yaxın başçılıq edir. Əmirəlmömininin (ə) hökumətinin ərazisi bu gün təxminən on ölkəni əhatə edir. Belə geniş bir ərazidə bu qədər iş var, bu qədər çalışır. Əmirəlmöminin (ə) kamil və böyük bir siyasətçidir və əslində bir dünyanı idarə edir. Onun siyasəti də, döyüşü də, ictimai idarəçiliyi də, cəmiyyətdə hakimliyi və insan hüquqlarını qoruması da möhtəşəmdir. Bunlar çox böyük, çoxlu zəhmət və səy tələb edən işlərdir, insanın bütün vaxtını alır. Belə yerlərdə bəsit düşüncəli insanlar deyirlər ki, bizim duamız və ibadətimiz də elə budur. Biz Allah yolunda işləyirik, işlərimiz Allahdan ötrüdür. Amma Əmirəlmöminin (ə) belə buyurmur; həmin işləri də görür, .ibadət də edir

Gördüyünüz bu dualar Əmirəlmömininin (ə) adi dualarıdır. Onun dua və münacatları gənclik dövründən başlanmışdır. Onda da onun işi çox idi. Peyğəmbərin (s) dövründə də inqilabçı bir gənc kimi həmişə səhnədə idi. O həmişə çalışırdı, boş vaxtı yox idi, amma onda da Peyğəmbərin (s) səhabələrindən kimin hamıdan çox ibadət etməsi haqda danışanda Əbu Dərda dedi ki, Əli (ə). Dedilər nə üçün? Nümunə və misal göstərib hamını qane etdi. Halbuki Əli (ə) o zaman iyirmidən bir qədər artıq yaşı olan .bir gənc idi. Ondan sonrası da bəllidir. Xilafət dövründə də elə idi

Əmirəlmömininin (ə) ibadətləri haqda müxtəlif əhvalatlar nəql olunmuşdur. Böyüklərimizin topladığı bu Əli (ə) səhifəsi kitabı Əmirəlmöminindən (ə) nəql olunan dualardır. Onun bir nümunəsi sizin cümə gecələrində oxuduğunuz Kumeyl duasıdır. Mən bir dəfə mərhum imamımızdan soruşdum ki, siz hansı duanı daha çox bəyənirsiniz. O bir qədər fikirləşib dedi ki, iki duanı: Kumeyl duasını və Şəban münacatını. Güman ki, Şəban münacatı da Əmirəlmöminindəndir (ə), çünki bir hədisdə bütün imamların onu oxuduqları söylənmişdir. Mən çox ehtimal edirəm ki, o da Əmirəlmöminindəndir (ə), söz və məzmunu da Kumeyl duasına bənzəyir. Kumeyl duası da möhtəşəm duadır. Bu dua bağışlanmaq istəyi ilə başlayır və Allahı on xüsusiyyətinə

and verir. Baxın, mənim ötən həftə dediyim bağışlanmaq istəyi budur: İlahi! Səni hər şeyi bürümüş rəhmətinə and verib, Səndən istəyirəm(۱). Allahı rəhmətinə, qüdrətinə



---

۱- Əs-Səhifə əl-Ələviyyə vət-tühfə əl-Mürtəzəviyyə, tərcümə edən: Rəsuli, səh: [۸۲] ۱۹۶.

əzəmətinə - on böyük xüsusiyyətinə and verəndən sonra deyir: Allahım, bağışla o günahlarımı ki, həya pərdələrini aradan qaldırar! Allahım, cəzaları endirən günahlarımı bağışla! Allahım, duaları həbs edən günahlarımı bağışla!(١) Əmirəlmöminin (ə) burada Allaha beş növ günahdan danışır: duanın önünü kəsən günahlar, əzab nazil edən günahlar və sair. Yəni duanın əvvəlindən sonuna qədər bağışlanmasını istəyir. Kumeyl duasının əsas məzmunu bağışlanma diləyidir, Allahdan əfv diləyən yanıqlı bir .münacatdır. Əmirəlmöminin (ə) budur. Bağışlanmaq istəyi budur

## Kamil və uca insanın xüsusiyyəti

Mənim əzizlərim! Ən yüksək və ən kamil insan Allah yolunda hərəkət edə bilən, Allahı özündən razı salan və ehtirasların əsiri olmayan insandır. Düzgün və kamil insan budur. Ehtirasın, qəzəbin, nəfsin, istək və hisslərinin əsiri olan materialist insan zahirən böyük olsa da, yüksək vəzifə tutsa da, çox kiçik insandır. Dünyanın ən böyük ölkəsinin prezdenti, yaxud ən sərvətli adamı öz nəfsinin istəkləri ilə mübarizə apara bilməsə, öz nəfsinə əsir olsa, kiçik insandır. Öz istəklərinə hakim olan, insan kamilliyi və Allah .yolundan ibarət olan düzgün yolu gedən yoxsul bir insan isə böyük insandır

Bağışlanmaq istəyi sizi o həqarətdən xilas edir. Bağışlanmaq istəyi bizi o boyunduruq və zəncirlərdən xilas edir. Bağışlanmaq istəyi Allah-Taalanın sizə verdiyi nurlu qəlbin pasını təmizləyir. Qəlb – insanın canı, ruhu və həqiqi kimliyidir. O, çox nurludur. Hər bir insan nurludur. Hətta Allahla rabitəsi və tanışlığı olmayan insanın da zatında nur vardır, lakin etiqadsızlıq, günah və ehtiras səbəbindən paslayır. Bağışlanmaq istəyi bu pası .təmizləyib onu parıldadır

## Ramazan – dua, tövbə və bağışlanmaq istəmək ayı

Ramazan ayı tövbə, dua və bağışlanma istəyinin zamanıdır. Qədr gecəsinin ehtimal olunduğu iki gecə - ١٩ və ٢١-ci gecələr ötdü, amma ٢٣-cü gecə qarşıdadır, onun qədrini bilin. ٢٣-cü gecənin əvvəlindən, yəni günəş batan zamandan sübh azanına qədər ilahi salamatlıq başlanır: O gecə dan yeri sökülənə kimi (büsbütün) salamatlıqdır! Ortadakı bu bir neçə saat ilahi salam, əmin-amanlıq və Allahın bütün yaranış üzərinə düşən rəhmət kölgəsidir. O gecə möhtəşəm gecədir; min ayla bərabər yox, hətta min aydan daha yaxşı, daha xeyirlidir. İnsanın min ay həyatı nə qədər faydalı ola, rəhmət və xeyir

qazandıra bilər? Bu bir gecə min aydan yaxşıdır. Bunun böyük əhəmiyyəti var. Bu gecənin



---

.İqbal əl-əmal, c. ٢, səh: ٧٠٧ [٨٣] -١

qədrini bilin, onu dua ilə, diqqətlə, təfəkkürlə, yaranışın əlamətləri barədə fikirləşməklə, insanın taleyi və Allah-Taalanın insandan istədiyi işlər barədə düşünməklə, bu maddi həyatın etibarsızlığı, gördüklərinizin hamısının can verən anda .qapısı açılan o biri dünyaya hazırlıq olduğunu düşünməklə keçirin

Mənim əzizlərim! Can verən anda biz başqa bir dünyaya daxil olacağıq. O gün üçün özümüzü hazırlamalıyıq. Bu dünyanın, bu sərvətlərin, Allah-Taalanın bu dünyada sizin vücudunuzda əmanət qoyduğu bu enerjilərin, Allahın bəşər üçün istədiyi məsələlərin - ədalətli hökumətin, rifahlı həyatın və digər amillərin hamısı insanın özünü o biri dünyaya hazırlaması üçündür. Özünüzü hazırlayın, Allahla ünsiyyət qurun, münacat edin, Allahı yada salın, bağışlanmaq istəyin. Allaha belə üz tutan, qəlbini paklayan, günahdan üz çevirən və xeyirli əməllərə qərar verən insanlar bu dünyanın problemləri ilə üzləşə bilən böyük varlıqlardır. Bir nümunəsi bizim böyük imamımızdır; digər nümunələri bizim öz cəmiyyətimizin möminləri - bu mömin və yorulmaz gənclər, bu qadın və kişilər, şəhidlər, müharibə əlilləri, əsirlikdə ağır zindanlara dözənlər, əzizlərinin ayrılığına dözənlər, müharibənin çətinliklərinə tab gətirənlər, bu gün minini dəfn etdiyiniz bu insanlardır. Bunların hər biri bir xalq üçün fəxr sayılan, uca tutulan və .örnək olan üstün və yüksək nümunələrdir

.Tehranın cümə namazı xütbələrindən: ۱۹۹۷

səh:۹۹

## Fitr bayramı – paklıq və mənəviyyat günü

Fitr və qurban bayramları haqda deyilənlərdən belə nəticə çıxır ki, bu şərafətli günlər paklıq və mənəviyyat günləridir. Bayram namazında oxunan bu iki surənin birində deyilir: Mənən təmizlənən insan həqiqətən nicat tapacaqdır.(١) Yəni özünü paklayan, öz ruhunu və qəlbini çirkinliklərdən xilas edən şəxs qurtuluşa – həyatda və yaranış məqsədinə çatmaqda uğura nail olmuşdur. İkinci rükətdə oxunan surədə isə buyurur: Nəfsini təmizləyən həqiqətən nicat tapacaqdır!(٢) Məzmun eynidir: yəni öz ruhunu, nəfsini təmizləyən insan qurtulub və nicat tapacaqdır. Hər iki surədə söhbət mənəvi .paklıqdan gedir

Bunlardan əlavə, bu gündə fitrə zəkatından ibarət olan vacib bir əməl də vardır. Zəkat insanın paklığına səbəb olan maliyyə əməliyyatıdır: Onların mallarından sədəqə (zəkat) al. Bununla onları mənən təmizləmiş, pak etmiş (mallarına bərəkət vermiş, əməllərinin savabını artırmış) olarsan(٣). Bu vacib əməli yerinə yetirmək və mal sədəqəsini vermək xalqın əskiklikdən, çirkinlikdən, tamahkarlıqdan, xəsislikdən və digər qəbahətlərdən .paklanmasına, ruhunun təmizlənməsinə səbəb olur

Əzizlər! Mənim qardaş və bacılarım! Namazda iştirak edən əzizlər! Deməli, fitr bayramı paklıq və təmizlik günüdür. Bu paklıq sizin bir ay oruc tutduğunuza, zəhmət çəkdiyinizə və özünüzü pakladığınıza görə də ola bilər, bundan əlavə, belə bir gündə bu kollektiv ibadətə qoşulduğunuza görə də. Hər halda, bu qətidir ki, müsəlman ramazan ayından .sonra və fitr bayramında paklıq və təmizlik səhnəsindədir

Siz özünüzü pakladınız, təmizlədiniz. Əgər düzgün oruc tutmuş və düzgün bayram namazı qılmışsınızsa – təbii ki, bu belədir – bu paklığın və ruh təmizliyinin qədrini bilin. Bir insanı xilas edən amil bu paklıq, insanları dərdə salan isə çirkinlikdir; əxlaqi çirkinlik, ehtiras və qəzəbdən doğan çirkinliklər, tamahkarlıqdan, xəsislikdən və digər əxlaqi qəbahətlərdən doğan çirkinliklər. Bəzi insanlar həmin çirkin əxlaqla dünyanı qaraltmış, .Yer üzünü çirkaba bulamış və Allahın nemətlərinə küfr etmişlər

## Bu gün bütün bəşəriyyətin paklıq sözünə ehtiyacı

İlahi quruluşdan və Quran hakimiyyətindən ibarət olan İslam Respublikası

quruluşunda insanlar öz mənəvi paklıqlarını digər quruluşlardan



---

۱- [۸۴] Əla/۱۴.

۲- [۸۵] Şəms/۹.

۳- [۸۶] Tövbə/۱۰۳.

daha yaxşı təmin edə bilirlər. Bunun qədrini bilin. Bu gün bəşər dünyasının sizin mənəvi paklıq sözünüzə ehtiyacı var. Dünyada baş alan bu zülmlər, ayrıseçkiliklər, hegemonluqlar, bir çox ölkələrdə insanların bədbəxtliyi, dünyanın inkişaf etmiş ölkələrində gənclərin avaralığı, qadın və kişinin uyğun olmayan əlaqələri, ehtiras çirkinlikləri, siyasi çirkinliklər, maliyyə çirkinlikləri insanların özlərini paklamaq haqda düşünməmələrindən irəli gəlir. Quran paklığa çağırır. Müqəddəs İslam Peyğəmbəri (s) .insanları paklaşdırır; həm namazı, həm zəkatı, həm orucu, həm də fitr bayramı ilə

İslam quruluşunda hamıya bu imkan var. Mənim əziz övladlarım! Qəlb və ruhlarının paklıq və nurluluq dövrünü keçirən oğlan və qızlar! Siz bu paklığın qədrini digərlərindən çox bilməli və onu qorumalısınız. Sizin ölkəniz Allahın lütfü və həmin paklığın sayəsində abad və azad olacaq, inkişaf edəcək, xarabalıqlar düzələcək, yoxsulluq, ayrıseçkilik, .bədbəxtlik və həyatın müxtəlif çətinlikləri bitəcək

Hamı Allaha sarı hərəkət etməli, Allaha əl açmalı, Ondan kömək istəməli, özünü pak saxlamağa və çirkinlikdən uzaq durmağa çalışmalıdır. Maliyyə işlərində çalışanlar maliyyə fəsadlarının təhlükəsi altındadırlar. Siyasi və ictimai işlərdə çalışanlar uyğun fəsadların təhlükəsi qarşısındadırlar. Ehtiraslı sahələrdə olanlar cinsi və ehtiras fəsadlarının təhlükəsi altındadırlar. Rəislər zülm fəsadının təhlükəsi qarşısındadırlar. .Bir iş üçün məsuliyyət daşıyanlar işdə xəyanət fəsadının təhlükəsi altındadırlar

Hamı ehtiyatlı olmalı, öz əməllərinə diqqət yetirməlidir və bu diqqət Fitr bayramı namazında bizim özümüzə və dinləyicilərimizə tövsiyə etməyə əmr olunduğumuz .təqvadır

İlahi! Bizim hamımıza təqva, mənəvi paklıq, vacib əməlləri yerinə yetirmək və düzgün !yolla getmək səadəti nəsib et

.Quruluşun yüksək vəzifəli şəxsləri ilə görüşdə çıxışından: ۱۹۹۷

səh:۱۰۱

Ramazan ayı mübarək aydır. Ramazanın faydaları bu ayda ilahi ziyafətə qoşulmaq istəyən müsəlmanların özlərindən başlayır, ürəklərdən başlayır. Bu ayın faydaları ilk öncə möminlərə, oruc tutanlara, bu müqəddəs və mübarək aya qoşulanların qəlbinə və ruhuna yönəlir. Bu ayda oruc tutmaq, Quran oxumaq, bu ayın müstəhəb duaları ilə ünsiyyət qurmaq insanı daxilən paklayır, təmizləyir, saflaşdırır. Bizim hamımızın bu .saflığa ehtiyacımız var

Hər bir müsəlman bu ayda özünə təqva və mənəvi paklıq ehtiyatı toplamağa ehtiyaclı olsa da, biz ruhanilərin buna digərlərindən çox ehtiyacımız var. Məşhur arif(١) deyir ki, Allahın bərəkəti olan su bütün çirkabları təmizləyir, ona toxunan hər bir şey pak olur, amma çirkab və murdarlarla təmas səbəbindən suyun özünün də saflanmaya ehtiyacı olur. Allah-Taala təbii bir prosesl ə suyu buxara çevirir, səmaya yüksəldir, sonra yenidən yağış damlaları formasında Yerə qaytarır; çirkabları ondan ayırır, suyu saflaşdırır və yenə pak su formasında insanların və digər məxluqların ixtiyarına .buraxır

Bu hikmətli sözün müəllifi deyir ki, sizin bu canınız, etiqadlarınız, nəsihətləriniz, qəlbinizin və ruhunuzun özü insanlardan çirkabları təmizləyən həmin pak sudur. Amma bu pak suyun özünün tədricən saflanmaya ehtiyacı olur. Onun saflanması da yalnız mənəvi bir yüksəlişlə, zikr və dua ilə hasil olan mənəvi proseslə təmin olunur. Bu pak su zikrlə, dua ilə, təvəssüllə, münacatla, ibadətlə, Allah qarşısında kiçilməklə, təbiətdə və insanda olan nişanələr haqda fikirləşməklə yenidən öz paklığını əldə edir, bəşərin və dünyanın cismi və ruhunda olan çirkabları təmizləməyə hazır olur. Buna .əsasən, ramazan ayı bu mənəvi yüksəliş üçün fürsətdir

Həmişə fürsət var. Şəban və rəcəb ayı da belədir. İbadət və zikr edənlər üçün ilin digər günləri də belədir: Sən yalnız zikrə tabe olan… kimsəni qorxuda bilərsən. Zikrə tabe olmaq – yəni yada salmaq və diqqət yetirmək bəşərin xilasına səbəb olur. İlin bütün günlərində, bütün gecələrdə, bütün axşamlarda Quran oxumaqla, Quran üzərində düşünməklə, bu dərin məzmunlu dualarda, xüsusən də Səhifeyi-Səccadiyyənin dualarında olan aşiqanə sözlərlə daxilən paklanmaq mümkündür. Lakin ramazan ayı

müstəsna bir fürsətdir. Bu ayın gecə və gündüzləri, hər saatı, hər dəqiqəsi insanlar, .xüsusən də gənclər üçün bir fürsətdir

Allahın lütfü ilə öz gəncliyini din və şəriətə xidmətlə və təbliğatla keçirən siz gənc hövzə tələbələri bu fürsətdən çox yararlanmalı və ramazan ayından öncəki bu bir neçə gündən özünüzü hazırlamalısınız. Siz mənim kimilərdən



---

.Məqsəd Mövlana Cəlaləddin Rumidir [۸۷] -۱

daha hazırlıqlısınız; həm psixoloji cəhətdən hazırlığınız çoxdur, həm işləriniz azdır, həm də daha mənəviyyatlısınız. Bunun qədrini bilin, bunu qənimət sayın, özünüzü daha ağır məsuliyyətlər qəbul etmək və daha böyük işlər görmək üçün hazırlayın. Bu cəmiyyətin, bu ölkənin, bu böyük dünyanın və bu tarixin sizin müqəddəs və pak səyinizə hələ çox .ehtiyac var. Bu fürsətlərdən maksimum istifadə edin

.Ruhanilərlə görüşdə çıxışından: ۱۹۹۷

səh:۱۰۳

## Ramazan ayında yaşamaq nemətinin şükrü

İlahi! Bütün vücudumuzla, bütün hiss və dərkimizlə Sənə şükür edirik ki, daha bir ramazan ayında yaşamaq, Sənin mübarək olan ilahi və mənəvi qonaqlığında bir dəfə də iştirak etmək səadətini bizə nəsib etdin. Əgər Allahın bu böyük lütf və mərhəməti bu dəfə bu ilahi ziyafətdən və ilahi nemətlər süfrəsindən həqiqətən bəhrələnmək uğuru ilə yanaşı olsa, ömrümüzün sonuna qədər dayanmadan bu nemət üçün şükür etsək də, lazımınca və həqiqi şükrü etmiş olmarıq. Bu ilahi ziyafətdə iştirak etməniz münasibəti ilə siz əziz qardaşları, əziz bacıları və namazda iştirak edənləri təbrik .edirəm

Bu gün birinci xütbədə əvvəla siz əziz qardaş və bacıların hamısını təqvaya çağırıram. Oruc tutmaqda məqsəd ilahi təqvadır. Ramazan ayının ən böyük səmərələrindən biri budur. Ümidvaram mən və siz bu ayın sayəsində öz rəftarımızda, danışığımızda, hiss və düşüncələrimizdə ilahi təqvanı və çox ehtiyatlılığı hakim edək və özümüzü insan kamilliyinə bir addım yaxınlaşdıraq. Bu gün bu mübarək ayda əsas vəzifə hesab olunan oruc haqda qısa söhbət edəcəyəm. Allah-Taala insanı tərbiyəyə ehtiyaclı yaratmışdır. İnsan həm xaricdən tərbiyə olunmalıdır, həm də daxildən özü-özünü tərbiyə etməlidir. Mənəvi məsələlər sahəsində bu tərbiyənin biri insanın düşüncəsinin və əqli qüvvəsinin tərbiyəsidir; bu tərbiyə təlim və təhsildən ibarətdir. Biri də nəfsin, insanda olan psixoloji qüvvələrin, qəzəb və ehtiras qüvvəsinin tərbiyəsidir; bu tərbiyənin adı mənəvi .paklıqdır

Əgər insan düzgün təlim görsə və mənəvi cəhətdən paklansa, zavodda gözəl formaya düşən xammal kimi olar, həm bu dünyada xeyrə, bərəkətə, dünyanın və qəlblərin abadlığına bais olar, həm də o biri dünyaya köçəndə, axirət aləminə qədəm qoyanda taleyi bütün insanların müştaq olduğu tale olar: yəni qurtuluş, əbədi və xoşbəxt həyat və cənnət. Məhz buna görə əvvəldən sona qədər bütün peyğəmbərlər təlimi və mənəvi paklamanı öz məqsədləri seçmişlər: Onları mənəvi cəhətdən paklayan, onlara kitabı və hikməti öyrədən bir peyğəmbər göndərdi(١). İnsanları həm ağıl və düşüncə .cəhətindən tərbiyə edirlər, həm də ruhi cəhətdən

## Oruc – gözəllik, güc və kamillik üçün ruhi idman

Mənə və sizə əmr olunan bütün ibadətlər və şəriət vəzifələri əslində sözügedən mənəvi paklıq, yaxud tərbiyə vasitələri və bizim kamilləşməmizdən ötrü idmanlardır. İdman etməyəndə bədəniniz gücsüz və zəif olur. Onu gücləndirmək, gözəlləşdirmək və müxtəlif istedadlarını aşkara çıxarmaq üçün



---

.Ali-İmran/۱۶۴ [۸۸] -۱

idman etməlisiniz. Namaz qılmaq idmandır; oruc tutmaq idmandır; maddi yardım etmək idmandır; günahlardan çəkinmək idmandır; yalan danışmamaq idmandır; insanlara xeyirxahlıq etmək idmandır. Bu idmanlarla ruh gözəlləşir, güclənir və kamilləşir. Əgər bu idmanlar edilməsə, zahirdə çox ürəkaçan görünməmiz mümkündür, amma daxilimiz nöqsanlı, arıq, kiçik və zəif olacaq. Bu idmanlardan biri də .orucdur

Oruc insanın yalnız yemək və içməkdən çəkinməsi deyil. Bu işlər niyyətli olmalıdır. Əgər bir gün hansısa problem səbəbindən, yaxud başınız qarışdığından on iki saat, on beş saat bir şey yeməsəniz, sizə heç bir savab verilməz. Lakin eyni işi niyyətlə gördüyünüzdə sizə dəyər bağışlayan və ruhunuzu qiymətli edən parlaq bir gövhər .olur

Orucun şərti niyyətdir. Niyyət nə deməkdir? Niyyət odur ki, bu əməli, bu hərəkəti, bu imsakı və bu məşqi Allah üçün, Allah yolunda və ilahi əmri yerinə yetirmək üçün edəsiniz. Hər bir işə dəyər bəxş edən budur. Buna görə, mübarək ayın birinci gecəsinin duasında belə oxuyursunuz: Ey mənim Allahım! Bizi niyyət və əməl edənlərdən et, bədbəxt olub səhlənkarlıq edənlərdən yox!(١) İstər mənəvi, istər maddi bir iş üçün .tənbəllik, könülsüzlük və passivlik bədbəxtlikdir

Oruc tutmaq ən yaxşı işlərdəndir. Zahirən iş görməmək olsa da, əslində hərəkətdir, əməldir, müsbət işdir. Çünki siz bunu niyyətlə edirsiniz. Odur ki, oruc tutmağa başlayarkən – yəni şəfəqin söküldüyü andan günün sonuna qədər daim bu niyyətlə .ibadət halındasınız. Əgər yatsanız da ibadət edirsiniz, yol yerisəniz də

Əziz Peyğəmbərdən (s) nəql olunmuşdur ki, ramazan ayında nəfəsləriniz subhanəllah zikri və yuxunuz ibadətdir.(٢) Yuxu necə ibadət ola bilər? Nəfəs almaq necə subhanəllah demək ola bilər? Bu ondan ötrüdür ki, siz bekar olsanız da, heç bir iş .görməsəniz də, bu niyyətdə olduğunuzdan daim ibadət halındasınız

Başqa bir hədisdə buyurur ki, oruc tutanın yuxusu ibadət, sükutu subhanəllah zikri, əməli və duası qəbuldur.(٣) Sizin sükutunuz ibadətdir, nəfəs almanız ibadətdir, yatmanız ibadətdir. Nə üçün? Çünki siz otuzgünlük ramazan ayı boyu Allah üçün imsak .edir və bəzi fiziki ləzzətlərə göz yumursunuz

Bu və digər ibadətlərdə olan əsas məsələ budur ki, insan onu rəzalətə çəkən və əsir edən ləzzətlərlə və nəfsinin istəkləri ilə mübarizə aparır. Nəfsi



---

.Əl-İqbal, c. ۱, səh: ۷۶ [۸۹] -۱

.Şeyx Səduq, Əl-Əmali, səh: ۹۳ [۹۰] -۲

.Səvab əl-əmal, tərcümə edən: Həsənzadə, səh: ۷۲۷ [۹۱] -۳

başlı-başına buraxmaq hünər deyil; bacardığı qədər ləzzət alması insan üçün kamillik deyil. Bu, heyvani işlərdəndir və insanda olan heyvani cəhəti gücləndirir. Əlbəttə, heyvani cəhət də bizdəndir və bizdə olmasını istəyiblər. Yemək, içmək, istirahət etmək, halal ləzzətlərdən bəhrələnmək bizim varlığımızdandır. Bunların eybi yoxdur və heç kəs bunları qadağan etməmişdir. Qadağan olan insanın bu cəhətdə qərq olmasıdır. Maddəçilik insanı bu cəhətdə qərq olmağa çəkir. Dinlər və ilahi üsulun da daxil olduğu əqli üsullar bu ləzzətlərin uçurumunda ixtiyarını əldən verib yuvarlanmaması üçün insanın önünü kəsirlər. Ləzzətlərdə heç bir sərhəd tanımamağa çağıran hər bir dəvət oda, bədbəxtliyə və həlakətə dəvətdir. Ümumi olaraq peyğəmbərlərin, həkimlərin və ilahi çağırışçıların dəvəti nəfsi bu ləzzətlərdən saxlamaq istiqamətindədir. Oruc da bu qəbildəndir. Məhz buna görə ramazan ayı hədislərdə münasib bir zaman sayılmışdır ki, insan bu ayda məşq edib bütün günahları .tərk etsin

## İnsanın bütün bədən üzvlərini və əməllərini əhatə edən həqiqi oruc

İmam Sadiqdən (ə) nəql olunan bir hədisdə Məhəmməd ibn Müslimə müraciətlə buyurur: Ey Məhəmməd! Oruc tutanda qulağın, gözün, dilin, ətin, qanın, dərin və tükün də oruc olsun.(١) İmam Sadiq (ə) özünün bu yaxın dostuna və şagirdinə buyurur ki, belə oruc tut, yalan danışma, mömin insanları bəlaya salma, sadəlövh adamları aldatma, müsəlman qardaşların və İslam cəmiyyəti üçün təxribat hazırlama, bədxahlıq etmə, onlara böhtan atma, ticarətdə aldatma, əmanətə vəfa et. Ramazan ayında öz nəfsini saxlayıb yeməyə, içməyə, nəfsi və cinsi istəklərə qarşı oruc olan insan öz dilini, gözünü, qulağını və bütün bədən üzvlərini də oruc bilməli, özünü Allah-Taalanın hüzurunda və günahlardan uzaq saymalıdır. Hədisin davamında buyurur ki, sənin oruc tutduğun gün digər günlər kimi olmasın, ramazan ayında adi günlər kimi .rəftar etmə, nəfsin tərbiyəsinə diqqət yetir və bu fürsətdən yaxşı bəhrələn

Başqa bir rəvayətdə Əmirəlmöminindən (ə) nəql olunmuşdur ki, nəfsin orucu cismin və qarının orucundan fərqlidir. İnsan nəfsinin orucu budur ki, onun beş hissiyyat orqanının hamısı günahlardan çəkinsin, qəlb bütün şər və fəsad amillərindən uzaq olsun.(٢) Allah-Taalaya və Onun bəndələrinə qarşı ürəyimizi təmizləyək. Bu barədə .hədislər çoxdur

Əziz qardaş və bacılar! Bu fürsətdən istifadə edək. Ramazan ayı özümüzü Allah yaxınlaşdırmaq, kamilliyə yaxınlaşdırmaq, fəsadlardan uzaqlaşmaq və

səh:۱۰۶

---

.Əl-Müqniə, səh: ۳۱۰ [۹۲] -۱

.Təsnif Ğürər əl-hikəm və dürər əl kəlim, səh: ۱۷۶ [۹۳] -۲

günahlardan təmizlənmək üçün çox böyük fürsətdir. Bu ayın duaları, bu ayda müstəhəb olan bağışlanmaq istəyi fürsətdir. Bu fürsətləri əldən vermək olmaz. Ramazan ayı tez bitəcək. Əgər növbəti ramazan ayına qədər sağ qalsanız, o da ildırım kimi ötüb-keçəcək, bu qiymətli fürsətlər əldən çıxacaq. Bunların hər bir günündən və saatından istifadə edin. Mən namazda iştirak edən siz qardaş və bacılara, xüsusən də gənclərə tövsiyə edirəm ki, ilahi rəhmətin bu baharından istifadə edib əfv diləyəsiniz, Allahın qapısına gedəsiniz, bədən, ruh, düşüncə və ürək günahlarından bağışlanmaq istəyəsiniz. Bu şəkildə ilahi əfvin və Allaha tövbənin mövcud olduğu bir cəmiyyət nurlu cəmiyyət olar və o nurun sayəsində Allah-Taala xeyir-bərəkətlərini nazil edər. Necə ki, inqilabın qələbəsindən sonrakı bu ١٨-١٩ ildə sizin bu pak qəlblərinizin və təmiz ruhlarınızın sayəsində Allah öz xeyir, bərəkət və mərhəmətini bu xalqa və bu ölkəyə nazil etmişdir. İlahi rəhməti qazanmaq və qorumaq üçün Allahın qapısına getmək .lazımdır

.Tehranın cümə namazı xütbələrindən: ١٩٩٨

səh:١٠٧

## Ramazan ayının əməllərinin çox mühüm olan dörd elementi

Namazda iştirak edən bütün əziz qardaş və bacıları bu faydalı və bərəkətli saatlarda, gündüz və gecələrdə Allah-Taala tərəfindən möminlərə bəxş edilən çoxlu faydalardan bəhrələnməyə və bu fürsətdən lazımınca istifadə etməyə çağırıram. Hamıya və özümə ilahi təqvanı, Allahı yada salmağı, Allah qarşısında öz əməllərimizə və sözlərimizə diqqət yetirməyi, qayalardan, uçurumlardan və insan nəfsinin asanlıqla keçə bilmədiyi yerlərdən ehtiyatlı olmağı tövsiyə edirəm. İnsan fərdi və ictimai həyatda Allah-Taalanın bu uçurumlardan keçmək üçün yaratdığı imkanlara diqqət yetirməlidir. Allah özlərini qoruyub məqsədə yaxınlaşmaq və mənzil başına çatmaq üçün möminlərin .ixtiyarında bəzi imkanlar qoymuşdur. Həmin imkanlardan istifadə etmək lazımdır

Bu məsələlərdən ehtiyatlı olmaq təqvadır və dəfələrlə eşitdiyiniz kimi, ramazan ayının gündəlik və mühüm məqsədlərindən biri bizim təqvalı olmamızdır: Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də vacib edildi ki, (bunun vasitəsilə) təqvalı olasınız(١). Mən ramazan ayının müqəddəs şəriət tərəfindən bəyan olunan əməllərinə baxanda, yəni bu ayın orucuna, Qurana, məsumlardan nəql olunmuş dualara və Həzrət Xaliqin nəzəri altında olan təvəssüllərə diqqət yetirəndə görürəm ki, çox mühüm olan bu dörd element (oruc, Quran, dua və təvəssül) arasında bizim üçün böyük əhəmiyyətə malik olan məsələ bağışlanma diləyidir; Allah-Taaladan qüsur, cəhalət üzündən və Allah eləməmiş, təqsirli şəkildə bizdən baş verənlər üçün .bağışlanma və əfv diləmək

## Bağışlanmaq istəyindən ibarət olan mühüm məsələni xatırlamaq

Mən ötən il mübarək ramazan ayının bu günlərində bu mübarək ayda tövbə etmək və bağışlanma istəmək barədə geniş söhbət etdim. Bu gün yenidən bu barədə bir elmi məsələ, yaxud Quran və hədis mövzusu kimi söhbət etmək niyyətim yoxdur. Sadəcə, çox mühüm və əziz olan mübarək qədr gecələrinin yaxınlaşması münasibəti ilə bu .məsələni yada salmaq istəyirəm

Mənim əzizlərim! Qardaş və bacılar! Birinci addım Allah-Taaladan bağışlanmaq istəmək və Allaha qayıtmaqdır. Tövbə odur ki, biz Allaha sarı qayıdaq. Siz harada olsanız, kamilliyin hansı həddində olsanız, hətta Əmirəlmöminin (ə) həddində olsanız

da, bağışlanma diləməyə ehtiyacınız var. Allah-Taala Peyğəmbərinə (s) buyurur: ;(Günahının bağışlanmasını dilə(۲



---

۱- [۹۴] Bəqərə/۱۸۳.

۲- [۹۵] Qafir/۵۵.

Rəbbini həmd-səna ilə təqdis et və Ondan bağışlanmağını dilə(١). Allah-Taala Quranda dəfələrlə Peyğəmbərinə (s) bağışlanmaq dilə deyə buyurmuşdur. Peyğəmbər (s) məsum olsa da, günah etməsə də və Allahın əmrindən çıxmasa da, ona .bağışlanmasını diləməyi əmr edir

Əlbəttə, ölvliyaların və böyük insanların bağışlanma diləməsinin növü başqa bir mövzudur. Onlar bizim kimilərin etdiyi günahlara görə bağışlanmaq istəmirlər. Onlar belə günahları etmirlər, onların məqamları ucadır. Onlar Allaha çox yaxın olduqlarından, bizə halal və bəlkə də müstəhəb olan bəzi işlər onlar üçün maneədir. Onlar bu məqama uyğun şəkildə bağışlanmaq istəyirlər; həm də bu, ciddi istəkdir, .formal deyil

Kumeyl duasına baxın. Rəvayətlərə görə bu dua Əmirəlmömininindən (ə) nəql olunmuşdur. O həzrət Kumeyl duasında əvvəldə əfv diləməyə başlayır. Əvvəlcə Allahı adına, qüdrətinə, əzəmətinə, calal və camal sifətlərinə and verir və sonra bağışlanmaq istəməyə başlayır: İlahi! Mənim həya pərdələrini yırtan günahlarımı bağışla(٢). Əbu Həmzə Sumali duası və bu böyük insanların etdiyi digər dualar da belədir. Mənim və sizin əfv diləməyə ehtiyacımız var. Ey əziz möminlər! Ey pak və təmiz qəlbli insanlar! Məbada məğrur olub deyəsiniz ki, biz günah etməmişik. Xeyr! Biz bilmədən və bilərəkdən çoxlu günahlara qərq olmuşuq. Bizim gördüyümüz yaxşı işlər Allahın nemətləri və ilahi şükrün haqqı qarşısında heç nədir. Biz layiqincə şükür edə bilmərik, bunu bacarmarıq. Məgər insan ilahi lütf və mərhəmətə bir an da ehtiyacsız ola bilərmi?! Həmişə möhtacıq, həmişə də Allah bizə lütf edir: Sənin xeyrin bizə nazil .olur.(٣) Biz isə layiqli şükür etməyə acizik və hər halda əfv diləmək lazımdır

### Qədr gecəsi – bağışlanma və üzr istəmək fürsəti

Qədr gecəsi bağışlanma və üzr istəmək üçün bir fürsətdir. Allah-Taaladan üzr istəyin. Allah-Taala mənə və sizə Ona sarı qayıtmaq, əfv diləmək və üzr istəmək şansı vermişsə, bundan istifadə edək. Əks təqdirdə, Allah-Taalanın Üzr istəmələri üçün onlara izin verilməz(٤) deyə buyurduğu bir gün gəlib çatar. Allah eləməmiş, qiyamətdə bizə üzr istəmək icazəsi verilməyəcək. Günahkarlara icazə verilməyəcək ki, ağızlarını açıb üzr istəsinlər. Ora üzr istəmək yeri deyil, burada isə imkan var, icazə var. Burada

üzr istəmək sizi bir pillə yüksəldir, günahlarınızı yuyur, sizi təmizləyir, nurlu edir. Odur -ki, Allah



---

۱- [۹۶] Nəsr/۳.

۲- [۹۷] İqbal əl-əmal, c. ۲, səh: ۷۰۷.

۳- [۹۸] Yenə orada.

۴- [۹۹] Mürsəlat/۳۶.

Taaladan üzr istəyin, burada imkan varkən Allahın diqqətini özünüzə yönəldin, Allahın lütf və məhəbbətini özünüzə şamil edin. Məni yada salın ki, Mən də sizi yada salım(١).

Qəlbinizi Allah-Taalaya yönəltdiyiniz və Allahı xatırladığınız anda Allah-Taalanın lütf, mərhəmət və şəfqət gözü sizə baxır, əfv və bəxşiş əli sizə sarı uzanır. Özünüzü Allahın yadına salın, əks təqdirdə elə bir gün gələcək ki, günahkarlara ünvanlanan ilahi müraciətdə deyiləcək: Biz sizi unutduq(٢). Gedin, biz sizi unutduq. Qiyamət səhnəsi belədir.

## Ramazanın il ərzində və qədr gecəsinin ramazan ayında ən yaxşı fürsət olması

Bu gün Allah-Taala sizə yalvarmaq və ağlamaq icazəsi vermişdirsə, əlinizi Ona sarı uzadın, məhəbbət bildirin, sevgi dolu göz yaşlarınızı səmimi qəlblərinizdən gözlərinizə axıdın, bu fürsəti fövtə verməyin. Əks təqdirdə, elə bir gün gələcək ki, Allah-Taala günahlaklara buyuracaq: Yalvarıb-yaxarmayın, bu gün Bizdən sizə heç bir kömək yetişməz(٣). Gedin, ağlayıb-yalvarmanızın faydası yoxdur. Allaha sarı qayıtmaq üçün bizə həyat fürsəti verilmişdir. İlin bəzi günləri ən yaxşı fürsətlərdir. Mübarək ramazan ayı və bu mübarək ayda olan qədr gecəsi də onlardandır.

Qədr gecəsi bu üç gecədədir. Mərhum Mühəddis Quminin nəql etdiyi bir rəvayətə görə, soruşdular ki, bu üç gecənin, yaxud ٢١ və ٢٣-cü gecələrin hansı qədr gecəsidir. Cavabda deyildi ki, insanın iki, yaxud üç gecəni qədr gecəsi bilməsi çox asan işdir. Bu üç gecə arasında şəkkə düşməyin əhəmiyyəti yoxdur. Məgər üç gecə nədir ki? Elə şəxslər olub ki, bütün ramazan ayını əvvəldən axıra qədər qədr gecəsi sayıb, həmin gecənin əməllərini etmişlər. Bunun qədrini bilin.

Öz Allahı ilə əlaqəsini belə düzəldib Allahın evinə gedən, Allahdan səmimi şəkildə istəyən və sədaqətlə Ona sığınan bir xalq heç zaman bədbəxt və başıaşağı olmaz, fəsada, xarlığa düçar olmaz, düşmənin əsirinə çevrilməz və daxili ixtilaflara getməz. Xalqların başına gələn bu fəlakətlər öz səhlənkarlıqlarına, qafilliklərinə, günahlarına və fəsadlarına görədir. Allahın qapısına gedən şəxs özünü günahdan çəkinməyə və məsumluğa bir addım yaxınlaşdırır.

Allaha sığınaq, Allahdan istəyək, Allah üçün işləyək, addım ataq və qəlbləri Allaha

.tapşıraq. Allahı xatırlamaqla mənəvi paklığını günbəgün artıraq

səh:۱۱۰

---

.Bəqərə/۱۵۲ [۱۰۰] -۱

.Səcdə/۱۴ [۱۰۱] -۲

.Möminun/۶۵ [۱۰۲] -۳

Ürəklər təmiz olanda, dünyaya çəng atmayanda, dünyanın və maddiyyatın əsiri olmayanda cəmiyyət həqiqətən nurlu, səmimi və pak cəmiyyət olur. Belə insanlar yaxşı çalışırlar, yaxşı işləyirlər, öz dünyalarını da yaxşı qururlar. Şəxsi dünyaya vurğun olmamağın mənası dünyanı abadlaşdırmamaq deyil. Dünyanı abadlaşdırmaq Allah üçün görülən və axirətə aid olan işlərdəndir. Maddi həyatın abadlaşmasına səbəb olan hər bir iş Allahın bizdən istədiyi iş və bir axirət əməlidir. O da Allahı xatırlamaqla baş .versə, daha yaxşı, daha asan, daha ürəkaçan və daha kamil şəkildə görüləcək

Bu günlərin qədrini bilin. Qədr gecələrinin həqiqətən qədrini bilin. Quran açıq şəkildə buyurur ki, bu gecə min aydan yaxşıdır.(١) Bu çox dəyərli məsələdir. Bu gecə mələklərin nazil olduğu, Ruhun nazil olduğu, Allah-Taalanın salamatlığa bürüdüyü bir gecədir. Salamın mənası insanlara ilahi salam, həm də sağlamlıq, sülh, əmin-amanlıq, insanlar və cəmiyyətlər arasında səmimiyyətdir. Mənəvi baxımdan belə bir gecədir. Qədr gecələrinin qədrini bilin. Ölkə məsələləri, öz işləriniz, müsəlmanların və İslam .ölkələrinin problemləri üçün dua edin

İslam ölkələrinin nə qədər problemləri var. Bu problemlərin həllini Allahdan istəyin. Bütün insanlar üçün dua edin; insanların hidayəti, özünüz, həyatınız, məmurlarınız, ölkəniz, ölənləriniz və Allah-Taaladan istədiyiniz hər bir şey üçün dua edin. Bu saatların və dəqiqələrin qədrini bilin. Mən siz əziz qardaş və bacılarımın hamısından istəyirəm ki, .bu mübarək qədr gecələrində dua edərkən bizi unutmayın

.Tehranın cümə namazı xütbələrindən: ١٩٩٨

səh:١١١

---

.Qədr/٣ [١٠٣] -١

## Fitr bayramı

Fitr bayramı – yaxşı əməl sahiblərinin mükafat aldığı və pis əməl sahiblərinin ziyan gördüyü gün

Fitr bayramı çox əzəmətli və mühüm bir gündür. Birinci xütbədə siz əziz qardaş və bacılara Əmirəlmöminindən (ə) bu gün haqda bir hədis söyləyəcəyəm. Ümidvaram ki, .həm özümə, həm də sizə nəsihət olacaq

Şeyx Səduq İmam Sadiqdən (ə) və o da babalarından nəql edir ki, fitr bayramında Əmirəlmöminin (ə) camaata buyurdu: Ey insanlar! Bu gün yaxşı əməl sahiblərinin mükafat aldığı və pis əməl sahiblərinin ziyan gördüyü gündür.(١) Ramazan ayını ibadətlə və mənəvi işlərlə keçirənlər bu gün Allah-Taaladan öz mükafatlarını alırlar. İxlaslı orucun, Quran oxumağın, gecə yarısı yuxudan oyanmağın, münacatın, duanın, maddi yardımların, ehsanın, siz əziz gənclərin və İslam həqiqətləri ilə tanış olan siz mömin xalqın mübarək ramazan ayında gördüyü bütün işlər bu gün ruhani aləmdə .sizə təqdim olunur

Bu gün qiyamət gününə ən çox bənzəyən gündür(٢). Bu gün yaxşı əməl sahiblərinin mükafat aldığı və pis əməl sahiblərinin ziyan gördüyü gün olduğundan qiyamət gününə bənzəyir. Dünya həyatını yaxşı əməllə keçirənlər qiyamətdə savab görəcək, qəlbləri və gözləri ilahi nəzərlə işıqlanacaq, lakin dünyanı qəflət içərisində, pis işlərlə, zülmkarlıqla, Allah-Taalaya itaətsizliklə, ehtiraslarla, eqoistlik və xudpəsəndliklə .keçirənlər o gün ziyan görəcəklər

Əmirəlmöminin (ə) bu bənzətmədən və bu zərif məqama toxunduqdan sonra belə tövsiyə edir: Bayram namazı qılmaq üçün evinizdən çıxdığınızda Rəbbinizə sarı getmək üçün qəbirlərdən çıxacağınız günü yada salın; namazda ayaq üstə durduğunuzda (qiyamət günü) Rəbbiniz önündə duruşunuzu yada salın; (namazdan sonra) evinizə qayıdarkən (qiyamət günü) cənnətdəki mənzillərinizə qayıtmanızı yada salın(٣). Bu gün olduğu kimi, o gün də yaxşı əməl sahibləri üçün savab və mükafat günü, günahkarlar .üçün isə zərər və ziyan günü olacaq

Ömrün hər bir anının qədrini bilin. Ömrünüzün saatlarından yaxşı işlər üçün istifadə

edin, özünüzü Allaha yaxınlaşdırın. vaxtınızı Allah yolunda çalışmaqla keçirin. Həyatın saatları, illəri ildırım sürəti ilə ötür. Qiyamət günü bu anları xatırlayacaqsınız. Xoş yaxşı !əməl sahiblərinin halına və yazıqlar olsun ziyankarların halına

.Fitr bayramı namazının xütbələrindən: ۱۹۹۸



---

.Şeyx Səduq, əl-Əmali, səh: ۱۰۰ [۱۰۴] -۱

.Yenə orada [۱۰۵] -۲

.Yenə orada [۱۰۶] -۳

## Ətirli və mübarək ramazan ayı – nur qazanmaq imkanı

Ramazan ayı ətirli, mübarək və əziz aydır, Allah ayıdır. Allaha şükür olsun ki, iki-üç ildir ölkədə yaxşı ənənə başlanmışdır; ramazan ayından öncədən bu aya hazırlıq üçün məscidlər abadlaşdırılır, ətirlənir, təmizlənir və bu mübarək ayın gəlişi hiss olunur. Xüsusən siz gənclər bu ayın ətrini öz pak və nurlu qəlblərinizdə bacardığınız qədər gücləndirin. Sizdə olan bu nurun parıltısı ətraf mühitinizə mütləq öz təsirini .bağışlayacaq

.Ruhanilərlə görüşdə çıxışından: ١٩٩٨

səh:١١٣

### Ramazan ayının gəlişi münasibəti ilə təbrik

Əvvəla mübarək ramazan ayının gəlişi münasibəti ilə namazda iştirak edən və oruc tutmuş siz mömin qardaş və bacıları, Allahın lütfü ilə etiqad, əməl və iman təməlləri müsəlman xalqlar arasında nümunəvi olan əziz xalqımızı təbrik edirəm. Ümidvaram bu ay bu ölkə, xalq və məmurlar üçün mübarək olsun! Allahın mənəvi və maddi bərəkətləri hamıya nəsib olsun! İkincisi isə bu fürsətdən istifadə edərək özümü və sizi .ilahi təqvaya çağırıram

### Ramazan – Allaha yaxınlaşmaq və insani xislətləri dirçəltmək fürsəti

Mənim əzizlərim! Oruc və imsak fürsətinin, ibadət və mənəviyyat şəraitinin qədrini bilək və özümüzü bir qədər Allaha yaxınlaşdıraq. Günahlardan uzaqlaşmaq, bacardıqca yaxşı və ibadət əməlləri etmək, özündə insani əxlaqı, rəftarı, xüsusiyyət və xislətləri bacardıqca gücləndirmək bu ayda hər kəs və hər bir toplum üçün bərəkət amili olan işlərdir. Qurandan dərs götürək, dualardan dərs və hikmət öyrənək. Öz yaranışımızın məqsədi haqda, öz Allahımızın böyük nemətləri və üzərimizə düşən böyük vəzifələr haqda bir qədər düşünək, fikirləşək; ölüm, Allahın sorğusu və ixlasla olduğu təqdirdə ibadət və əməllərin dəyəri barədə fikirləşək. Bu zaman ramazan ayı həqiqətən mübarək ay olacaq. Ümidvaram bu mübarək ayda bizim hamımız üçün belə .bir imkan yaransın

### İlahi vədlər

#### ;Duanın qəbul olunması .١

Bu gün birinci xütbədə Allahın duanın qəbul olunmasına dair vədi haqda bir qədər söhbət etmək istəyirəm. Ramazan ayında bizim vəzifələrimizdən biri dua etməkdir. Dua insanı Allaha yaxınlaşdırır, dini inancları insanın qəlbində həmişəyaşar və təsirli edir, imanı gücləndirir. Bundan əlavə, Allahdan istək dilənən duanın məzmunu qəbul və insanın istəyi təmin olunur. Yəni dua bir neçə cəhətdən böyük faydalara malikdir. Odur ki, Qurani-kərimdə dəfələrlə duadan və Allahın saleh bəndələrinin etdiyi dualardan söz açılmışdır. Onların hamısı bizə dərs verməkdən ötrüdür. Allahın peyğəmbərləri çətin anlarda Allaha dua edib kömək istəyirdilər: “Rəbbinə dua edib: “Mən məğlub olmuşam,

məni qalib et!” – dedi”.(۱) Bu, həzrət Nuhun (ə) dilindən nəql olunmuşdur. Yaxud həzrət Musanın (ə) dilindən belə nəql olunmuşdur: “Sonra Rəbbinə belə dua etdi: “Həqiqətən, bunlar günahkar bir qövmdür!”(۲) Musa Allaha şikayət etdi və Ona sığındı.



---

۱- [۱۰۷] Qəmər/۱۰.

۲- [۱۰۸] Duxan/۲۲.

Allah-Taala Quranın bir neçə ayəsində duanı qəbul edəcəyinə söz vermişdir. Biri bu mübarək ayədir: "Rəbbiniz buyurdu: "Məni çağırın, sizə cavab verim!"(١) Yəni sizin Rəbbiniz buyurub ki, Məni çağırın və Mən sizə cavab verim. Cavab vermək istəyi tam təmin etmək mənasında olmaya da bilər. Bəzən yaranış qanunları Allahın o istəyi tam təmin etməməsini tələb edə bilər. Bəzi qanunlar səbəbindən o istəyin təmin edilməsi, yaxud tezliklə təmin edilməsi mümkün olmaya bilər. Digər yerlərdə ümumi qayda kimi Allah-Taalanın cavabı sizin istəyinizi təmin etməkdir. Necə ki, ramazan ayının gecələrində oxunan şərafətli Əbu Həmzə Sumali duasında buna işarə vurulmuşdur. Quranda buyurmuşdur: "Allahın lütfündən (mərhəmətindən) istəyin! Şübhəsiz ki, Allah hər şeyi biləndir".(٢) Allah alim olsa və sizin ehtiyaclarınızı bilsə də, siz Allahdan istəyin və Ona deyin. Bu ayəni duada qeyd edir. Düzdür, şərafətli duada bir qədər fərqli göstərilmişdir. Sonra buyurur ki, ilahi, xalqı istəməyə dəvət etmək, ancaq istəklərini verməmək sənin xislətinə yaddır.(٣) Yəni Allahın səxavətinin, rəhmətinin və əhatəli qüdrətinin mənası budur ki, əgər istəmənizi deyirsə, istəyinizi verməyə də iradə etmişdir. Bu, Allahın sözügedən vədəsidir. Xütbənin əvvəlində oxuduğum həmin ayədə açıq-aşkar deyilir: "(Ey Rəsulum!) Bəndələrim səndən Məni soruşduqda (bilin ki,) Mən yaxınam. Dua edib Məni çağıranın duasını qəbul edərəm".(۴) Yəni Mənim bəndələrim nə zaman səndən harada olduğumu soruşsalar, ey Peyğəmbər, de ki, yaxınam, cavab verirəm, Məndən istəyən və Məni çağıran şəxsin duasını və istəyini qəbul edirəm. Kim Allahı çağırsa, qarşısında cavabı var. İmam Rzadan (ə) nəql olunmuş hədisdə də göstərilir ki, Allahdan istənilən hər bir istəyin qarşısında qəti bir cavab vardır.(۵) Bu çox mühüm məsələdir və Allahın mömin bəndələri onun qədrini bilməlidirlər. İmanı olmayan şəxs təbii ki, digər çoxlu imkanlar kimi bu imkandan da istifadə etməyəcək. Bu, Allahın qəti vədəsidir. Yəni Allah-Taala hər istəyə cavab verəcək. Bu bir vədədir və əlbəttə, hər bir vədənin də şərtləri var. Mən burada ilahi vədlər haqda olan ayələri toplamışam. İndi geniş danışmaq istəmirəm, amma ixtisarla bəzi məqamlara .toxunacağam



---

.Qafir/۶٠ [١٠٩]-١

.Nisa/٣٢ [١١٠]-٢

۳- [۱۱۱] Bihar əl-ənvar, c. ۹۵, səh. ۸۲. Hədis İmam Səccaddan (ə) nəql olunmuşdur.

۴- [۱۱۲] Bəqərə/۱۸۶.

۵- [۱۱۳] Bihar əl-ənvar, c. ۸۳, səh. ۵۸.

### Yaxşı əməl sahiblərinə mükafat və pis əməl sahiblərinə cəza verilməsi .۳ ,۲

Allah-Taalanın öz bəndələrinə verdiyi çoxlu vədlərdən biri də budur. Allahın vədlərindən biri budur: Kim saleh əməl etsə, özü üçün etmiş və kim pis iş görsə, özünə pislik etmişdir. Hər kəsin pisliyi özünə qayıdır. Allahın vədlərindən biri də budur: Biz yaxşı əməl edənlərin mükafatını zay etmərik. Allah-Taala yaxşı iş görənlərin mükafatını yaddan çıxarmaz. Bu yalnız axirətə məxsus deyil, dünya və axirətə aiddir; ya dünyada, ya axirətdə. Başqa bir vədə budur: Kim fani dünyanı istəsə, isədiyimiz şəxsə istədiyimiz neməti orada tezliklə verərik. Kim yaxın xeyri, yəni dünyanı məqsəd seçsə və axirətlə maraqlanmasa, biz onun məqsəd seçdiyinə kömək edərik; yəni onu məqsədinə çatdırarıq. Əlbəttə, bunun şərtləri var. Əgər çalışsa, zəhmət çəksə, o məqsədlərə çatar. Görürsünüz ki, bəzi xalqlar çalışdılar, zəhmət çəkdilər, qənaət lazım olanda qənaət etdilər və böyük yerlərə çata bildilər. Həmin ayənin ardınca buyurur: Mömin olub axirəti istəyən və onun uğrunda (can-başla) çalışanların zəhməti (Allah dərgahında) qəbul olunar. Onların və bunların hər birinə Rəbbinin nemətindən verərik. Dünyanı qazanmaq istəyənlərə də kömək edərik, axirəti qazanmaq istəyənlərə də. Burada dünya səyi Allahın razılığını qazanmaq qarşısında qeyd olunur. Buyurur ki, onlara da kömək edərik. Bu, xilqətin qanunudur. Bu, Allahın dünya üçün yazdığı qanundur. Yəni əgər səy göstərib zəhmət çəksəniz, mütləq nəticə görərsiniz. Allah-Taala heç bir səyi nəticəsiz qoymur, ardınca mütləq bir nəticə gəlir. Bəzən insanlar o nəticəni tanıya bilir, onu məqsəd seçir və ona da çatırlar. Amma bəzən o əməldən doğan nəticəni düzgün tanımır və başqa bir nəticə ardınca gedirlər, amma o əməl öz nəticəsini verir və hər halda, nəticəni görürlər. Buna əsasən, Allah-Taala heç bir səyi .mükafatsız qoymamışdır

### Möminlərin və saleh insanların Yer üzündə canişin olması .۴

Allahın başqa bir vədi budur: "Allah aranızdan iman gətirib yaxşı işlər görənlərə onları özlərindən əvvəlkilər kimi Yer üzünün varisləri edəcəyini söz vermişdir". Bu da qəti bir vədədir: hansı qövmün, hansı xalqın və hansı cəmiyyətin imanı və saleh əməli olsa, Allahın Yer üzündə canişini olacaq, yəni hakimiyyətə yiyələnəcək, bunun oyan-buyanı yoxdur. İmanı olanlar saleh əməli onunla yanaşı etdikləri zaman həmin hadisə baş verdi. Müsəlman İranda bu hadisə baş verdi. Bizim tariximizin hansı dövründə belə bir

vəziyyət yarandısa, həmin hadisə baş verdi: "Onları özlərindən əvvəlkilər kimi Yer üzünün varisləri edəcəyini, onlar üçün Allahın Özünün bəyəndiyi dinlərini (İslamı) ,möhkəmləndirəcəyini söz vermişdir". Əgər iman olsa, amma saleh əməl olmasa

Allahın Yerdəki canişini olmayacaqlar. Quru, boş və əməlsiz imanın nəticəsi yoxdur, .əməllə yanaşı olduqda isə, mütləq həyata keçəcək

### Allah yolunda cihad edənlərə yardım və hidayət .۵

Allahın başqa bir vədi budur: Bizim uğrumuzda çalışanları mütləq öz yollarımıza yönəldərik. Kim Allah yolunda çalışsa, Allah mütləq yolu ona göstərəcək. Biz gənclik çağında, İslam bilgiləri ilə tanışlığın əvvəllərində bunları oxuyurduq, deyirdik, etiqadımız vardı, inanırdıq, amma bizim üçün tam aydın deyildi. Bilirdik ki, Allahın sözü doğrudur, amma onu təcrübə etməmişdik. Bu gün isə təcrübə olunmuşdur. Siz gənclərin əsla yadınızda deyil, bəzi ortayaşlıların da yadında deyil, bəzilərinin isə yadındadır ki, İslam hərəkatı dövründə bu gün İslamın beşiyi və mərkəzi olan bu İranda, yaxud Tehranda kimsə yalnız özü müsəlman yaşamaq istəsəydi, həqiqətən mümkün deyildi, çətin idi. Yəni kimsə digərlərini hidayət və tərbiyə etmədən özü kamil şəkildə müsəlman yaşamaq istəsəydi, olmurdu, müxtəlif maneələr vardı. Əgər kimsə Qumda bir kişinin başladığı, bir qrup tələbənin də ətrafına toplaşdığı, fəryad qoparan kimi adamların tez tutulub zindana aparıldığı, vurulduğu, işgəncə verildiyi bu hərəkatın bir gün Allah adamlarının, həqiqət yolçularının dözümü və müqaviməti, hidayət olmuş və hidayət edən o şəxsin rəhbərliyi nəticəsində bütün ölkənin diqqətini özünə yönəldəcəyini, bütün qəlbləri cəzb edəcəyini və bütün xalqı səhnəyə gətirəcəyini desəydi, heç kəs inanmazdı. Əgər o zaman bir xalqın meydana qoşulması sayəsində hökumətin İslam hökuməti olacağını desyədilər, heç kim inanmazdı. Ancaq bu, Allahın .vədi idi və şərtlərə əməl olunduğuna görə həyata keçdi

Lazım deyil ki, dua həmişə təbii qanunları pozsun və onların ziddinə getsin. Xeyr! Dua təbii qanunlar çərçivəsində qəbul olunur və istəyiniz təmin edilir. Bu, Allahın qüdrətidir: qanunları təmin edir, bir-birinin yanına qoyur və sizin istəyiniz həyata keçir. Əlbəttə, sizin duanız başqa bir ilahi qanunla ziddiyyət təşkil etsə, qəbul olunmaz. Allahın vədi haqdır, lakin o biri vəd də düzgündür. İşsiz dayanıb, öz məqsədləri yolunda çalışmayan şəxslərin məqsədə çatmasına zəmanət verilmir. Sən dua etməyində ol, bəllidir ki, bu duanın qəbul olunmaq şansı çox deyil. Bəli, bir də gördünüz qəbul olundu, lakin buna zəmanət yoxdur. Siz təbiətin bir qanununun ziddinə dua etsəniz, qəbul olunmasına zəmanət verilməyəcək; baxmayaraq ki, bəzi yerlərdə, şübhəsiz, dua qanunları da

yarıb keçir. Lakin duanın qəbul olunduğunu deyiriksə, sizin duanızın digər ilahi qanunlarla ziddiyyətdə olduğu, yanında əməlin olmadığı, yaxud duanın özünün diqqətlə edilmədiyi təqdirdə, yenə də qəbul olunacağını

söyləmirik. Xeyr! Duada Allah-Taaladan həqiqətən istəmək lazımdır. Bu dua qəbul olunur. Əgər bu duanın yanında böyük məqsədlər yolunda əməl və fəaliyyət olsa, bu duanın qəbul olunmaq şansı doğrudan da çox olar. Dua davamlı olduqda onun qəbulolunma şansı çoxalır. Əgər bir dua bir neçə dəfə təkrar olunsa, amma qəbul olunmasa, məyus olmaq lazım deyil; xüsusən böyük məsələlərdə, insanın, ölkənin və xalqların taleyinə aid olan məsələlərdə. Çünki bəzən böyük işlərin həyata keçməsi .uzun zaman tələb edir

### Quranda Musanın (ə) əhvalatı – ilahi vədlərin həyata keçməsinə bir nümunə

Mən söhbətimin sonunda sizə bir Quran əhvalatı danışmaq istəyirəm. Qoy həm deyilənlərə misal olsun, həm də ramazan ayının cümə günündə qəlbləriniz işıqlansın! Musa (ə) zalım və müstəbid fironun hökumətində dünyaya gəldi. Bu oğlan uşağının öldürülməsi qəti idi, ana isə çıxış yolu axtarırdı. Əgər qız olsaydı, nigaran olmazdı. Ana ürəyi uşağının eşqi ilə yanır, amma nə edəcəyini bilmir. Bu zaman ilahi vəhy, ilham anaya deyir: Musanın anasına vəhy etdik ki, ona süd ver. Ona süd ver, qorxma, təhlükə çoxaldıqda, uşağın düşmən əlinə keçməsindən qorxduqda onu səndən almalarına izin vermə, suya at. Allah-Taala bu əhavalatı Quranın bir neçə yerində söyləmişdir; hər bir yerdə də bir gözəllik və incəliklə. Bu ana təhlükənin onu təhdid etdiyi bir şəraitə düşdü. Uşağı almaq üçün bu möhtərəm Bəni-İsrail ailsənin evinə tökülüşdülər. Musanın (ə) anası uşağın əldən çıxacağını anlayıb onu Nil çayına atdı. Çox mühüm məsələdir. Ana öz uşağını bir sandığa qoyub axar çaya necə ata bilər? Allah-Taala burada bu anaya iki vəd verdi: biri budur ki, uşağı sənə qaytaracağıq; ikincisi budur ki, onu şəriət sahibi olan mürsəl peyğəmbərlərdən edəcəyik: Biz Musanın anasına (ilham yolu ilə, yaxud röyada): “Onu (Musanı) əmizdir; elə ki ondan ötrü qorxdun, onu dəryaya at. (Uşağın suda boğulacağından) qorxma və (ayrılığına da) kədərlənmə. Biz onu sənə qaytaracaq, özünü də şəriət sahibi olan peyğəmbərlərdən edəcəyik!” – deyə bildirdik. Bu uşağı təlatümlü çaya atdıqan sonra Musanın bacısına dedi ki, onun ardınca get, gör nə baş verəcək və bu uşağın taleyi necə olacaq. Nəhayət, bu uşaq Nil çayı ilə fironun evinin yaxınlığına çatdı. Fironun ailəsi onu götürdü. Allah ürəklərinə saldı ki, onu saxlasınlar. Fironun xanımı dedi ki, bu uşağı özümüz üçün saxlayaq. Uşaq heç kimdən süd əmmədi; nə qədər dayə gətirdilərsə, heç birinin döşünü əmmədi. Acdır, süd istəyir. Bu arada Musanın bacısı gəlib dedi ki,

istəyirsinizsə mən bir süd verən tapım? Baxın, Allah-Taala duanı qəbul etmək və vədini .həyata keçirmək istədikdə şəraiti belə hazırlayır

Bu qızın ürəyinə salır və ona cəsarət verir ki, gəlib fironun məmurlarına belə bir təklif irəli sürsün. Onlar dedilər ki, eybi yoxdur. O gedib Musanın (ə) anasını gətirdi və dedi ki, bu qadın südverən qadındır. Musanı (ə) ona verdilər. Anasının ətrini duyub süd içməyə başladı. Burada fironun adamları şübhələnib onun bu uşağın anası olduğunu bilmədilər. Allah-Taala öz vədinə əməl etmək istəyir: Beləliklə, gözü aydın olsun, (oğlunun ayrılığına) kədərlənməsin və Allahın vədinin haqq olduğunu bilsin deyə, onu anasına qaytardıq. Bu vədin düzgün olduğunu özü gördü, amma sonrakı vəd budur: Onu şəriət sahibi olan peyğəmbərlərdən edəcəyik. Musanın (ə) illər sonrakı peyğəmbərliyinin xəbəri həmin yerdə verildi. Bütün Bəni-İsrail bilsin ki, bu uşaq peyğəmbər olacaq, Allah tərəfindən seçiləcək və sizi xilas edəcək. Elə də oldu. Əlbəttə, Allah-Taalanın bunu Musanın (ə) anasının qəlbinə ilham etməsindən onun Tur dağında peyğəmbərlik məqamına çatıb Bəni-İsraili xilas etməyə əmr olunmasına qədər otuz-qırx il zaman ötdü. Hədislərdə bəzi sözlər var, amma adam bu hədislərin sənədlərinə .çox da etimad etmir, lakin ayələrdən belə nəticə çıxır ki, ən azı otuz il ötdü

## Ramazan ayının qədrini bilməyə dair tövsiyə

Mənim əzizlərim! Ramazan ayıdır. Dua edin, duanın qədrini bilin, zamanın qədrini bilin. Böyük diləkləri, İslam ümmətinin ehtiyaclarını, İslam ölkəsinin ehtiyaclarını, öz xalqınızın ehtiyaclarını, öz şəxsi ehtiyaclarınızı yada salın, onları yalvarmaqla və ciddi şəkildə Allah-Taaladan istəyin. Hər kəs etdiyi duaya lazım olan əməli yerinə yetirməyə dair öhdəlik götürsün, onun üstündə dursun və Allah yolunda çalışmağa hazır olduğunu desin. Əlbəttə, bu çalışmaq həmişə döyüşmək, cəbhəyə getmək, döyülmək və bu kimi məsələlər demək deyil, yalnız bəzi yerlərdə elədir. Lakin həmişə sədaqətli olmaq, təməl və prinsip üzərində dayanmaq, gələcəyə ümid bəsləmək, düşməni düşmən bilmək deməkdir. Dua fürsətindən istifadə edin. Allah-Taala bu duaları qəbul və istəkləri təmin edəcək. Əgər bizim cəmiyyətimiz təqvalı, dua edən və mənəviyyatlı .cəmiyyət olsa, onun çoxlu maddi problemləri də, şübhəsiz, aradan qalxacaq

.Tehranın cümə namazı xütbələrindən: ۱۹۹۸

### Təqva – orucun ən mühüm faydası və nəfslə mübarizənin nəticəsi

Ey Allahın bəndələri! Sizin hamınızı və özümü təqvaya çağırıram. Ölümdən sonrakı həyatın azuqəsi təqvadır. Həyatda düzgün hərəkət etmək üçün insanın ehtiyatı təqvadır. Oruc tutmağın ən böyük faydası təqvadır. Hər bir insanın öz nəfsi ilə mübarizəsinin ən mühüm nəticəsi təqvadır. Qoca və gənc, qadın və kişi, hər hansı bir təbəqədən və hər hansı bir qrupdan olan mömin insanlar harada olsalar, təqva qazanmağa çalışsınlar. Təqva düşmən və düşmənliklər qarşısında toxunulmazlıq .yaradır. Təqva insanı düzgün və Allahın razı olduğu yola yönəldir

### ...Ramazan – bəndəlik tərənnümü

Ramazan – bəndəlik tərənnümü, təqva yolu, günahların bağışlanmasının amili və qəlblərin işıqlanmasının səbəbkarı

Əvvəla fitr bayramı münasibəti ilə namazda iştirak edən siz əzizlərin hamısını, bütün İran xalqını və bütün dünya müsəlmanlarını təbrik edirəm. Namazın qünutunda bu bayram haqda deyilir: Elə bir gün ki, onu müsəlmanlara bayram, Məhəmməd (s) və (Əhli-beytinə (ə) ehtiyat, şərəf, hörmət və üstünlük etmisən.(١)

Mənim əzizlərim! Ramazan ayını orucla, ibadətlə, Quranla, zikrlə, münacatla və dua ilə keçirdiniz. Ramazan ayı Allah bəndəliyinin tərənnümü, təqvaya doğru gedən aydın yol, günahların bağışlanmasının və qəlblərin işıqlanmasının səbəbkarıdır. Bu ayda Allah-Taala bəndələri öz ziyafətinə qəbul edir və onlar Allaha yaxınlaşırlar. Bu, böyük bir aydır. Allah-Taala bu ayın əzəmətli mərasimini elə tənzim etmişdir ki, asanlıqla və sadəliklə bitmir. Bu ibadət ayının sonunda elə bir bayram təyin etmişdir ki, hamı bir yerə toplansın, böyük bir gün olsun, müsəlman qardaşlar bir-birini təbrik etsinlər, ramazan ayının uğurlarının qədrini bilsinlər, Allah qarşısında borclarını hesablasınlar və bu şərafətli ayda qazandıqlarını qorusunlar. Həmin gün fitr bayramı günüdür. Deməli, fitr bayramı günü bayram olsa da, namazla başlayan, dua, təvəssül və zikrlə bitən ibadət günü, Allahı xatırlamaq və Allaha yaxınlaşmaq günüdür. Bu günün qədrini bilin, .təqva ehtiyatını qənimət sayın və fitr bayramını uca tutun

Bu gün namazın qünutunda Allaha dörd dəfə dediniz: Ey mənim Allahım! Mən Səndən

saleh bəndələrinin dilədiyi xeyri diləyir və ixlaslı bəndələrinin sığındığından Sənə sığınıram.(۲) Siz Allahın razılığını, Allaha yaxınlığı, Allah üçün əməl və ilahi bəndəlik səadətini istədiniz. Siz nəfsə, Allahdan qeyrisinə bəndə olmaqdan və Allaha şərik .qoşmaqdan Ona sığındınız



---

.İqbal əl-əmal, c. ۱, səh: ۲۸۹ [۱۱۴] -۱

.Yenə orada [۱۱۵] -۲

İslamda hər şey insanın islahına müqəddimədir. Bütün vacib əməllər, hökmlər, günahlardan çəkinmək, müstəhəb işlər, ictimai və fərdi hökmlər hamılıqla gözəl həyata, insan ruhunun dirçəlməsinə, insanın heyvanlıq və vəhşilik aləmindən yüksəlməsinə müqəddimədir. Əgər bəşər öz iradəsi ilə ilahi tərbiyə alsa, daxilində bu gözəl həyat yaranacaq və mühiti gözəlləşdirib təmizləyəcək. Əgər bu ilahi tərbiyə olmasa, insan Allahın yolu ilə getmək üçün möhtac olduğu iradəni əldən versə və özünü bəşəri istəklərə tapşırsa, heyvaniyyət həddində qalacaq, digər heyvanlardan da təhlükəli bir məxluq olacaq. Necə ki, insaniyyət tarixi boyu heyvan xislətli insanların peyda olub bəşəri Allah yolundan çəkindirdiklərini bilirsiniz. Fironlarda, qarunlarda, nəmrudlarda və təcəssüm olunmuş digər şeytanlarda da kamillik və tərəqqi istedadı vardı. Onlar da özlərinə gəlib düşünsəydilər, öz insani gövhərlərini yada salsaydılar, islah ola bilərdilər. Allah-Taala Musaya (ə) buyurur ki, fironla yumşaq danışın, bəlkə ayılıb Allahdan qorxdu.(١) Fironda da özünə gəlmək, Allahı xatırlamaq, daxilindəki insani gövhərini dirçəltmək imkanı vardı, amma azğınlıq qoymadı. Nəfsin azğınlığı, dünyagirlik azğınlığı, xudpəsəndlik azğınlığı, təkəbbür və insanda olan heyvaniyyət .ruhunun azğınlığı mane oldu

Mənim əzizlərim! Oruc insanda sözügedən heyvaniyyət ruhunu cilovlamaq üçündür. Namaz insanın Allah qarşısında kiçilməsi üçündür. İslamda olan bütün hərəkətlər, əməllər, görüləsi olan və olmayan işlər - hər bir şey bizim öz nəfsimizə hakim olmamızdan ötrüdür; vücudumuzda və daxilimizdə olan bu vəhşi fili nəsihət, moizə, Allahı yada salmaq və ilahi vəzifələr dəyənəyi ilə vurub ram etməmizdən ötrüdür. Bayram da bundan ötrüdür, oruc da bundan ötrüdür, namaz da bundan ötrüdür, cihad da bundan ötrüdür, İslam hakimiyyəti də buna şərait yaratmaqdan, qəlbləri Allaha yaxınlaşdırmaqdan, insanları Yer üzünü və dünyanı abadlaşdırmaqla yanaşı, onu .özünə son məqsəd seçməkdən yüksəkdə saxlamaqdan ötrüdür

İslam demir ki, dünyanı abadlaşdırmayın, elm öyrənməyin, təbiətdəki ilahi qanunları .öyrənməyə çalışmayın. Xeyr, əksinə, İslam insanı elmə və ağla sarı yönəldir

İslam düşüncə və elm baxımından cəmiyyətin səviyyəsini yüksəldir; insandan istəyir

ki, Yeri qursun, abadlaşdırsın, Allah-Taalanın bu dünyada yaratdığı, havada, torpaqda, günəşdə, suda və kainatda əmanət qoyduğu digər qüvvə və istedadları kəşf etsin, .özünün və digər insanların ixtiyarında qoysun



---

.Taha/۴۴ [۱۱۶] -۱

İslam insandan bunları istəyir. İslam istəyir ki, insanın məqsəd və arzusu yaxınında olan nağd imkanlardan ibarət olmasın, maddi həyatı, pulu, digərləri üzərində qələbəni, gücü, ehtiras və ləzzətləri özünə məqsəd seçməsin. İslam insanı bunlardan çəkindirir. .Və varlıq aləmində İslamın təşəbbüsü həyata keçməyincə insan rahat olmayacaq

.Xalqın müxtəlif təbəqələri ilə görüşdə çıxışından: ۱۹۹۹

səh:۱۲۲

## Oruc tutmağın üç mərhələsi

### İşarə

İlahi bir vəzifə kimi yad etdiyimiz oruc əslində ilahi bir şərafət, Allahın neməti və onu tutmağa müvəffəq olan insanlar üçün çox qiymətli bir fürsətdir. Düzdür, onun çətinlikləri də var. Bütün faydalı işlərdə çətinlik var. Bəşər çətinliklərə dözmədən bir şeyə nail ola bilməz. Oruc tutmaqda olan çətinlik orucla insana nəsib olanların müqabilində azdır; insanın az xərcləyib çoxlu qazanc götürməsi kimidir. Oruc üçün üç .mərhələ qeyd etmişlər. Bu üç mərhələnin hər biri öz sahibləri üçün faydalıdır

### Ümumi mərhələ (١

Bir mərhələ orucun ümumi mərhələsidir - yəni yeməkdən, içməkdən və digər haramlardan çəkinmək. Əgər bizim orucumuzun yeganə məzmunu bu imsak olsaydı da, çoxlu xeyirləri olmuş olardı. Bu həm bizi sınayır, həm də bizə öyrədir; bunda həm həyat üçün sınaq, həm də dərs var; təlim və məşqdir. Bu işdə fiziki idmandan olduqca əhəmiyyətli olan bir idman vardır. İmamlardan nəql olunan bəzi hədislərdə orucun bu mərhələsinə işarə vurulmuşdur. İmam Sadiq (ə) bir hədisdə buyurur: Allah-Taala orucu vacib etmişdir ki, varlı ilə yoxsul bərabər olsun.(١) Yoxsul adam gün ərzində hər istədiyini alıb yeyə və içə bilmir. Varlı adamlar isə könülləri çəkən və istədikləri hər bir şeyi ala bilirlər. Varlı adam yoxsulun halını, aclığını və ürəyi istəyəni almaqda çəkdiyi çətinliyi dərk etmir. Oruc tutanda isə hamı bərabər olur, öz ixtiyarları ilə nəfslərinin istədiyindən məhrum olurlar. İmam Rzadan (ə) nəql olunan başqa bir hədis isə başqa bir məqama toxunur. Bu hədisdə qiyamət gününün yoxsulluğuna, aclığına və susuzluğuna işarə vurulur. Qiyamət günü insanın çətinliklərindən biri də onun Allahın sorğu-sualı və mühakiməsi zamanı çəkdiyi susuzluq və aclıqdır. İnsan ramazan ayının aclıq və susuzluğunda qiyamət gününü yada salmalı və çox çətin olan həmin an .barədə fikirləşməlidir

İmam Rzadan (ə) nəql olunan başqa bir hədis isə aclıq və susuzluq çəkmək mərhələsində orucun başqa bir cəhətinə diqqət çəkir. Buyurur ki, oruc insana aclığa və susuzluğa tab gətirmək üçün dözüm verir.(٢) Nazla böyümüş, aclığı və susuzluğu dadmamış, onların nə olduğunu anlamayan insanlarda dözüm olmur, bir çox hallarda

çox tez əldən düşürlər, həyatın müxtəlif problemləri onları sıxır və əzir. Aclıq və susuzluğu dadmış insan isə bunların mənasını bilir, çətinliklər qarşısında dözməyi bacarır. Ramazan ayı hamıya bu dözümü bəxş edir. Bu barədə İmam Rzadan (ə) başqa bir hədis də nəql



---

.Mən la yəhzuru əl-fəqih, c. ۲, səh: ۳۷ [۱۱۷] -۱

.Üyun əxbar ər-Riza, c. ۲, səh: ۱۱۶ [۱۱۸] -۲

olunmuşdur. Bunlar bəlkə də bir hədisin iki hissəsi ola bilər: Allahın vacib etdiklərini yerinə yetirmək üçün təlim və riyazətdir.(١) Yəni ramazan ayında aclığa və susuzluğa dözmək, nəfsin istəklərindən çəkinmək insanı həyatın müxtəlif işlərini yerinə yetirməyə qadir edir. Təbii ki, məqsəd şəriətə uyğun olan ilahi və ixtiyari riyazətlərdir. İnsanı gücləndirən və həyatın çətin yollarını keçməyə qadir edən amillərdən biri çoxlarının istifadə etdiyi riyazət – məşqdir. Oruc şəriətə uyğun bir riyazətdir. Buna əsasən, oxunan bir neçə hədisdə görürsünüz ki, orucun bu mərhələsi – yəni aclıq və susuzluğa dözmək mərhələsi varlılarda kasıblarla bərabərlik hissini yaradır, insana qiyamət gününün aclığını yada salır, çətinliklər qarşısında dözüm bəxş edir, bir ilahi məşq kimi insana vacib əməlləri yerinə yetirmək dözümü bağışlayır. Yəni bu faydaların hamısı bu mərhələdədir; qarının yeməksiz olmasından və adi halda insana halal olan işlərdən çəkinməkdən əlavə, insana çox faydalı olan paklıq, nurluluq və zəriflik də .verir

### Qulağı, gözü, dili və ürəyi günahdan saxlamaq (٢

Orucun ikinci mərhələsi günahdan çəkinməkdir; yəni qulağı, gözü, dili, qəlbi və hətta bəzi rəvayətlərə görə bədənin dərisini və tükünü də günahdan saxlamaq. Əmirəlmömünindən (ə) nəql olunmuşdur ki, oruc tutarkən yemək və içmək kimi, haramlardan da çəkinmək lazımdır.(٢) Bu, oruc üçün daha üstün bir mərhələdir. Ramazan ayı insanın günahdan çəkinməyə alışması üçün əlverişli bir fürsətdir. Bəzi gənclər tez-tez bizə müraciət edib deyirlər ki, bizim günahdan çəkinməmiz üçün dua edin. Sözsüz ki, dua etmək yaxşıdır, lazımdır və edirik, amma günah etməmək insanın iradəsinə bağlı məsələdir. Siz günah etməməyə qərar verməlisiniz və qərar verdiyinizdə bu iş çox asan olacaq. Günahdan çəkinmək insanın gözündə bir dağ kimi görünür, lakin qərar verdikdə hamar bir yer kimi olur. Ramazan ayında hamının buna alışması üçün ən əlverişli şərait yaranır. Fatimeyi-Zəhradan (ə) nəql olunan bir hədisdə deyilir: Oruc tutanın dili, qulağı, gözü və bədən üzvləri günahdan qorunmasa, onun orucunun nə faydası?!(٣) Rəvayətə görə, bir qadın öz xidmətçisinə hörmətsizlik etdi. Güman ki, onlar Peyğəmbərin (s) qonşusu, yaxud məsələn, bir səfərdə o həzrətlə yoldaş olmuşdular. Əziz Peyğəmbər (s) əlindəki qidanı ona təklif edib buyurdu ki, ye. Qadın dedi ki, mən orucam. Rəvayətə əsasən, Peyğəmbər (s) buyurdu ki, xidmətçinə söyüş verdiyin halda sən necə oruc ola bilərsən?! Oruc tutmaq

---

۱- [۱۱۹] Yenə orada.

۲- [۱۲۰] Müstədrək əl-vəsail, c. ۷, səh: ۳۶۶-۳۶۷.

۳- [۱۲۱] Yenə orada.

yalnız yemək-içməkdən çəkinmək deyil.(١) Allah istəyir ki, oruc tutan insan günahlara və çirkablara sarı getməsin. Bu günahların bir qismi dil günahları, digərləri ilə pis danışmaq, onları aşağılamaqdır. Bu günahların bir qismi qəlb günahları, digərlərinə ədavət və kin bəsləməkdir. Bəzi günahlar şəriət mənasında günahlardır, bəziləri əxlaq günahlarıdır; müxtəlif dərəcələri var. Deməli, oruc tutmağın ikinci mərhələsi budur ki, insan özünü günahlardan saxlasın. Xüsusən siz əziz gənclər bu fürsətdən istifadə edin. Siz gəncsiniz. Gəncin həm gücü və bacarığı var, həm də qəlbinin təmizliyi və paklığı onun üçün bir fürsətdir. Ramazan ayı boyu bu fürsətdən yararlanın və oruc tutmağın .ikinci mərhələsi olan günahlardan çəkinməyi məşq edin

### Üçüncü mərhələ: Allahı unutduran amillərdən çəkinmək

Oruc tutmağın üçüncü mərhələsi insanın zehnin və ruhunu Allahdan qafil edən hər bir şeydən çəkinməkdir. Bu, oruc tutmağın ən yüksək mərhələsidir. Rəvayətə əsasən, Peyğəmbər (s) Həzrət Haqqa belə deyir: Ey Rəbbim! Orucun səmərəsi nədir?. Müqəddəs Rəbb cavab verir: Oruc hikmətə, hikmət biliyə, bilik yəqinə səbəb olur. Bəndə yəqinə çatdıqda isə necə yaşaması - çətinlikdə, yaxud rahatlıqda olması ilə öyünmür.(٢) Yəni oruc insanın qəlbində hikmət yaradır. Ürəyə hikmət hakim olduqda işıqlı və aydın bilik yaranır və bundan sonra yəqin hasil olur. Həzrət İbrahimin (ə) də Allah-Taaladan istədiyi bu yəqin ramazan ayının dualarında çox təkrarlanmışdır. Bir insan yəqinə çatdıqda həyatın bütün çətinlikləri ona asanlaşır, problemlərə məğlub olmur. Görün nə qədər əhəmiyyətlidir! Öz ömrü boyu kamillik yolu ilə irəliləmək istəyən bu insan həyatın problemləri, hadisələri və yolun maneələri qarşısında sarsılmır. İnsana bu qüdrəti bəxş edən yəqin oruc tutmaqla hasil olur. Oruc ürəkdə Allahın xatirəsini canlandırdıqda, Allahı tanımaq işığını yandırıb ürəyi aydınlaşdırdıqda ardınca bunlar gəlir. İnsana Allahı unutduran hər bir şey orucun bu mərhələsi üçün zərərlidir. Xoş o insanların halına ki, özlərini bu mərhələyə çatdıra bilirlər. Biz də arzu etməli, .Allahdan istəməli və bu mərhələyə yüksəlməyə çalışmalıyıq

.Tehranın cümə namazı xütbələrindən: ١٩٩٩

### Ramazan – çirkab və pasları təmizləmə fürsəti

Çox ətirli və mənəvi bir məclisdir. Əvvəla, mübarək ramazan ayıdır və ramazan ayı Allahın rəhmət yağışı kimidir; öz əlimizlə ətrafımızda, ruhumuzda və qəlbimizdə yaratdığımız çirk və pasları yuyub-təmizləyir, ürəyə nur bəxş edir. İkincisi isə bu məclisin iştirakçıları elə insanlardır ki, gördükləri işi düzgün niyyətlə görsələr – ümid edirik ki, bu belədir – Allahın ən yaxşı bəndələri sırasında dura bilərlər. Sizin gördüyünüz iş əhəmiyyətli, göstərdiyiniz təsirlər dərin və genişdir. Odur ki, niyyətlər qeyd olunan kimi olsa, dediyim dəlilə əsasən, sizi adi camaatla müqayisə etmək olmaz. Bu ölkəni və quruluşu idarə edən siz təsirli və mömin qardaşlar ramazan ayında oruc ağızla, mənəviyyat və orucluq ətri ilə ətirlənən nəfəslərlə buraya toplaşmısınız. Odur .ki, məclis mühüm məclisdir

### Quranda işlənmiş səkinə sözünün mənası

Mən ötən il bu məclisdə səkinə – vüqar haqda danışdım. Bu vüqarın – yəni arxayınlığın, aramlığın, iztiraba və təşvişə düşməmənin məmurlara təsiri budur ki, bir problem yarandıqda onlar həmin aramlığın sayəsinə düzgün qərar seçə bilir, əl-ayağa düşmür, iztirab və gərginlik hissi keçirmirlər, çətin və ağır hadisələr qarşısında bir dağ kimi dayanır, rahatlıq və dinclik yarandıqda da özlərini itirmirlər. Aparıcı insanlar üçün başqa bir təhlükə budur ki, əlləri bir yerə bağlanan kimi, əl-ayaqlarının açıq olduğunu, imkan və səlahiyyətlərin mövcudluğunu duyan kimi özlərinin itirir, tələsik qərarlar verir, digərlərini təhqir edir, öz eqoistliklərini aşkar edir və gücləndirirlər. Əgər ilahi vüqar və arxayınlıq olsa, bunun qarşısını alar, saman çöpü kimi hər yellə hərəkət edən kiçik insanlara xas işləri görmələrinə qoymaz. Bu vüqara sahib olan insan hər bir yelin, hər bir küləyin fırtına qopara bilmədiyi dərin bir okean kimidir. Vüqar yoxsulluqda və .varlılıqda, tənhalıqda və çoxluqda insanın işinə yarayır

Quranda bu barədə dəfələrlə söhbət açılmışdır – mən ötən il bir qədər danışdım. Məmurların bu vüqarı təsadüfən özünü göstərdi də. Bu il bizdə məmurların vüqarının təsirli olduğu hadisələr baş verdi; iqtisadi gəlirlərimiz azaldı, iqtisadi, siyasi və təhlükəsizlik problemləri yarandı. Bu ilin yayında Tehranda düşmənlər bəzi hadisələr törətdilər. Əgər insanlarda vüqar, aramlıq, Allaha təvəkkül və etimad, gələcəyə və

haqq meyarlarına inam olmasa, belə hadisələr zamanı və xüsusən bu hadisələri düşmənin planlaşdırdığını bildikdə əl-ayaqlarını itirərlər. Bu gözləniləndir və buna dair bəzi faktlar var. Düşmən imamın vəfatından sonra onillik bir proqram hazırladı. Bəlkə də bizim iqtisadi məsələlərimiz – neftin qiymətinin ucuzlaşması, siyasi məsələlər, bəzi mədəni

məsələlər, iqtisadi və təhlükəsizlik problemləri bu planlarla əlaqədardır. Bu, məmurların – yəni burada iştirak edən siz dostların vüqarına aiddir. Bəs xalqın vüqarı necə? Xalqın da vüqara və aramlığa ehtiyacı var. Aparıcı şəxslərin bu vüqarını ümumi xalqa necə ötürmək olar? Əlbəttə, xalqın çoxunun yaxşı, aydın və şəffaf imanı var. Xalq problemlərdə həqiqi bir iqtidara malik olduğunu göstərmişdir və bu iqtidar onların din və imanlarından qaynaqlanır. Lakin müəyyən bir qrup ölkənin və xalqın idarəsini öhdəsinə götürəndə bu sahədə özünü kənara çəkə bilməz. Bizim bütün vəzifələrimiz iqtisadi və siyasi vəzifələrlə məhdudlaşmır. Biz xalqın mənəviyyatı üçün də məsuliyyət daşıyırıq. Əgər xalq mənəvi və əxlaqi baxımdan geridə olsa, deyə bilmərik ki, bunun üçün cəmiyyətdə heç kim məsuliyyət daşımır. Əgər kimsə məsuliyyət daşıyırsa, bəs o kimdir? Şübhəsiz, ölkə məmurları özlərini kənara çəkə bilməzlər; hər biri bir növ və bir yolla məsuliyyət daşıyırlar. Deməli, xalqın mənəviyyatının məsuliyyəti də yuxarıdan .aşağıya qədər müxtəlif vəzifələrdə çalışan ölkə məmurlarının üzərinə düşür

### Təqva və onun fərdi və ictimai məsələlərdə vüqarla əlaqəsi

Burada başqa bir məsələ qarşıya çıxır və mənim oxuduğum ayədə ona işarə vurulmuşdu. Vüqarla əlaqəsi olan bu məsələ təqvadır. Bu ayədə söhbət küfr cəbhəsi ilə iman cəbhəsi arasındakı qarşıdurmadan gedir. Bu şərafətli ayədə küfr cəbhəsinə cahil təəssübkeşlik hissi aid edilmişdir. Hüdeybiyyə hadisəsi və Hüdeybiyyədən sonrakı hadisələr Peyğəmbərin (s) müqəddəs həyatı dövrünün çox mühüm, mənalı və məzmunlu sınaqlarındandır. Əziz Peyğəmbərin (s) və müsəlmanların Məkkə məqsədi ilə Hüdeybiyyəyə getdiyinə və Hüdeybiyyədə dayandığına görə düşmən onları məcburən müharibəyə çəkmək istəyirdi, amma əziz Peyğəmbərin (s) ilahi siyasəti buna imkan vermədi. Döyüşsüz qayıtdılar və Peyğəmbər (s) müşriklərlə bir müqavilə bağladı. Bu müqavilə o qədər mühüm idi ki, bir rəvayətə əsasən Fəth surəsi Hüdeybiyyə müqaviləsi barədə nazil olmuş və onu zəfər adlandırmışdır: Həqiqətən, Biz sənə açıq-aşkar bir zəfər bəxş etdik!; yəni Hüdeybiyyə sülhünü. O həzrət Quran .ayələri ilə vəziyyəti müsəlmanlara işıqlandırır və cəbhələri müəyyən edir

İslam quruluşunda həmişə diqqətdə qalması lazım olan məsələ cəbhələrin aydınlığı, haqq cəbhəsinin nahaq cəbhəsi ilə qarışmamasıdır. Nahaq cəbhəsi ilə keçinmək mümkündür, eybi yoxdur, hansısa bir yerdə ona dostuq əlinin uzadılması mümkündür.

Əgər yerində olsa, bunun eybi yoxdur. Lakin əsl xətlər heç zaman qarışmamalıdır. Haqqın kim olması, harada olması, nə üçün olması

və nə etmək istədiyi – məqsədinin, üsulunun, tədbirinin, taktikasının və işinin necə olması müəyyən olmalıdır; nahaqın kim olması, nə üçün olması, məqsədinin nə olması və nə iş görmək istədiyi də həmçinin. Bunları yaddan çıxarmaq olmaz. Bu sərhədi yaddan çıxarmaq heç bir haqq cəbhəsinin xeyrinə bitməyəcək. Heç kəs haqq tərəfdarlarını nə üçün haqq olduqlarını, indi nə etməli olduqlarını və qarşılarında kimin durduğunu bilmədikləri üçün təqdir etməz; hətta düşmənləri də onları təqdir etməzlər. Peyğəmbər (s) sərhədləri aydınlaşdırır və əvvəlcə kafirlərin vəziyyətini müəyyən edir. Peyğəmbərin (s) peyğəmbərliyi, zühuru, quruluşu və cihadı əsasən qarşı tərəfə təsir göstərmək, onları geri itələmək və özünün haqq dairəsini genişləndirməkdir. Küfr cəbhəsini görməzliyə vurmaq olmaz. Küfr cəbhəsi və haqq dəvətinin qarşısında dayanan şəxslər bəlli olmalıdır. Haqqın küfr cəbhəsinə münasibəti bəlli olmalıdır. Ümumiyyətlə haqq nə üçün vücuda gəlir? Nə üçün haqq dəvəti Allah tərəfindən peyğəmbərlərə ilham olunur, çatdırılır və onlar bunu təbliğ edirlər? Əgər insanların qurtuluş mesajından ibarət olan haqq mesajının yaranmasında fəlsəfə, hikmət və lüzum varsa və o mesajı daşıyanların – peyğəmbərin və peyğəmbər yolunun davamçılarının üzərinə məsuliyyət düşürsə, deməli, haqq cəbhəsinin məqsədinin nə .olduğunu və bu məqsədə necə çatmaq istədiyini bilmək lazımdır

İnsanın qurtuluşu hansı amilə bağlıdır? Hər halda, bu yalnız nəsihət və moizə ilə hasil olmur. Odur ki, haqq cəbhəsi – yəni bütün peyğəmbərlər nə zaman macal tapıb özlərini göstərə və bir addım ata bilmişlərsə, insanların qurtuluşa yaxınlaşması üçün bilməli olduqları həqiqətləri onların zehinlərində və daha doğrusu, həyatlarında həyata keçirmişlər. Bu, haqq cəbhəsinin işidir. Mübarizə tələb edən də budur. Nə üçün? Çünki haqqın qarşısında dayanan müxaliflər vardır. Əgər haqq insanların qurtuluşundan danışırsa, dünyada insanların əsarətindən danışanlar var. Əgər haqq ədalətdən danışırsa, ədalətin müxalifi, düşməni, yaxud zülmün tərəfdarı olanlar var. Əgər haqq Allaha pərəstişdən danışırsa, tanrılıq iddiası edənlər, Allahın varlığını və Allah qarşısında təslimçiliyi inkar edənlər var. Təbii ki, bunların hamısı mane olur və qarşı çıxırlar. Mübarizə olmasa, müxalifin qarşısında o mesaj nə bir iş görə bilər, nə də .zehinlərdə və ya real aləmdə həyata keçər

Əziz Peyğəmbər (s) kafirlərin vəziyyətini də müəyyən edir, zəif möminlərin də. Bunlar

yarımçıq idilər; ya münafiq idilər, ya da kəskin mənada münafiq deyildilər, ikiüzlülük etmirdilər, amma xarakterləri zəif idi. İslam bunları da mömin və möhkəm insanlara çevirmək istəyir. Bəzi müsəlmanlar qorxub Hüdeybiyyə döyüşündə Peyğəmbərlə (s) iştirak etməmişdilər. Deyirdilər ki, Peyğəmbər (s) və onunla gedən bütün müsəlmanlar kafirlər tərəfindən məhv

ediləcəklər. Peyğəmbər (s) qayıtdıqda o həzrətin yanına gəlib dedilər ki, biz gələ bilmədik, problemimiz oldu, işimiz çıxdı, indi bizim üçün Allah-Taaladan bağışlanmaq istə. Halbuki bu söz də bir növ aldatmaq idi. Bunlar əslində ilahi əfvi də istəmirdilər. Elə bilirdilər ki, getməməklə zirəklik etdilər. Quran ayəsi buyurur: (Hüdeybiyyə səfərindən) geri qalan bədəvi ərəblər sənə deyəcəklər: "Mal-dövlətimiz və ailələrimiz başımızı qatdı (səninlə yola çıxa bilmədik), (Allahdan) bizim bağışlanmağımızı dilə!" Onlar ürəklərində olmayanı dilləri ilə deyirlər(١). Qəlblərində olmayan bir şeyi dilləri ilə deyirlər. Demək olmaz ki, bunlar münafiq, kafir və düşməndirlər. Xeyr, zəif ruhlar, zəif qəlblər və zəif insanlar problem zamanı rol oynaya bilmirlər. Bu, İslam quruluşunun, İslam cəmiyyətinin, İslam məmurunun, İslam müdirinin məsuliyyət daşıdığı .mənəviyyatdır

## Bütün problemlərin əlacı olan təqvanın əhəmiyyəti

Əziz dostlar! Qardaş və bacılar! Biz nə zaman təsirli ola bilərik? Təqvalı olduğumuzda, onu özümüz üçün dəyişməz yol, haqq sözü və daimi vəzifə bildikdə. Təqva sözdə, əməldə, qərarda, tabeliyimizdə olanlarla və çalışdığımız kollektivlə münasibətlərdə nəzərə alınmalıdır. Bu münasibətlər onlara, onların rəftarı da xalqa dərsdir. Hər halda, bizim bu ayədən və başqa çoxlu ayələrdən öyrəndiyimiz odur ki, təqva həm bir vasitə, həm də bir əlacdır. Təqva yalnız vəzifə deyil; yalnız ona görə deyil ki, Allah-Taala sorğu-sual zamanı bizdən təqva haqda soruşacaq. Əlbəttə, əgər anlayıb diqqət yetirsək, bu da böyük məsələdir. Biz məmurlar Allahın sorğu-sualını, hesab gününün ağırlığını və çətinliyini unuduruq. Vəzifəmiz nə qədər yüksək olsa, bu təhlükə daha çoxdur. Bilməliyik ki, Allah-Taala bizimlə öz rəhməti və lütfü ilə əməl etməsə, işimiz çox çətin olacaq. Çəkdiyimiz xərclərin, təsərrüfatımızın, müraciət edənlərlə və xalqla rəftarımızın xırdalıqları - bunların hamısı üçün Allaha hesab verməliyik. Allahın sorğu-sualını və mühakiməsini düşünməkdən əlavə, təqvanın yolu açdığını da bilmək lazımdır: Kim təqvalı olsa, Allah ona (hər çətinlikdən) bir çıxış yolu göstərər və gözləmədiyi yerdən ruzi verər(٢). Təqva bütün dalanlarda - xüsusən də ictimai dalanlarda insanın çıxış yolunu tapmasına səbəb olur. Böyük dalanlarda məmurların təqvası onlar üçün nicat yolu açır: Ona gözləmədiyi yerdən ruzi verər. Bizim fikirlərimiz həmişə dəqiq olmur. Deməli, əsas məsələ təqvadır. Bizim tövsiyəmiz də budur, bu ayın .orucu da təqvaya köməkdir. Bu təqva ilə xalqın problemlərini həll etmək lazımdır

Mən burada oxumaq üçün bir hədis seçmişəm. Bu hədis Şeyx Müfidin İrşad kitabındandır. Mən hədisin mətnini çox böyük imamımızın gözəl kitabı olan qırx hədis kitabından nəql edirəm, lakin İrşadla müqayisə etmişəm. Hədisi Şeyx Müfid nəql edir. Rəvayətçi deyir ki, biz İmam Sadiqin (ə) yanında olarkən Əmirəlmöminindən (ə) söz düşdü və o, Əmirəlmöminini (ə) təriflməyə başladı. İmamın dediklərini bu rəvayətçi yadında saxlamış, yaxud həmin məclisdə və ya sonradan yazmışdır. Mən baxıb gördüm ki, bu hədisdə söylənənlərin hər biri Əmirəlmömininin (ə) həyatının təxminən bir cəhətinə işarədir; o həzrətin zahidliyinə, ibadətinə və indi oxuyacağım digər xüsusiyyətlərinə. Bu hədisə görə İmam Sadiq (ə) Əmirəlmöminini (ə) təriflәyərkən birinci cümlədə belə buyurur: And olsun Allaha! Əli ibn Əbu Talib (ə) dünyanın bir haram tikəsini də yemədi.(١) Yəni haramdan çəkindi, haram maldan və haram mənfəətdən çəkindi. Burada məqsəd həqiqi haramdır, hökmü haram olan yox. Yəni belə çıxır ki, şübhəli tikəni də ağzına aparmadı (və bilmədən olsa belə, haram yemədi). Baxın, bunları əməl və ondan da üstünü, düşüncə örnəyi kimi bizə bəyan etmişlər. İmam Sadiq (ə), İmam Baqir (ə) və İmam Səccad (ə) etiraf edirlər ki, biz belə yaşaya bilmərik. Növbə mənim kimilərə çatdıqda isə müsibətdir. Söhbət bundan getmir ki, mən, yaxud siz belə yaşayaq. Xeyr! O həyat tərzi zirvənin həyat tərzidir, zirvəni göstərir. Bunun mənası odur ki, hamı o səmtə hərəkət etməlidir. Zirvəyə kim çata bilər .ki?! Bir hədisdə İmam Səccad (ə) buyurur: Mən belə yaşamağa qadir deyiləm

İmam Sadiq (ə) hədisin davamında buyurur ki, Əmirəlmöminin (ə) üçün hər ikisi Allahın razı olduğu, hər ikisi halal, yaxud ibadət olan iki iş və iki seçim qarşıya çıxanda o, çətini seçirdi. Əgər iki halal xörək vardısa, daha pisini götürürdü; iki halal paltar vardısa, daha pisini götürürdü; iki halal iş vardısa, daha çətinini seçirdi. Baxın, bu, adi bir natiqin söhbəti deyil, bu hədisə görə, danışan İmam Sadiqdir (ə); yəni sözündə dəqiqdir. Görün həyatda və dünya nemətlərində özünə qarşı tələbkarlıq nə qədər əhəmiyyətli .məsələdir

Buyurur ki, Peyğəmbərin (s) mühüm bir işi olanda birinci onu çağırırdı. Çünki ona etimadı vardı və əvvəla, işi yaxşı yerinə yetirəcəyini, ikincisi, çətin işdən qaçmayacağını, üçüncüsü isə Allah yolunda mübarizəyə hazır olduğunu bilirdi.

Məsələn, Peyğəmbərin (s) məxfi şəkildə Məkkədən Mədinəyə getdiyi gecə kimsə onun yatağında yatmalı idi. Peyğəmbər (s) bu işi Əliyə (ə) tapşırdı. Döyüşlərdə Əmirəlmömininini (ə) öndə göndərirdi. Mühüm işlərdə - qarşıya çıxan hər bir əsaslı və önəmli məsələdə birinci Əlini (ə) səsləyirdi. Çünki ona



---

.Əl-İrşad, c. ۲, səh: ۱۴۱ [۱۲۶] -۱

etimadı vardı, onun qayıtmayacağını, qorxmayacağını, işi yaxşı yerinə yetirəcəyini bilirdi. Baxın, söhbət bundan getmir ki, mənim kimi kiçik və zəif adamlar belə işləmək istədiklərini iddia etsinlər. Xeyr! Söhbət bundan gedir ki, biz bu istiqamətdə hərəkət etməliyik. Əlinin (ə) davamçısı olan müsəlmanın xətti bu olmalı və bu xətdə bacardığı qədər irəliləməlidir. Sonra buyurdu: Bu ümmətdə ondan başqa heç kəs Allahın rəsulu (s) kimi rəftar etməyə qadir deyildi.(١) Peyğəmbər (s) kimi hər yerə gedən o idi. Başqa heç kim Peyğəmbərin (s) ardınca gedə və o həzrət kimi hərəkət edə bilmirdi. Allahın bəyəndiyi bütün bu böyük və mömin işlərlə yanaşı, o, qorxu və ümid arasında idi. Allahdan elə qorxurdu ki, sanki onu cənnət və cəhənnəmin arasında saxlamışdılar, bir tərəfdə cənnəti görürdü, bir tərəfdə cəhənnəmi: Bunun savabına ümid bəsləyir və onun əzabından qorxurdu. Bu cümlənin xülasəsi odur ki, bütün bu işlərlə, bütün bu maddi yardımlarla, bütün bu ibadətlərlə məğrur olmurdu. Biz indi iki rükət müstəhəb namaz qılanda, bir neçə cümlə dua oxuyanda, yaxud gözümüzdən iki damla yaş axanda tez məğrur oluruq ki, bəli, biz beləyik. Amma Əmirəlmöminin (ə) bu qədər .saleh əməllərə rəğmən, məğrur olmurdu

Əmirəlmöminin (ə) kimi, Peyğəmbər (s) kimi, İmam Səccad (ə) kimi şəxslər - Allah ümumiyyətlə cənnəti belə insanlardan ötrü yaratmışdır - nə üçün cəhənnəm odundan qorxub Allaha sığınırdılar? Bunun özü xüsusi bir mövzudur. Biz kiçikik, baxışımız qüsurludur, yaxıngörənik. Biz ilahi əzəməti dərk etmirik, nəhəng bir elmi şəxsiyyətin qarşısında oynayan kiçik və azyaşlı uşaqlar kimiyik; gəlib-gedir, onun isə vecinə də deyil, çünki kim olduğunu bilmir. Amma atasının ağlı ondan yüz qat artıqdır və həmin şəxsiyyətin qarşısında hörmət ifadə edir. Allah-Taala qarşısında bizim vəziyyətimiz də belədir. Biz uşaq kimi, qafil və kiçik bir insan kimi ilahi əzəməti dərk etmirik, amma ilahi əzəmət elm mərhələsindən iman mərhələsinə, iman mərhələsindən şühud mərhələsinə və şühud mərhələsindən Allahda fani olmaq mərhələsinə çatanların gözlərində elə cilvələnir ki, nə qədər saleh əməl etsələr də, gözlərinə görünmür, .deyirlər biz nə etmişik ki. Onlar özlərini müqəddəs Rəbbin zatına həmişə borclu bilirlər

Hədisin davamında deyilir ki, Əmirəlmöminin (ə) Allahın razılığını qazanmaq və özünü cəhənnəm odundan uzaqlaşdırmaq üçün öz şəxsi malı ilə aldığı min qul və kəniz azad etmişdir. Xərclədiyi pullar da müftə əlinə keçməmişdi. İmam Sadiq (ə) bu hədisdə

buyurur ki, o, alın təri ilə və çox zəhmətlə onları qazanmışdı. O həzrət həm Peyğəmbərin (s) dövründə, həm ۲۵ illik fasilə çağında, həm də xilafəti dövründə - bəzi əsərlərdən Əmirəlmömininin (ə) xilafəti dövründə də işlədiyi anlaşılır – işləyir, tarla ,əkir



---

.Yenə orada [۱۲۷] -۱

kanal çəkir, pul qazanır və bu pulları Allah yolunda xərcləyir, o cümlədən tez-tez qul alıb azad edirdi. O bu minvalla min qul azad etdi. Əmirəlmömininin (ə) evində adi yeməklər bunlar idi: zeytun, sirkə, ortabab, yaxud keyfiyyətsiz xurma. Bunlar bizim indiki cəmiyyətimiz üçün məsələn, qatıq-çörək, yaxud pendir-çörək deməkdir. Onun geyimi çuval bezindən idi; qolu bir qədər uzun olsaydı, qayçı götürüb kəsirdi. Yəni hətta qolunun artıqlığına da razı olmurdu, deyirdi bu artıqdır, bunu haradasa işlətmək olar. O zaman parça da çox az idi, camaatın geyim problemi vardı və bir parça çuval .bezi də işə yaraya bilərdi

İmam Sadiq (ə) sonra həzrətin ibadəti haqda danışır. O həzrət İslamın zirvəsi, müsəlmanların örnəyidir. İmam Sadiq (ə) deyir ki, bütün Əhli-beytdə (ə) - Peyğəmbərin (s) ailə və övladları arasında belə rəftar, zahidlik və ibadət baxımından Əli ibn Hüseyn (ə) qədər heç kəs Əmirəlmömininə (ə) bənzəmirdi. İmam Səccad (ə) ona daha çox bənzəyirdi. İmam Sadiq (ə) İmam Səccadın (ə) ibadəti haqda danışandan sonra buyurur ki, bir gün atam həzrət Baqir (ə) öz atasının otağına daxil oldu, atasının çoxlu ibadət səbəbindən çox halsız olduğunu gördü. Deyir ki, yuxusuzluqdan rəngi saralmış, ağlamaqdan gözləri batmış, ayaqları şişmişdi və sair. İmam Baqir (ə) atasının bu vəziyyətini gördükdə ona ürəyi yandı. Deyir ki, atamın otağına daxil olub onu bu halda görəndə özümü saxlaya bilmədim, bərkdən ağlamağa başladım. İmam Səccad (ə) düşüncələrə dalsa da, - təfəkkür də bir ibadətdir - oğlu Baqirin (ə) nə üçün ağladığını anladı. Ona əməli bir dərs vermək məqsədi ilə başını qaldırıb dedi: Ey oğlum! Əli ibn Əbu Talibin (ə) ibadəti haqda yazılmış kitabı buraya gətir. Güman ki, imamlarda İmam Əli ibn Əbu Talibin (ə) qəzavətlərinə, həyatına və hədislərinə dair yazı və kitablar olmuşdur. Rəvayətlərdən başa düşülür ki, imamlar müxtəlif yerlərdə bu kitablardan istifadə edirdilər. Burada da həzrət oğlu İmam Baqirə (ə) buyurdu ki, Əli ibn Əbu Talibə (ə) aid olan yazını gətir. İmam Baqir (ə) buyurur ki, mən onu gətirib atama verdim. O bir qədər bu yazıya baxdı. İmam Səccad (ə) burada həm İmam Baqirə (ə) dərs verir, həm İmam Sadiqə (ə), həm də mənə və sizə. Deyir ki, məyus halda onu yerə qoyub buyurdu: Kim Əli ibn Əbu Talib (ə) kimi ibadət edə bilər?! İmam Səccad (ə) o qədər ibadət edir ki, İmam Baqirin (ə) ürəyi yanır, nəinki mənim və sizin; çünki bizim gözümüzdə bunlardan azı da böyük görünə bilər. İmam Baqir (ə) isə özü imamdır, uca məqamlara sahibdir, amma eyni zamanda Əli ibn Hüseynin (ə)

ibadətindən sıxılır, ona ürəyi yanır və özünü saxlaya bilməyib ixtiyarsız halda ucadan ağlayır. Digər tərəfdən, Əli ibn Hüseyn (ə) də deyir ki, kim Əli (ə) kimi ibadət edə bilər. .Yəni özü ilə Əli (ə) arasında böyük fərq görür

Bizim aşiq olduğumuz, dünyanın aşiq olduğu, barəsində məsihinin kitab yazdığı, əməldə dini göstərişlərə çox da tabe olmayan adamın mədh etdiyi bu Əliyə (ə) siz nə üçün uzaqdan baxırsınız? Yaxınlaşın. Dəmavənd dağının zirvəsinə uzaqdan baxan hər kəs deyir ki, bəh-bəh, nə qəşəngdir! Bu dolanbaclarla bir qədər qalx görək nəkarəsən. Yaxınlaşmaq, yola düşmək, hərəkət etmək lazımdır. Bu gün bəşəriyyətin Əmirəlmömininin (ə) bayraqdarı olduğu bu xislətlərə ehtiyacı var. Bu xislətlər elm və texnologiyanın inkişaf etməsi ilə, dünyada yeni həyat üsullarının yaranması ilə köhnəlmir; ədalət köhnəlmir, insaf və haqsevərlik köhnəlmir, hegemonizmə düşmənlik köhnəlmir, Allahı ürəkdən sevmək köhnəlmir. Bunlar insan varlığının tarix boyu dəyişməz rəngləridir. Əmirəlmöminin (ə) bu bayraqları ucaldırdı. Bu gün bəşər bu sözlərə və bu həqiqətlərə təşnədir. Yol nədir? Yol yaxınlaşmaqdır. Mənim və sizin haradasa haqq üçün bir söz danışmamız nəzərimizdə çox və böyük görünməsin. Xeyr! Əli (ə) budur! Əgər axşam, gündüz, yaxud gecə bir saat ibadət edə biliriksə, gözümüzə böyük görünməsin və bizi qürurlandırmasın. Əli budur! Əgər təhlükəli bir işə atılırıqsa, özümüzü böyük görməyək. Əli budur! Nə qədər bacarırsınız yaxınlaşın. Ey oruc tutanlar! Ey namaz qılanlar! Ey nafilə qılanlar! Ey Allah yolunun mücahidləri! Ey təhlükəli meydanlara atılanlar! Ey dünyanın zahidləri! Ey gündüzün aslanları! Ey gecənin abidləri! Xoş sizin halınıza! Siz Əliyə (ə) daha yaxınsınız. Amma bundan da artıq .yaxınlaşa bilərsiniz

İslam dünyası və hətta bütün sağlam bəşəriyyət onun qarşısında baş əyir. Tarixdə bunların təsiri qalır. Onun zahidliyi, ibadəti, şücaəti, Allah yolunda qətiyyəti göz önündədir. Lazım olanda xəncərlə haqq düşmənlərinin, din düşmənlərinin, Allah düşmənlərinin canına düşür və heç nədən qorxmurdu: Heç kimin məzəmməti onu (Allah yolundan saxlamırdı.(١

Allaha doğru hərəkət yolunda sapqın, zərərli və əngəl törədən bir insan olanda onun xəncəri son sözü deyirdi. Harada bir məzlum vardısa, haqqı tapdanmış vardısa, Əmirəlmöminin (ə) ən yumşaq insana çevrilirdi. Rəvayətə əsasən, Əmirəlmöminin (ə) öz əli ilə yetimləri o qədər yedirdi ki, böyük ehtimalla yeniyetmə olan bir nəfər Kaş biz də yetim olaydıq və Əmirəlmöminin (ə) bizə də belə mərhəmət göstərəydi dedi. Tanınmaz şəkildə yoxsulların evinə, yolda və çətinlikdə qalanlara o qədər baş çəkdi ki,

.o həzrətə sui-qəsddən sonra həmin mehriban insanın kim olduğunu bildilər

Onun sözü Nəhcül-bəlağədir - ərəblər arasında ən fəsahətli insan sözü. Nəhcül-bəlağə incəsənət və gözəlliyin zirvəsində durur, gözəl sözün və gözəl



---

.Süleym ibn Qeys Hilalinin kitabı, c. ۱, səh: ۲۲ [۱۲۸] -۱

mənanın zərif kompozisiyasıdır. İnsan heyran olur. Heç bir böyük ərəb şairi və .yazıçısısı özünü Nəhcül-bəlağəyə ehtiyacsız bilməmişdir

.Tehranın cümə namazı xütbələrindən: ۱۹۹۹

### Ramazan – möminlərin qısa riyazət kursu

Fitr bayramı ibadət və bağışlanmaq bayramı, imanlı müsəlman üçün qısa riyazət kursunun sonudur. Mömin il ərzində və bütün ömrü boyu bəhrələnmək üçün özündə yaxşı xarakterlər yaratmaqda və ya onları gücləndirməkdə bu riyazətdən istifadə edir. Ramazan ayında bu ilahi və dini riyazət, özünü saxlamaq, aclığa və susuzluğa dözmək, nəfslə və insani ehtiraslarla mübarizə aparmaq insanda yaxşı xislətlərin güclənməsinə bais olur. İnsan həmin xarakter və xislətlərin məcmusundan ibarətdir. Nəfsi və mənəvi xislətləri yaxşı olanlar bu dünyadan əlidolu köçürlər. İbadətlərdə, ilahi təqvada və insanın üzərinə düşən digər vəzifələrdə son məqsəd budur ki, insan özündə gözəl xislətlər yaratsın, özünü həqiqi insana çevirsin və Böyük Allahın xüsusiyyətlərinə .bənzətsin

### Orucluğun səmərələrini qorumaq

Ramazan ayının sayəsində nəfslə mübarizə gücünə yiyələnmiş insan əldə etdiyi böyük nəticəni qorumalıdır. Həvəsbazlıqdan və imkanı çatan hər bir yerdə istək və ehtiraslara müsbət cavab verməkdən ibarət olan pis vərdişdən əziyyət çəkən insan ramazan ayında bu vərdişə üstün gələ bilir. Bunu qorumaq lazımdır. Bəşərin bütün bədbəxtlikləri nəfsinə itaətdən doğur. Bütün zülmlər, hiylələr, pisliklər, ədalətsizliklər, zülmkar müharibələr, azğın hökumətlər, xalqlarda olan bütün təslimçiliklər və zülmə baş əymələr nəfsə itaətdən, nəfsin istəklərinə təslim olmaqdan irəli gəlir. Əgər insanda nəfsin istəyinə üstün gəlmək gücü olsa, bütün bunlardan xilas olar. Ramazan ayı sizdə bunu yaratmışdır. Bugünkü bayram hesablamaqdan ötrüdür. Ziyafət zamanı .Allahın sizə verdiyi mükafatı özünüz üçün saxlayın və Allahla əlaqənizi gücləndirin

Mənim əzizlərim! Kişilər, qadınlar və xüsusən gənclər! Bu münacat halını, zikr halını və nurlu qəlblərinizdə Allah-Taala ilə mənəvi əlaqə halını il boyu qoruyun. Dünya və axirət bu paklıqla əldə olunur. İnsanı xoşbəxt edən dünya yalnız bu yolla əldə olunur, başqa .heç bir yolla yox

Sözümün sonunda siz əzizlərə Əmirəlmömininin (ə) bu hədisini oxumaq istəyirəm. Əmirəlmöminin (ə) buyurmuşdur: Bu, yalnız orucu və ibadəti Allah tərəfindən qəbul olunan şəxs üçün bayramdır. Və Allaha günah edilməyən hər gün bayramdır.(١) Mənim

əzizlərim! Günahdan uzaq durmaqla, Allahın haramlarından çəkinməklə bu günü, .sabahı və ilin bütün günlərini özünüz üçün bayrama çevirin

.Fitr bayramı namazının xütbələrindən: ۲۰۰۰

səh:۱۳۶

---

.Nəhcül-bəlağə, hikmət: ۴۲۰ [۱۲۹] -۱

**Ramazan – cəmiyyətdə ixlaslı əməl üçün çalışmaq imkanı**

Əzizlər! Ramazan ayı, bərəkətli gün və saatlardır. Hamı bu saatlardan istifadə etsin. Bizim bu saatlardan, bu gündüz və gecələrdən əsl istifadəmiz belədir ki, Allahdan həqiqi bir İslam məmuru, mömin və islamçı bir məmur kimi çalışmaq səadətini istəyək və özümüz də buna çalışaq. Bu belə olmalıdır, başqa yolu yoxdur. Yəni bizim aramızda bu fəsadların yayılmasına əsla dözmək olmaz. Xeyr! Müəyyən işlər görülməlidir və hamı məsuliyyət daşıyır. Çalışmaq, zəhmət çəkmək və bu işləri düzəltmək lazımdır. İslahatın birinci addımı bizim daxili islahımızdır. Yəni quruluşun məmurları özlərini bu qeyri-dini üsullardan, rəftar və xaraketlərdən xilas etməlidirlər. Əgər bu iş baş versə, o .zaman inkişaf olacaq

.Quruluşun məsul şəxsləri ilə görüşdə çıxışından: ٢٠٠٠

səh:١٣٨

## Ramazan – irəliyə hərəkət üçün özünüislah ayı

Fitr bayramı münasibəti ilə təbrik etmək əslində mübarək ramazan ayını uğurlu keçirmək münasibəti ilə təbrik etməkdir. Bizim xalqımızı bu il də mübarək ramazan ayını yaşamağa müvəffəq etdiyinə görə Allaha şükür edirik. Ramazan ayı boyunca ölkə möminlərin zikri, imanlı gənclərin və oruc tutmuş insanların pak nəfəsləri ilə ətirlənmişdi. Allaha şükür olsun ki, bu il ramazan ayı xalqın mənəvi özünüislah nailiyyətləri baxımından ötən ildən və öncəki illərdən yaxşı keçdi. Bunun qədrini bilək, özümüz və xalqımız üçün mübarək təsirlərini qoruyaq. Ramazan ayı özünüislah ayıdır və özünüislah irəliyə doğru hərəkət üçündür. İnşallah böyük İran xalqının ٢١-٢٢ il boyu davam etdirdiyi bu mübarək yolu və hərəkəti uğurla davam etdirək. Bu, mənim deməkistədiyim ikinci məsələdir: Allahın bu ayda İran xalqına nazil etdiyi bərəkət və uğurların .şükrünü etmək

Əmirəlmömininin (ə) hədisində fitr bayramı günü qiyamətə, yəni cəza və mükafat gününə bənzədilmişdir.(١) Sizin bu mənəvi, ibadi və siyasi mərasimə toplanmanız Allahın lütf və mərhəmətini sizə yönəltsin! İran xalqı, ölkə məmurları, ölkənin hər hansı bir yerində, bu xalqın böyük fəaliyyətinin hər hansı bir sahəsində çalışan bütün şəxslər Allah-Taalaya təvəkküllə, Allahın Qurandakı göstərişlərinə, Əhli-beytin (ə) kəlamlarına diqqətlə və böyük imamımızın – dövrümüzün böyük və mənəvi insanının, peyğəmbərlər canişininin ardınca bu yolu davam etdirsinlər, xalqın xoşbəxtliyini və bu .ölkənin gələcəyini təmin etsinlər

## Fitr bayramı – müsəlmanın tükənməz xəzinəsi

Mübarək fitr bayramının bəlkə də ən üstün xüsusiyyəti onun mənəvi və beynəlxalq bir tədbir olmasıdır. Sırf siyasi cəhətə malik olan çoxlu beynəlxalq tədbirlərin əksinə olaraq, bu beynəlxalq tədbir aydın mənəvi cəhətə malikdir. Fitr bayramı namazının qünutunda belə deyirik: Müsəlmanlar üçün bayram və Məhəmməd (s) üçün ehtiyat, şərəf, hörmət və üstünlük etdiyin bu günün hörmətinə Səndən diləyirik.(٢) Bu gün bütün müsəlmanların bayramı, İslamın və İslam Peyğəmbərinin (ə) şərəf amili, İslamın izzəti və tarix boyu tükənməyən xəzinədir. Fitr bayramına bu gözlə baxaq. Bu gün bizim böyük İslam xalqımızın bu ehtiyata ehtiyacı var. Müsəlmanlar bu ehtiyatdan iki

fayda götürməlidirlər: birincisi, müsəlmanların birliyi və anlaşması, ikincisi isə İslam dünyasında mənəviyyata diqqət. Cəmiyyəti kamilliyə doğru aparan bu iki amil İslam



---

۱- [۱۳۰] Bihar əl-ənvar, c. ۹, səh: ۳۶۲.

۲- [۱۳۱] İqbal əl-əmal, c. ۱, səh: ۲۸۹.

dünyasında sıradan çıxmışdır. Bu gün müsəlmanların birliyi məzhəb, firqə, irq fərqləri, millətçilik, tayfabazlıq və digər sapqın şüarlarla sıradan çıxmışdır. Müsəlmanlar İslam ümmətinin birliyi şüarını özlərinin bütün şüarlarının – irqçilik şüarlarının, özlərinə məxsus məzhəb şüarlarının, öz siyasətlərinə aid şüarların fövqündə tutmalıdırlar. Bu gün onlar üçün ən vacib şüarlardan biri budur. Bilirik ki, müstəmləkəçilik, hegemonizm və əcnəbi güclər həmişə müxtəlif hiylələrlə bu birliyi pozmağa çalışmışlar. Ən çirkin hiylələrdən biri Fələstin torpağının işğalı və müsəlman Fələstin topaqlarında – yəni müsəlman xalqların və İslam ölkələrinin qəlbində xəbis sionizm ağacını əkmək .olmuşdur

İkinci cəhət də mənəviyyatdır. Bizim bütün sərvətlərimizi – neftimizi, müstəqilliyimizi, iqtidarımızı və birliyimizi çapıb-talayan müstəmləkəçilər mənəviyyatımızı da qarət etdilər, İslam dünyasında müxtəlif mədəniyyətlər və batil əsaslar formasında öz maddiyyatlarını yaydılar. Bu gün İslam mənəviyyatına, İslamın həqiqətinə və din ruhaniliyinə qayıtmaq müsəlmanların şüarı olmalıdır. Bu gün müsəlmanların buna .ehtiyacı var

.Quruluşun məsul şəxsləri və müsəlman ölkələrinin səfirləri ilə görüşdə çıxışından: ۲۰۰۰

səh:۱۴۰

## Ramazan – dözüm və namaz ayı

Fitr bayramı ramazan ayından sonra mükafat və ilahi mərhəmət günüdür. Allaha şükür olsun ki, dözüm və namaz ayı olan ramazan ayını salamatlıqla keçirdiniz. Allah-Taala sizi dua, zikr və münacatla vacib orucunuzu tutmağa və Həzrət Haqqın qarşısında təzim və ibadət etməyə müvəffəq etdi. Bu gün Allah-Taalanın sizə mükafat verdiyi gündür. Bəlkə də Allahın ən böyük mükafatlarından biri növbəti ramazan ayına qədər ilahi rəhməti qoruyub saxlamaqda bizim hamımıza kömək etməsidir. Ramazan ayında ilahi rəhmət sizin bu mübarək ayda etdiyiniz yaxşı əməllərdən doğur. Ramazan ayında Allaha diqqət, yoxsullara yaxşılıq, qohumlara baş çəkmək, zəiflərə əl tutmaq, iffət və zahidlik var, küsdüyünüz adamla barışmaq var, düşmənlik etdiyiniz adamlara qarşı insaflılıq var. Bu ay şəfqət, diqqət və ibadət ayıdır; ürəklər yumşalır, canlar ilahi lütf və mərhəmət nuruna boyanır, insan bütün bu yaxşı əməlləri yerinə yetirmək səadətinə nail olur. Bunu gələn ilə qədər davam etdirin. Ramazan ayının bütün il üçün dərsini öyrənək. Bizə belə bir uğur bəxş etməsi Allahın ən böyük mükafatlarından biri ola bilər. Allah-Taaladan razılığını, mərhəmətini qəbul etməsini və əfvini diləyək. O zaman bu, həqiqi bayram olacaq.

## Ramazan ayının ən böyük dərsi: Özünüislah

Mənim bu xütbədə əziz xalqımıza demək istədiyim budur ki, ramazan ayının ən böyük dərsi özünüislahdır. Özünüislahın ilk və ən mühüm addımı da insanın özünə, öz əxlaq və rəftarına tənqid gözü ilə baxması, öz eyiblərini diqqətlə görməsi və onları aradan qaldırmağa çalışmasıdır. Bu bizim öhdəmizdən gəlir və bizim üzərimizə düşən vəzifədir.

Xalqa deyirəm: Bir-birinizə rəhm edin ki, Allah-Taala da sizə rəhm etsin, imkanı çatanlar digərlərinin haqqını tapdamasınlar. Zirəkliyi, ağlı, imkanı, gücü, vəzifəsi, müxtəlif fərdi və ictimai bacarığı olanlar bu imkanlardan digərlərinə təcavüz üçün istifadə etməsinlər. Özümüzü Allahın bəndəsi, Allahın digər bəndələri qarşısında yoldaşlığa, yaxşılığa və insaflılığa borclu bilək. O zaman Allahın lütf və rəhmət yağışı bizə yağacaq, bizi yuyacaq və öz xeyir-bərəkətlərini endirəcək. Sözsüz ki, bu hamının borcudur, amma cəmiyyətdə böyük imkanı, gücü, vəzifəsi, sərvəti və xalq arasında

nüfuzu olanlar özünüislahdan və digərlərinin hüququna təcavüzdən çəkinməkdən .ibarət olan bu ağır vəzifə qarşısında daha çox məsuliyyət daşıyırlar

.Fitr bayramı namazının xütbələrindən: ٢٠٠١

səh:١۴١

### Fitr bayramının həqiqi bayram olması

Fitr bayramı İslamın ən əlamətdar günlərindən biridir. İslam dünyası fitr bayramını həqiqi mənada bayram bilir və qeyd edir. Bunu isə İslamın özü istəmişdir: "Allah sizin üçün bayram təyin etmiş və sizi o bayrama layiq bilmişdir".(١)Əhəmiyyətli olan məsələnin ikinci tərəfidir. Biz bu ilahi hədiyyədən istifadə etməliyik; həm mənəviyyat və tövbə nurunu cəlb etmək mənasında olan şəxsi istifadə, həm də ümumi istifadə. Əgər ilahi mənəviyyat və məhəbbət aləmindən öz qəlblərimizə bir baca açıb daxilimizi işıqlandırsaq, xarici dünyanın çoxlu qaranlıqları və problemləri də həll olunacaq. Çünki insanların əməllərində, rəftarlarında, ictimai və beynəlxalq münasibətlərində yaxşılıq .və pisliklərin mənşəyi onların qəlbidir

.Quruluşun məsul şəxsləri ilə görüşdə çıxışından: ٢٠٠١

səh:١۴٢

---

.Mən la yəhzuruhu əl-fəqih", c. ١, səh: ۵١٧" -١

### Ramazan – təqva qazanmaq ayı

Ramazan ayı təqva qazanmaq ayıdır. Bu ayda bütün il və bütün ömrümüz üçün dəyərli təqva ehtiyatı toplamaqdan ötrü Allah-Taaladan kömək istəyək.

Bu gün birinci xütbədə Əmirəlmömininin (ə) bir cümləsi haqda danışmaq istəyirəm. Bu cümlə o həzrətin övladlarına və yaxınlarına vəsiyyətindəndir. Nəhcül-bəlağədə deyilir ki, bu vəsiyyət hamıya ünvanlanmışdır. Yəni biz də Əmirəlmömininin (ə) bu sözlərinin müraciət tərəfiyik. Bu, məşhur bir vəsiyyətdir. İmam vəsiyyətin bir-iki sətrindən sonra buyurur: Siz iki oğlumu, bütün övladlarımı, ailəmi və yazımdan xəbərdar olan hər bir kəsi Allah təqvasına, işlərdə nizam-intizama və mehribanlıq yaratmağa çağırıram.(١) Bu vəsiyyətnamədə təxminən iyirmi məsələ qeyd olunmuşdur. Təbii ki, böyük bir insanın ömrünün son saatlarında yazdığı vəsiyyətnamə onun fikrincə çox mühüm mətləbləri ehtiva edir. Əmirəlmöminin (ə) bu vəsiyyətnaməni İbn Mülcəmin sui-qəsdindən sonra yazmışdır. Bu vəsiyyətnamədə qeyd olunan təxminən iyirmi məsələ mühüm məsələlərdir: dünyagirlik, Quran, həcc, cihad, yetimlər, qonşular və digər mövzular. Mən bu gün söhbət üçün həmin iyirmi məsələdən ikisini seçmişəm: biri işlərdə nizam-intizam, ikincisi isə mehribanlıq yaratmaq. Bundan anlamaq olar ki, bu iki məsələ Əmirəlmömininə (ə) görə çox mühüm məsələlərdir.

### İmam Əlinin (ə) vəsiyyətləri

#### ١. Təqva ilə yanaşı və uyğun olan nizam–intizam

Nizam-intizam elə məsələlərdəndir ki, insan öz həyatında onun mənasına və funksiyasına dərindən diqqət yetirdikdə əhəmiyyətini daha yaxşı dərk edir. Nizam-intizam hər şeyi öz yerinə qoymaqdır. Biz insanların ətrafında olan, yerə və göyə qədər genişlənmiş dünya qanunlu və sistemli bir məcmudur. Dünyanın bütün hadisələrinə, hissolunan və görünən aləmin bütün hərəkətlərinə və bizim ətraf dünyamıza qanun və nizam-intizam hakimdir. İnsan da bu dünyanın nizam-intizamlı hissələrindən biridir. İnsanın təbii həyatı da nizam-intizamlıdır; qan dövranı, ürək döyüntüsü, tənəffüs və insanın bədənində mövcud olan digər hərəkət, iş və hallar hamılıqla nizam-intizama tabedir. Əgər insanın əməli və rəftarı nizamlı olsa, onunla ətraf dünya arasında harmoniya yaranacaq. Nizam-intizam insana hər bir şeydən layiqli şəkildə istifadə

etməyə və heç bir şeyin işsiz qalmamasına imkan verir. İnsanın bədənində nizamsızlıq yarandıqda xəstələnir. Bu məsələ fərdi və ictimai rəftarlarda da eynilə belədir. Buna .əsasən, nizam-intizam böyük əhəmiyyətə malikdir



---

.Came əhadis əş-Şiə, c. ۲۳, səh: ۸۹۰ [۱۳۳]-۱

Nizam-intizamın dairəsi genişdir. İnsanın xüsusi həyatından, yaşadığı, yaxud işlədiyi otaqdan tutmuş iş yerinə, təhsil mühitinə, ictimai mühitə, cəmiyyət və ictimai quruluş qurmağa qədər hər yerdə nizam-intizam olmalıdır. Yəni ictimai struktur da xüsusi bir fəlsəfəyə tabe olan nizam-intizamdan qaynaqlanır. Əmirəlmömininin (ə) bu .vəsiyyətnamədə söylədiyi İşlərinizdə nizam-intizam sözü bunların hamısına aid olur

O həzrət nizam-intizamdan öncə təqva məsələsinə toxunmuşdur. Vəsiyyətin əvvəlində təqva tövsiyə olunmuşdur: Sizə Allah təqvasını və dünyaya aldanmamağı tövsiyə edirəm(١). İki sətirdən sonra yenə buyurur: Siz iki oğlumu, bütün övladlarımı, ailəmi və yazımdan xəbərdar olan hər bir kəsi Allah təqvasına, işlərdə nizam-intizama və mehribanlıq yaratmağa çağırıram.(٢) Burada təqvanı yenidən təkrarlayır. Bu bəlkə ona görədir ki, insanın həm fərdi, həm də ümumi və ictimai həyat sistemində tövsiyə olunan nizam-intizamın təqvadan qaynaqlanması, təqva ilə yanaşı və uyğun olması istənilir. Deməli, bu bizim hamımız üçün ümumi bir vəsiyyətdir. Biz şəxsi həyatımızda, ailədə, təhsildə, idarədə və çalışdığımız peşələrdə nizam-intizama və proqramlara riayət etməliyik. Bunlar əsasən fərdi nizam-intizamlardır. Lakin cəmiyyət miqyasında da nizam-intizama riyaət etmək lazımdır. Kim harada çalışırsa, özünü ictimai nizam-intizama riayət etməyə borclu bilməlidir. Bu, cəmiyyət miqyasında bizim üçün hamının .müştərək olduğu ümumi əxlaqdır

Qanunlara, qardaşlığa və mürüvvətə riayət etmək, israfçılıq etməmək, digərlərinin hüququnu pozmamaq, istər özünün, istər digərlərinin vaxtına riayət etmək, keçidlərdə, yollarda qaydalara tabe olmaq, maliyyə, ticari və digər məsələlərə riayət etmək – bunların hamısı nizam-intizamın nümunələridir. Nizam-intizamın mühüm bir nümunəsi budur ki, bizim cəmiyyətdəki işlərimizlə düşüncələrimiz, etiqadlarımız və şüarlarımız arasında uyğunluq olmalıdır. Çox təhlükəli intizamsızlıqdan biri budur ki, bir cəmiyyətdə düşüncə və etiqad əsasları və inamlar bir şey olsun, həmin qayda və inamlar əsasında formalaşmalı və ümumi ictimai normaları təşkil etməli olan rəftarlar isə başqa bir şey. Bu bir növ ümumi ikirənglilik, ikiüzlülük və nifaq yaradır və çox .təhlükəli amildir

İslamın adını təkrarlamaq, əməldə isə onun heç bir əsasına inanmamaq, insan hüquqlarını düşüncə əsası kimi vurğulamaq, əməldə isə insan hüquqlarına riayət

etməmək, – bu gün təəssüf ki, beynəlxalq miqyasda bəşərin böyük bəlalarından biri budur – azadlıqsevərlikdən danışmaq, əməldə isə digərlərinin azadlığını tapdamaq, qanun və qanunsevərlikdən danışmaq, əməldə isə qanuna



---

.Rövzə əl-vaizin, c. ۱, səh: ۱۳۶ [۱۳۴] -۱

.Came əhadis əş-Şiə, c. ۲۳, səh: ۸۹۰ [۱۳۵] -۲

boyun əyməmək çox pis xüsusiyyətlərdən, nizam-intizamsızlığın aşkar və təhlükəli nümunələrindəndir. Qanun-qayda yaratmaq, yaxud onu icra etmək istəyən məmurlar buna daha çox riayət etməlidirlər. Adi camaat da ümumi əməllərində bu məsələyə .diqqət yetirməlidir

### Ürəkləri bir-birinə yaxınlaşdırmaq, insanları bir-birinə nikbin etmək .۲

İkinci məsələ mehribanlıq yaratmaqdır. Əmirəlmömininin (ə) öz mühüm vəsiyyətnaməsində bəyan etdiyi mehribanlıq yalnız zahiri ittifaq və birlik deyil ki, iki qrup, iki toplum bir məsələ haqda bir müqavilə imzalasınlar və zahiri ittifaq yaransın. Məsələ bundan üstündür. Burada məqsəd iki tərəfin bir-birinə qarşı münasibətlərini yaxşılaşdırmaq, onları bir-birinə nikbin etməkdir; belə ki, heç kimdən və heç bir .cinahdan digərinə qarşı haqsızlıq və zülm baş verməsin

Həmin cümlədə və mehribanlıq yaratmaq deyə buyurduqdan sonra əziz Peyğəmbərin (s) sözündən bir sitat gətirir: Mən babanızdan eşitdim ki, mehribanlıq yaratmaq ümumi namaz və orucdan üstündür.(۱) Yəni insanlar arasında mehribanlıq yaratmağın, onların bir-birinə qarşı münasibətlərini yaxşılaşdırmağın savabı hər bir namaz və orucdan artıqdır. Gedib insanlar arasında mehribanlıq yaratmağa çalışmaq müstəhəb namaz qılmaqdan, yaxud müstəhəb oruc tutmaqdan fəzilətlidir. Bu da bizim bu gün .çox ehtiyacımız olan məsələlərdəndir

.Tehranın cümə namazı xütbələrindən: ۲۰۰۲

səh:۱۴۵

---

.Nəhcül-bəlağə, səh: ۴۲۱ [۱۳۶] -۱

Mənəvi və maddi fəallığı gücləndirmək, məhrumlara qayğı göstərmək

Ramazan orucunun nəticəsi bizim qəlbimizdə və ruhumuzda təqvanın yaranmasıdır. Bu, il boyu həyatın dolanbac yollarında bizə kömək göstərməli və bizim üçün düzgün .yolu açmalıdır

Ramazan ayı bütün əzəməti, böyüklüyü və mərhəmət dolu ab-havası ilə ötdü. Bütün dünya müsəlmanları bu ayda orucun, ibadətin, duanın, zikrin və Quran oxumağın .sayəsində öz qəlblərini və ruhlarını daha da işıqlandırıb Allaha yaxınlaşdılar

Ramazan ayı sayəsində müsəlman üçün bir fürsət yaranır. Müsəlman həmin fürsətdən öz mənəvi və maddi fəallığını gücləndirmək üçün istifadə etməlidir. Dua etmək, oruc tutmaq və Quran oxumaq əsnasında Ramazan ayından öyrəndiyimiz dərslərdən biri budur ki, aclıq və susuzluq çəkməklə aclar, məhrumlar və yoxsullar barədə fikirləşək. Ramazan ayının gündüzlərinin duasında belə deyirik: Ey mənim Allahım! Bütün yoxsulları varlandır! Ey mənim Allahım! Bütün acları doyur! Ey mənim Allahım! Bütün çılpaqları geyindir!(١) Bu dua yalnız oxumaq üçün deyil, hamının özünü yoxsulluqla mübarizəyə, məhrum və məzlumları uyğun vəziyyətdən çıxarmağa borclu bilməsindən ötrüdür. Bu mübarizə ümumi bir vəzifədir. Biz Quranda belə oyuruq: Qiyaməti (dini) yalan hesab edəni gördünmü? O elə adamdır ki, yetimi itələyib qovar və (xalqı) yoxsulu yedirtməyə rəğbətləndirməz(٢). Dini təkzib etmənin əlamətlərindən biri yoxsullara laqeyd qalmaq, heç bir məsuliyyət hiss etməməkdir. Ramazan ayında oruc tutmağın hesabına aclığın, susuzluğun və nəfsin istəyini rədd etməyin dadını daddıq. İslam hər bir müsəlmanın yoxsul və yoxsulluğa qarşı məsuliyyət hiss etməsini istəmiş və bu məqsədlə onlara şəriət vəzifələri təyin etmişdir. Ramazan ayı bizi bu .mühüm məsuliyyət hissinə yaxınlaşdırmalıdır

Yoxsulluq hər bir cəmiyyətdə ictimai ədalətin və adil sistemin bərqərar olunması ilə köklü şəkildə həll olunmalıdır. Belə ki, digərlərinin haqqını tapdamaq istəyənlər ümumi sərvətləri öz xeyirlərinə müsadirə edə bilməsinlər. Bu, hökumətin vəzifəsidir, amma öz növbəsində xalqın üzərinə də böyük vəzifə düşür. Düzdür, ictimai proqramlar tədricən həyata keçir, lakin ictimai proqramların səmərəyə çatmasını gözləyib cəmiyyətdə

yoxsulluğa və aclığa tamaşa etmək olmaz. Bu, xalqın özünün və bu sahədə çalışa bilən .bütün şəxslərin vəzifəsidir

səh:۱۴۶

---

.Məfatih əl-cinan, ramazan ayının gündəlik duası [۱۳۷] -۱

.Maun/۱-۳ [۱۳۸] -۲

Hamı yoxsulların dərdinə şərik olmalı, müsəlman, həmvətən və məhrum ailələrdən heç birini öz dərdləri, məhrumluqları və problemləri ilə tənha qoymamalı, onlara yardım etməlidir. Bu gün bu, vicdanı, əxlaqı və insani hissləri olan bütün insanların qlobal vəzifəsidir. Müsəlmanlar üçün isə əxlaqi və emosional vəzifədən əlavə, həm də .dini vəzifədir

Qonşuların və yoxsulların qayğısına qalın. Maddi imkanı olanları yoxsullara yardımdan saxlayan amillərdən biri cəmiyyətdə israfçılıq və dəbdəbə ənənəsidir. Cəmiyyətdə israfçılığa meylin günbəgün artması, hamının daha çox xərcləməyə, daha çox və daha çeşidli yeməyə, daha rəngarəng geyinməyə, modabazlığa, hər bir yeni məişət əşyasına və dəbdəbəyə həvəslənməsi böyük bir bəladır. Bu yolda nə qədər pullar və sərvətlər hədər gedir, Allahın razı olduğu və bəzi insanların problemlərinin həllinə .yönələn işlərə xərclənmir

**Cəmiyyətdə israfçılığın zərərləri**

İsrafçılıq cəmiyyət üçün böyük bir bəladır. İsraf təbəqələrarası məsafəni, yoxsulla varlı arasındakı uçurumu günbəgün artırır və dərinləşdirir. Xalq israfdan çəkinməyi özünə vəzifə bilməlidir. Müxtəlif dövlət qurumları, aidiyyətli orqanlar, xüsusən informasiya və mədəniyyət orqanları, radio və televiziya xalqı nəinki israfa, istehlakçılığa və dəbdəbəyə sövq etməməli, hətta əksinə, xalqı qənaətcilliyə, qədərincə xərcləməyə və israfdan çəkinməyə sövq etməlidirlər. İstehlakçılıq cəmiyyəti çökürdür. İstehlakı istehsalından çox olan cəmiyyət müxtəlif sahələrdə uğursuzluğa düçar olur. Biz öz .istehlakımızı normallaşdırmağa, azaltmağa vərdiş etməli və israfdan uzaqlaşmalıyıq

Gənclər ailə toplantıları keçirsinlər, ailə üzvlərinin yardımlarını toplayıb birinci növbədə öz ailə və qohumlarından olan yoxsullara kömək etsinlər və əgər ehtiyacları olmasa, .digər yoxsullara versinlər

Bu gün bizim cəmiyyətimizdə yoxsulluq var. İslam quruluşu olaraq bizim vəzifəmiz cəmiyyətdə yoxsulluğun kökünü kəsməkdir. Cəmiyyətdə məhrumluq olmamalıdır. Bu bizim bir hökumət kimi, İslam quruluşu kimi və xalq kimi borcumuzdur: Hamınız cəmiyyət qarşısında məsuliyyət daşıyırsınız(١). Bu hamının vəzifəsidir. Hər birimiz bir yolla dəbdəbə və israfı azaltmalıyıq. Bu, ramazan ayının dərsidir. Bunun üçün iradə,

.fədakarlıq və maariflənmə lazımdır. Gərək Allah-Taaladan kömək istəyək

Elə ailələr var ki, tənbəllikdən yox, sözün həqiqi mənasında məhrum və yoxsuldurlar. .Onları tapmalı və onlara kömək etməlisiniz. Bu çətin iş deyil



---

.Səhih-Buxari, c. ۱, səh: ۳۰۴ [۱۳۹] -۱

İlahi! Bu böyük və mühüm vəzifəni yerinə yetirməkdə bizə kömək et! İlahi! Məhəmməd və Ali-Məhəmməd (s) hörmətinə, israfçılığın zərərlərini, məhrum və yoxsullara qayğı göstərməyin xeyirlərini bizim cəmiyyətimizin hər bir fərdinə göstər və onları ikinci işə !müvəffəq et

.Fitr bayramı namazının xütbələrindən: ۲۰۰۲

səh:۱۴۸

Bizim bu qədər önəm verdiyimiz Quran qiraəti məsələsi yalnız əyləncə və məharət deyil, bütün cəmiyyətdə Quran ab-havası yaratmaq üçündür. Bizim yaxşı qiraətçilərimiz gözəl səslə, qiraət sənətinin üslubları ilə, həmçinin Qurani-kərimin hərflərinin, söz və ayələrinin düzgün tələffüzünə dair təcvid qaydalarına riayət .etməklə buna nail ola bilərlər

Mənim əzizlərim! Bilin ki, bu gün İslam dünyasının Qurana ehtiyacı var. Sizin dostlarınızın burada oxuduqları Ali-İmran, Bəqərə, Ənbiya və Əhzab surələrinin məzmununda bu gün İslam dünyasının dərdlərinin əlacı olan mətləblər var. Bunlar insanın imanını gücləndirir, düşüncəsini aydınlaşdırır, həyat qüvvəsini işə salır və onlardan istifadə edir. Bu xüsusiyyətlərə malik olan cəmiyyət isə həm inkişaf edir, həm də ruhlanır. Bir cəmiyyətin əhval-ruhiyyəsi yüksək olduqda düşmən ona hegemonluq edə bilmir. Dünya hegemonları bir şəxsi, toplumu, yaxud xalqı istismar etmək istəyəndə birinci növbədə onların əhval-ruhiyyəsini qırmağa, bacarıq və müqavimət hisslərini məhv etməyə çalışırlar. Bir toplumda qüdrət, bacarıq hissi və yüksək əhval-ruhiyyə olsa, heç kəs ona üstün gələ bilməz; nə xarici düşmənlər, nə də daxili düşmənlər – yəni tənbəllik, halsızlıq və bekarlıq. Quranı yalnız ad-san qazanmaq, yaxud özlərinə məşğuliyyət tapmaq üçün yox, əsas dərmanların onda olduğuna görə oxusunlar. Quran dərmanını öz canımıza və vücudumuza içirək, Quranla bu dərdlərə .şəfa verək. Bunun üçün cəmiyyətdə Quran ab-havası hakim olmalıdır

Bizi uzun müddət müxtəlif yollarla Qurandan uzaq saxlayıblar. Bu gün biz Quran mühiti istəyirik və Qurana qayıtmalıyıq. Əlbəttə, bizim cəmiyyətimiz iyirmi beş ildir ciddi və kollektiv şəkildə Qurana doğru gedir. İnqilabdan öncə də Quran hərəkəti vardı, amma fərdi formada idi. Cəmiyyətin Qurana doğru ümumi hərəkəti İslam quruluşundan sonra yaranmışdır. Bu hərəkət yaxşı olmuşdur, lakin ideal nöqtə ilə məsafəmiz hələ çoxdur. O hərəkətin nəticəsində siz bu gün bizim qocalarımızın, gənclərimizin, qadınlarımızın və kişilərimizin Quranla güclü ünsiyyət qurduqlarını görürsünüz. Cəmiyyətin hər bir sahəsində və hər bir yerdə Quranla ünsiyyət qurmuş gənclərin olması həmin hərəkətin nəticəsidir. Bu hərəkəti gücləndirmək lazımdır. Bunun üçün siz qiraətçilər Quranı gözəl səs və üsulla oxuya bilməlisiniz. Bu məclislərə ona görə önəm

verilir ki, cəmiyyətdə Quran qiraətini öyrənməyin əhəmiyyəti bəlli olsun. Əks təqdirdə, .insan təklikdə burada oxunandan dəfələrlə artıq Quran oxuya bilər

Qiraət yalnız səs deyil, onun müxtəlif üslubları vardır; istər zahiri üslublar, məsələn, nəğmə və ahənglər, istərsə də Quranın dərin üslubları və ayələrin məfhumları ilə tanışlıq. Mən çox zaman gənc qiratəçilərimizə

demişəm, indi də təkrar edirəm ki, oxuduqları ayələrin mənasını yaxşı anlamağa çalışsınlar. Ən azı qiraət etdikləri ayələrin tərcüməsinə və zərif mənalarına diqqət yetirsinlər ki, oxuyanda səsləri ilə birgə qəlblərinin dərinliyindən həmin məfhum da çıxsın. Bu, cəmiyyətdə böyük təsir buraxacaq. Bəzi Misir qiraətçilərinin adamda güclü təsir buraxması bu məsələyə riayət etmələrinə görədir. Elə oxuyurlar ki, sanki ayənin məzmununu təsvir etmək istəyirlər. Mən hərdən bəzi gənc qiraətçilərimizə məddah dostları misal çəkib deyirəm ki, bu dostlar bir məclisdə bir beyt şeiri – o şeirin mənasını hamı bilsə də – iki formada oxuya bilərlər. Biri budur ki, gözəl səslə oxuyan bu məddah sanki sizinlə kəlmə-kəlmə danışır. Bu, ruhun dərinliyinəcən işləyir. Biri də budur ki, məddah özü üçün oxuyur. Quranı da iki formada oxumaq olar. Çoxlu qiraətlərin ahəng və nəğmələri digərləri ilə çox da fərqlənməsə də, ürəklərə lazımi təsiri bağışlayıb qəlbləri oyatmır. Ona görə ki, qiraətçi tərəf-müqabilləri ilə ürəkdən danışmır. Bizdə çoxları ərəb dilini bilmirlər, amma camaatın ərəb dilini bildiyi yerlərdə də insan bəzi qiraətçilərin dinləyici ilə ürəkdən danışmadığını anlayır. Əgər qiraətinizin təsir buraxmaq, cəmiyyəti islah etmək, ürəkləri və canları dəyişdirmək baxımından uğurlu alınmasını istəyirsinizsə, onun mühüm və əsas şərtlərindən biri Quranı oxuyanın onun məzmunu ilə tam tanış olması və elə oxumasıdır ki, sanki gözəl səsi ilə həmin .məzmunu dinləyicisinə təsvir etmək istəyir

.Quran qiraətçiləri ilə ümumi görüşdə çıxışından: ۲۰۰۳

səh:۱۵۰

Namazda iştirak edən əziz qardaş və bacıların hamısını sözdə, əməldə, hətta zehində və insana hakim olan hisslərdə təqvaya, əmrləri, qadağaları və ilahi iradəni nəzərə almağa çağırıram. Bu gün ramazan ayının on doqquzudur. Ötən axşam qədr gecəsi olması ehtimal verilən gecələrdən biri idi. Ümumi olaraq çox əziz və mübarək günlərdir. Qədr gecəsi olması ehtimal verilən iki gecə qarşıdadır. Tehran şəhərinin əziz və mömin əhalisi bu mənəvi və ruhani toplantıda öz qəlblərini Həzrət Haqla rabitəyə hazır etsinlər, növbəti qədr gecələrində Allah-Taalanın bu gündüz və gecələrdə möminlərə söz verdiyi ilahi mərhəməti özlərinə yönəltsinlər. İlahi! Qədr gecəsini dərk !etmək və onun faydalarından istifadə etmək səadətini bizim hamımıza nəsib et

Qədr gecəsinin əhəmiyyəti barədə qısa bir cümlə demək istəyirəm. Qurani-kərimin Qədr gecəsi min aydan xeyirlidir ayəsindən anlamaq olar ki, ilahi dəyərləndirmə baxımından bir gecə min aydan üstündür. Bundan əlavə, bu günlərin duasında ramazan ayının dörd xüsusiyyəti qeyd olunur: bu ayın gündüz və gecələrinin digər ayların gündüz və gecələrinə üstünlüyü, bu ayda orucun vacib olması, bu ayda Quranın nazil edilməsi və bu ayda qədr gecəsinin olması. Yəni məsumlardan nəql olunmuş bu duada ramazan ayına dəyər verərkən qədr gecəsinin Quranın nazil olması ilə yanaşı qeyd olunduğunu görürük. Buna əsasən, qədr gecəsinin qədrini bilmək, onun saatlarını qənimət saymaq və qədr gecələrində ilahi təqdir qələminin bizim əziz ölkəmiz, mömin və əziz xalqımız üçün layiq olduğu müqəddəratı yazmasına nail olmaq .lazımdır

.Tehranın cümə namazı xütbələrindən: ٢٠٠٣

## Fitr bayramı – Allahdan bayram hədiyyəsi almaq fürsəti

Bizim xalqımıza zikr və ibadət ab-havasının hakim olduğu bir ramazan ayını nəsib etdiyi üçün Allaha şükür edirik. Bu, böyük ilahi fürsətlərdən biridir. Siz əziz və mömin xalq ramazan ayını oruc tutmaqla, Quran oxumaqla, ibadət etməklə və gecələr oyaq .qalmaqla keçirib Allahın lütfü ilə bayram gününə çatdınız

Bu gün fitr bayramı, Allah-Taaladan bayram hədiyyəsi almaq günüdür. Bayram namazının qünutunda Allah-Taalanı xatırlayan, Ona təzim edən milyonlarla qəlb Ondan istədi ki, ən yaxşı bəndələrinə verdiyi bütün xeyirləri onlara da versin, tarixin ən üstün və ən böyük insanlarını uzaqlaşdırdığı pisliklərdən onları da uzaq saxlasın. O xeyirlər birinci növbədə Allaha diqqət, Allah bəndəliyi məqamına yüksəlmək, Allahla tanış olmaq və rabitə yaratmaq, həyatın bütün sözlərində, işlərində və anlarında Həzrət Haqdan ilham almaqdır. Şərlərin ən pisi Allaha şərik qoşmaq, qeyri-ilahi və Allaha zidd güclər qarşısında kiçilmək və digərlərinə qul olmaqdır. Ümidvarıq Allah öz lütf və mərhəməti ilə milyonlarla müsəlmanın ürəkdən dilədiyi istəkləri qəbul etsin, müsəlmanları təhlükəsiz bəndəlik vadisinə, Özünün saleh və layiqli bəndələri sırasına !daxil etsin

## Vəzifəyə əməl etməyin və ramazan ayının ehtiyatını qorumağın əhəmiyyəti

Bu gün bizim əziz xalqımız bayram etdi. Müsəlman ölkələrində çoxlu müsəlman qardaş və bacılar da dünən bayram etdilər. Ölkəmiz daxilində də bəziləri üçün dünənin bayram olduğu sübuta yetdi. Bəzi təqlid müctəhidləri üçün də dünənki günün fitr bayramı olduğu bilindi və onlar özlərinə sabit olan hökmə əməl etdilər. Bəziləri üçün də sübuta yetmədi, şəriətə uyğun olaraq bu gün onlar üçün bayram sayılır və bu günü bayram edirlər. Hər iki qrup öz vəzifəsinə əməl etdi. Ölkəmizin və dünyanın elm mərkəzlərinin astronomiya üzrə alim və ekspertlərinin proqnozu belə idi ki, bu il ramazan ayı otuz gün olacaq. Amma iyirmi doqquz gündən sonra kimin üçünsə şəvval ayının görünməsi sübuta yetsə, onun dini vəzifəsi həmin günü şəvval ayının biri bilməkdir. Bu məsələlər İslam şəriətində ixtilaf amili deyil. Dünənki günü şəvval ayının biri hesab edənlər öz vəzifələrinə və yəqinlərinə əməl etdilər, Allah-Taala yanında savabları da var. Qumda və Nəcəfdə olan bəzi təqlid müctəhidlərinə güvənən digər

insanlar üçün bu, sübuta yetmədi. Bu qrupun da Allah-Taala yanında savabı var. Bizim .vəzifəmiz bu idi, onların vəzifəsi də o

Mühüm məsələ vəzifəyə əməl etmək və ramazan ayının ehtiyatını əldən .verməməkdir

Əmirəlmöminin (ə) Nəhcül-bəlağənin bir xütbəsində buyurur ki, bu dünya hazırlaşmaq, sabahkı gün isə tələsmək günüdür.(١) Bu dünya hazırlaşmaq və məşq etmək yeridir. Allah görüşünə - qiyamətə hazırlıq olan bu böyük düşərgədə özünüzü ilahi hesaba hazırlayın. Bu gün məşq günü, hazırlaşmaq və özünü islah etmək günüdür. Sabah - yəni qiyamət günü bizim bu dünyada təyin etdiyimiz aqibətə sarı tələsəcəyimiz və yarışacağımız günüdür. Davamında buyurur ki, qiyamətdə qaliblərə cənnət vericələk, geri qalanlara isə cəhənnəm. Ölümündən öncə səhvlərinə görə tövbə etmək istəyən yoxdurmu?(٢) Əmirəlmöminin (ə) xalqı səhv etmişlərsə, səhvlərini düzəldib hidayət yolunu tapmağa və yaxşı yola qədəm qoymağa dəvət edir. Buyurur ki, bədbəxtlik günündən öncə özü üçün işləyib ehtiyat toplamaq istəyən yoxdurmu? Bizim həyatımız azuqə toplamaq üçündür. Bizim ticarətimiz, təhsilimiz, elmi işimiz, siyasi işimiz, ev işlərimiz və həyatımızın bütün sahələri Allah üçün işləmək və sabah üçün çalışmaqdan .ötrüdür

Qardaşlar, bacılar, möminlər və əziz İran xalqı! Öz sabahımız üçün işləyək. Bu iş dünyanı qurmaqdan, ruhu və cismi islah etməkdən ibarətdir. Bu iş öz maddi və mənəvi yüksəlişimiz, müsəlman qardaş və bacılarımızın, ölkəmizin və xalqımızın maddi və .mənəvi yüksəlişi üçün çalışmaqdan ibarətdir

.Fitr bayramı namazının xütbələrindən: ٢٠٠٣

səh:١٥٣

---

.Mən la yəhzuruhu əl-fəqih, c. ١, səh: ٥١۶ [١۴٠] -١

.Yenə orada, səh: ٥١٧ [١۴١] -٢

Ramazan ayının fitr bayramı ilə bitməsinin hikməti

Mübarək ramazan ayının fitr bayramı ilə bitməsində hikmətli məna vardır. Yəni ramazan ayı boyu insanların orucunun, ibadətinin, daxili şeytanla və əmmarə nəfslə mübarizəsinin nəticəsi olaraq bir bayram gəlir və onlar bu bayramda Allah-Taalanı .yada salmaq, Ona təzim etmək və Onunla ünsiyyət qurmaq üçün bir yerə toplaşırlar

İslam xalqı ibadətə, özünüislaha və nəfslə mübarizəyə dəvət etsə də, bunu yalnız fərdi bir əməl kimi tövsiyə etmir, Allahla bu əlaqəni, bu ibadəti, zikri, təzimi və təvəssülü dünya işində və gələcəklərini qurmaqda möhkəm bir addım atmalarına vasitə kimi də görür. Bəzi böyüklər buyurmuşlar ki, İslam ümmətinin xoşbəxtliyi üçün tövhid sözü və söz tövhidi (birliyi) iki qəti prinsipdir. Fitr bayramı və bu gün bizim namaz və dualarımız da söz tövhidinin və tövhid sözünün tərənnümüdür. Çünki həm mənəviyyat, həm Allaha təzim etmək və qarşısında kiçilmək, həm qəlbin Allahla əlaqəsinin iman vasitəsi ilə güclənməsi, həm vüqar, aramlıq və insan nəfsinin müxtəlif təlatümlərindən qurtulması, həm də bütün qüvvələri birləşdirmək və fəallaşdırmaqdır. Buna əsasən, bu gün həm bizim xalqımızın, həm də böyük İslam ümmətinin bu böyük və mühüm İslam .prinsipinə ciddi ehtiyacı var

.Quruluşun məsul şəxsləri ilə görüşdə çıxışından: ۲۰۰۳

### Oruc tutmaq – insanın ilahi əzabdan qorunması

Mübarək ayın ab-havasından bəhrələnmək üçün bu hədisi demək və barəsində bir qədər söhbət etmək istəyirəm. Əziz Peyğəmbərdən (s) nəql olunan səhih hədisdə buyurulur: Oruc cəhənnəm alovuna sipərdir. Eyni məzmun əhli-sünnə kitablarında da müxtəlif sözlərlə nəql olunmuşdur. O cümlədən buyurur: Oruc qiyamət günü mömin bəndənin sipəridir(١). Yəni siz dünyada öz silahınız və müdafiə vasitənizlə qorunduğunuz kimi, axirətdə də cəhənnəm alovu qarşısında özünüzü oruc vasitəsi ilə .müdafiə edəcəksiniz

Oruc hansı xüsusiyyətə malikdir ki, onun haqqında cəhənnəm alovuna sipər ifadəsi işlənmişdir. Cavab budur ki, oruc nəfsi saxlamaq xüsusiyyətinə malikdir: Nəfsinə istəyini (şəhvəti) qadağan edən...(٢) Günah və nəfs qarşısında dözümlülüyün rəmzi orucdur. Odur ki, hədislərdə Dözümlü olmaq və namaz qılmaqla (Allahdan) kömək diləyin!(٣) şərafətli ayəsinin təfsirində dözümlülüyü oruc kimi izah etmişlər. Oruc istəklərə göz yummaq rəmzidir. Orucun zamanı gündə bir neçə saatla və ildə bir neçə günlə məhdud olsa da, simvolik olaraq insan üçün əsaslı bir hərəkətdir. Nə üçün? Çünki nəfsin istəkləri, ehtiras və həvəslər insanı günaha doğru çəkən amillərdir. Nəfsin bütün istəkləri günah deyil, onların bəzisi halaldır, amma insanın nəfsin yolunu açması, öz nəfsini cilovsuz-noxtasız buraxması, onun əsirinə çevrilməsi Əmirəlmömininin (ə) Nəhcül-bəlağədə buyurduğu haldır: onu tərs və dəlisov atın belinə mindirmişlər və atın cilovu öz əlində deyil. Dəlisov at da onu aparıb uçurumdan yuvarladır. Nəfsin istəkləri .insanı bu şəkildə günahlara yuvarladır

### Günah – ilahi əzabın dünyəvi surəti

Günah ilahi əzabın dünyəvi surətidir. Şərafətli ayədə buyurulan "Həqiqətən, yetimlərin mallarını haqsızlıqla yeyənlərin yedikləri qarınlarında oda çevriləcək"(۴) sözünün mənası budur. Yəni siz yetimin malını yeyəndə məsələnin zahiri cəhəti bir malı yemək və bir haramı öz kisəsinə tökməkdir, amma mənəvi cəhəti öz daxilində alov yaratmaqdır. Bu, sözügedən cəhənnəm alovudur. İnsan burada haramın ləzzətini sınayır. Bu ləzzət məsələnin zahiri surətidir, əsl həqiqət isə həqiqi dünyada aşkar olunacaq - xəyal pərdələrinin insanın gözü önündən çəkildiyi və həqiqətlərin aşkara

kəs əvvəlcə gördüyü iş barədə xəbər verəcək".(١)Həmin gün bu dünya ləzzəti bir cəhənnəm əzabından və işgəncəsindən ibarət olacaq. Həmin gün həqiqətlər aşkara çıxacaq. İnsanın gördüyü işlərin həqiqətləri, məğzi və əsl surəti orada aşkarlanacaq. Bizim ruhumuz və həqiqi varlığımız da orada özünü göstərəcək. Burada yusifləri parçalayıb məzlum insanları ayaq altda tapdayan yırtıcının həqiqi surəti canavardır, insan deyil. Bu surət orada görünəcək və aşkara çıxacaq. Biz qiyaməti unutmamalıyıq. Qiyamət əzəmətli bir hadisədir. Biz həmişə qiyaməti yadda saxlamalı və ondan .qorxmalıyıq

## Qiyamət günü insanın Allahın hüzuruna gəlməsi

Şərafətli ayə qiyamət barədə buyurur: Ona inanmayanlar onun tez gəlməsini istərlər. İnananlar isə haqq olduğunu bilərək ondan qorxuya düşərlər(٢). Qüreyş kafirləri Peyğəmbərə (s) deyirdilər ki, bizi qorxutduğun qiyamət və cəhənnəm haradadır? Quran buyurur: İnananlar haqq olduğunu bilərək ondan qorxuya düşərlər. İman gətirənlər qiyamətdən qorxurlar. Qiyamət həqiqətən belədir. Qiyamətdən qorxmaq, onu unutmamaq lazımdır. Bu bizim qorunmağımıza zəmanət verir. Qiyamət Allah hüzuruna gəlmək günüdür: Onlar Rəbbinin hüzuruna cərgə-cərgə gətiriləcəklər(٣). İnsan öz həqiqəti, qəlbi, nəfsinin oturuşmuş xarakterləri ilə Allah-Taalanın hüzuruna gələcək. Burada da Allah-Taala bizim daxilimizi görür, amma orada daha heç bir pərdə olmayacaq. Bizim özümüz də anlayacaq, görəcək, özümüz özümüzü qınayacağıq. Həmin gün cəza və cavabdehlik günüdür; sözün həqiqi mənasında cavabdehlik, yersiz boyundan atmağın mümkün olmadığı cavabdehlik. Orada insanın yalançı və əbəs bəhanə gətirməsi ümumiyyətlə mümkün deyil. İnsan Allah-Taalanın qarşısında duracaq və O, insanın yalanını biləcək. Qiyamət güzəştsiz hesab günüdür. Bizim hamımız mühakimə olunacağıq. Qiyamət dilin bağlandığı gündür. Burada mümkün olan dillilik orada mümkün olmayacaq: Bu (qiyamət) elə bir gündür ki, danışa bilməzlər, onlara üzr istəməyə izin də verilməz(۴). Dil bağlanır, insanın xarakterləri və bədən üzvləri danışır. Əgər qəlbimizdə ədavət, paxıllıq, bədbinlik, bədxahlıq, müxtəlif mənəvi xəstəliklər, saleh insanlara qarşı kin-küdurət, günahlara rəğbət və həvəs gizlətmiş olsaq, orada hamısı aşkara çıxacaq. Qiyamət qəribə bir gündür: Bu gün onların .ağızlarını möhürləyirik

.(Etdikləri əməllər barədə onların əlləri Bizimlə danışır və ayaqları şəhadət verir(١

## Quranın qiyamət ayələrinə diqqət yetirmək

Qiyamətə aid ayələr çox təsirlidir. Mən təklif edirəm ki, hər birimiz təklikdə qiyamət ayələrinə nəzər salaq. Bizim buna ehtiyacımız var. Quranda qiyamət haqda yüzlərlə ayə var. Qiyamətə dair həm müjdələr var, həm təhdidlər. Onların hər ikisi təsirlidir. Quranın müjdələri də təsirli, gözəl və rəğbət doğurandır, təhdidləri də təsirlidir və insanın qəlbini yumşaldır: Onlar bir-birinə göstəriləcəklər. O günün əzabından qurtarmaq üçün günahkar öz oğullarını, həyat yoldaşını, qardaşını, ona sığınacaq verən tayfasını (qohum-əqrəbasını) və Yer üzündə olanların hamısını fəda etmək istərdi – təki özünü (əzabdan) qurtarsın!(٢). Günahkar şəxs ilahi əzabın şiddətindən öz övladını fəda edib qurtulmağı arzulayır. Öz əzizlərini və Yer üzünün bütün insanlarını qurban verib əzabdan xilas olmaq istəyir, amma bacarmır. Bu, ilahi əzabdır, zarafat deyil: Xeyr (bu mümkün deyildir). Həqiqətən, o (cəhənnəm) alovlu atəşdir. (Elə bir atəş ki) başın dərisini sıyırıb çıxardır. Çağırır (itaətdən) çıxanı, (imandan) üz döndərəni və ((mal-dövlət) yığıb saxlayanı!(٣

## Sirat körpüsü – bəndəlik və təqva körpüsü

İmam Səccad (ə) çox gözəl və mənəvi dua olan Əbu Həmzə duasında qiyamətdən qorxunu izah edir: Çılpaq, zəlil və çiynimdə ağır əməl yükünü daşıyan halda qəbrimdən çıxmağıma ağlayıram. Əvvəl sağ tərəfimə və sonra sol tərəfimə baxır, məxluqların məndən fərqli halda olduqlarını görürəm.(۴) O gün onlardan hər birinin istənilən qədər işi olacaqdır! O gün bir çox üzlər parlayacaq, güləcək, sevinəcəkdir(۵). Bir qrupun üzü gülür, razıdırlar, sevinirlər, üzüağdırlar. Bunlar kimlərdir? Həqiqəti orada, misalı isə bu dünyada olan Sirat körpüsündən keçə bilmiş şəxslərdir. Bu Sirat körpüsü bəndəlik və təqva körpüsüdür: Və (sizə buyurmadımmı ki) Mənə ibadət edin, doğru yol budur?!(۶)
(Bu dünyanın siratı (yolu) cəhənnəm üzərindəki yol və Siratdır. Peyğəmbərə (s



---

.Yasin/۶۵ [١۵١] -١

.Məaric/١١-١۴ [١۵٢] -٢

۳- [۱۵۳] Məaric/۱۵-۱۸.

۴- [۱۵۴] Bihar əl-ənvar, c. ۹۵, səh: ۸۹

۵- [۱۵۵] Əbəsə/۳۷-۳۹.

۶- [۱۵۶] Yasin/۶۱.

buyurur ki, sən həqiqətən doğru yoldasan.(١) Yaxud buyurur ki, yalnız mənə ibadət edin. Bu, düzgün yoldur.(٢) Bu, cəhənnəm üzərindəki Siratdır. Əgər buradakı siratdan (yoldan) düzgün, diqqətlə və sürüşmədən keçə bilsək, o biri Siratdan keçmək də çox asan olacaq; möminlərin ildırım sürəti ilə keçdiyi kimi: (Yaxşı əməllərin mükafatı olaraq) öncədən özlərinə ən gözəl nemət (cənnət, əbədi səadət) yazılmış kəslər – məhz onlar ondan (cəhənnəmdən) uzaqlaşdırılmış olacaqlar. Onlar (cəhənnəmin) uğultusunu eşitməyəcəklər(٣). Bunlar heç cəhənnəmin uğultusunu da eşitməyəcəklər: Onlar (cənnətdə) ürəklərinin istədiyi (nemətlər) içində əbədi qalacaqlar. Ən böyük qorxu onları məhzun etməyəcəkdir(۴). Ən böyük vahimə bir insan üçün mümkün olan ən güclü qorxudur. Belə fiziki və mənəvi cəhətlərə malik olan möminləri oradakı böyük vahimə qəmləndirmir. Bunlar bu siratdan keçmişlər. Əziz qardaş və bacılar! Bu sirat bizim üçün çox həssas məsələdir. Biz məsuliyyət daşıyırıq. Biz küçə və bazardakı adi adamlarla fərqlənirik. İstər parlament deputatı, istər hökumətin üzvü, istər hansısa hərbi sahənin komandanı, istər məhkəmə orqanlarında çalışan bir məmur kimi bizim işimiz ağırdır. Biz əgər yldan çıxıb səhv etsək və işimizdə qüsur yaransa, zərəri yalnız özümüzə yox, hamıya toxunacaq. Biz əgər zəif işləsək, səhlənkarlıq etsək, ölkə ziyan görəcək. Biz əgər Allah eləməmiş, qərarlarda nəfsimizə itaət göstərsək, dostbazlıq və cinahbazlıq etsək, həqiqi dəyərləri nəzərə almasaq, ölkə ziyan görəcək. Bizim işimiz çətindir. Biz cəhənnəmdən və çətin Siratdan keçmək barədə digərlərindən çox fikirləşməliyik. Bu bir neçə illik vəzifə həmişəlik deyil. Millət vəkilisiniz, hökumətin üzvüsünüz, nazirsiniz, müdirsiniz – bu üç il, dörd il, beş il, on il ötüb keçəcək. Əgər bu bir neçə ildə özünüzü sıxıb pul qazanmaq, qanunsuz gəlirlər əldə etmək, dövlət imkanlarından istifadə etmək və beytülmalı mənimsəmək fikrinə düşməsəniz – bu ki, çox çətin deyil – o zaman (Yaxşı əməllərin mükafatı olaraq) öncədən özlərinə ən gözəl nemət (cənnət, əbədi səadət) yazılmış kəslər – məhz onlar ondan (cəhənnəmdən) uzaqlaşdırılmış olacaqlar;(۵) Mələklər onları qarşılayıb: “Bu sizə vəd olunmuş gününüzdür!” – deyəcəklər.(۶) İlahi mələklər təqvalı və mömin şəxslərin yanına gəlib deyəcəklər ki, bu gün sizin gününüzdür. Bu gün peyğəmbərlərin tarix boyu möminlərə söz və müjdə

۱- [۱۵۷] Zuxruf/۴۳.

۲- [۱۵۸] Yasin/۶۱.

۳- [۱۵۹] Ənbiya/۱۰۱-۱۰۲.

۴- [۱۶۰] Ənbiya/۱۰۲-۱۰۳.

۵- [۱۶۱] Ənbiya/۱۰۱.

۶- [۱۶۲] Ənbiya/۱۰۳.

verdiyi gündür. Ləzzət alın, cənnətə daxil olun.(١) Biz digərlərindən çox ehtiyatlı olmalı və cəhənnəmdən qorxmalıyıq. Cəhənnəm odu daha yüksək vəzifəsi olanları daha çox təhdid edir, nəinki çox məhdud və kiçik vəzifəsi olan adi insanları. Bizim vəziyyətimiz .daha ağırdır

## Övladlara diqqətin və qayğının zəruriliyi

Burada əlavə etmək istədiyim başqa bir məqam övlad məsələsidir. Övladlarınızın qayğısına qalın: Ey iman gətirənlər! Özünüzü və ailələrinizi yanacağı insanlardan və daşlardan ibarət olan oddan qoruyun(٢). Bizim övladlarımızı özbaşına buraxmağa haqqımız yoxdur. Onların imanlarını qorumağa çalışın. Elə etməyin ki, gənc övladınızın – tələbə olan, ticarətlə, yaxud başqa bir işlə məşğul olan qız və oğlunuzun imanı zəifləsin. Bəzən insan özünün nəzarətdən xaric dili, əli və yanlış əməlləri ilə öz övladını dindən, dini əsaslardan, etiqad və prinsiplərdən uzaqlaşdırır və onu imansız edir. Bizdə belələri olmuşdur. Bu hər iki yöndən baş verə bilər. Bəzən əbəs tələbkarlıqlarla, – mən əbəs tələbkarlıqları əsla tövsiyə etmirəm – sərt və acı rəftarla uşaqları küsdürürlər. Bəziləri də o biri yöndən – laqeydliklə, biganəliklə, uşaqların ixtiyarına saysız-hesabsız imkanlar buraxmaqla və hər bir səhvlərinə göz yummaqla onları öz əlləri ilə məhv edirlər. Nəticədə uşaq pozulur və zay olur. Uşaqlarla məntiqlə, düzgün və mehriban şəkildə rəftar etmək lazımdır. Övladınızı və həyat yoldaşınızı qoruyun. Bu sizin borcunuzdur. Bu artan təsirə malikdir. Yəni Allah eləməmiş, bir ailədə övladda, yaxud ailənin bir üzvündə mənfi cəhət peyda olduqda, diş üzərindəki qara ləkə kimi həmin nöqtədə dişin minasını tələf etdikdən sonra tədricən öz ətrafına, ata-anasının zehninə də təsir göstərir və beləcə qarşılıqlı təsirlər doğurur. Nəticədə həqiqəti və mənəviyyatı .əldən verir

Bu şərafətli ayə mənim üçün həmişə maraqlı olmuşdur: İman gətirib övladları imanla arxalarınca gedənlərin nəsillərini də (cənnətdə) özlərinə qoşacağıq. Onların əməllərindən heç bir şey əskiltməyəcəyik(٣). Övladlarının imanını qoruya bilən şəxslərə – övladların əməli çox da dəyərli olmasa da, – uca mənəvi dərəcələrdə övladlarını da qoşarıq. Hədisdə deyilir ki, gözlərinin işıqlanmasından ötrü.(۴) Mömin olan sizlər öz uşağınızı mömin yetişdirmək istəsəniz, Allah-Taala qiyamətdə, cənnətdə və sizi gözləyən çətin yerlərdə bu

uşağın çatışmazlıqlarını düzəldər, gözünüzün və qəlbinizin işıqlanmasından ötrü onu .sizə qovuşdurar. Allah bir mömin üçün böyük dəyər tanıyır

Bizim əsas sözümüz bu dediklərimiz idi. Mən və siz öz yolumuzu düzgün getmək və bu ölkənin bizdən faydalanmasını istəyiriksə, öz qəlbimiz, qiyamətimiz, sabahımız və ilahi .hesabımız barədə fikirləşməli və bu işdə özümüzə güzəştə getməməliyik

.Quruluşun məsul şəxsləri ilə görüşdə çıxışından: ۲۰۰۴

səh:۱۶۰

Namazda iştirak edən bütün qardaş və bacılara və özümə ilahi təqvaya riayət etməyi tövsiyə edirəm. Cümə namazının birinci xütbəsinin əvvəlindən öz qəlbimizə və ruhumuza təqva ruhu aşılayaq, ramazan ayının orucundan, bu ayın mənəvi ab-havasından və ruhani paklığından istifadə edək. Qoy bizim qəlbimiz böyük təqva .xislətinə rəğbət göstərsin və sözün həqiqi mənasında təqvalı olaq

Bu gün ramazan ayının iyirmi biri və çoxlu ehtimallara görə qədr günüdür. Həm qədr günüdür, həm də Əmirəlmömininin (ə) şəhid olduğu gün. Keçən gecə ilin ən üstün üç gecəsindən – qədr gecəsi olması ehtimal edilən gecələrdən biri idi. İlahi mələklərin və Ruhun enməsi ötən gecə, yaxud o biri iki gecədən birində baş verdi və ya verəcək. İlahi mələklərin enməsi ilə öz ruhlarını mələyə bənzədənlərin xoş halına: O gecə mələklər və Ruh Rəbbinin izni ilə hər bir işdən ötrü yerə enərlər(۱). İlahi mələklərin yer üzünə və bizim aramıza enməsi bizim mələk xislətlərinə yaxınlaşmamıza kömək etməlidir. Şübhəsiz, Allahın bəndələri arasında keçən gecəni yaxşı şəkildə keçirən şəxslər olmuşdur, onların həqiqəti görən gözləri və dərk edən ruhları qədr gecəsinin həqiqətlərini dərk etmişdir. Bəlkə də kimlərsə mələkləri gözləri ilə görmüşlər. Siz əziz xalq da hər yerdə on doqquzuncu və iyirmi birinci gecələri yaxşı keçirdiniz və inşallah iyrimi üçüncü gecəni də belə keçirəcəksiniz. Görürük ki, bizim xalqımız, gənclərimiz, qadın və kişilərimiz bu gecələrdə həqiqətən paklanmaq istəyirlər; ürəklər yumşalır, gözlərdən yaş axır, ruhlar incəlir və oruc da buna kömək edir. Biz ümidvar olmalı, dua etməli və bu gecələrdən öz mənəvi yüksəlişimiz üçün istifadə etməliyik. Namaz mömünin meracı və yüksəliş vasitəsidir. Dua da mömünin meracıdır, qədr gecəsi də. Gərək yüksəlməyə çalışaq və bütün dünyada çoxlu insanları əsir edən maddi zibillikdən özümüzü bacardıqca uzaqlaşdıraq. Vurğunluqlar, pis xarakterlər, qeyri-insani və antihumanist xüsusiyyətlər, təcavüzkar və tamahkar xislətlər, fəsad, pozğunluq, zülm, insan ruhunun zibillikləridir. Bu gecələr bizi bunlardan daha çox .uzaqlaşdırmalı və ayırmalıdır

.Tehranın cümə namazı xütbələrindən: ۲۰۰۴

səh:۱۶۱

Gözəl məclis təşkil olunmuşdur. İnşallah ürəklər öncəkindən daha çox bir-biri ilə ünsiyyətdə olsunlar, bu ünsiyyət get-gedə artsın və bir-birindən qorxub qaçmasınlar. Bizim qəlblərimiz həmişə, xüsusən də bu ayın son ongünlüyünün çox faydalı .günlərində ixtiyarımızda olan həqiqətlərdən qorxmasın və onlarla ünsiyyətdə olsun

Ötən illərdə, həm qabaqkı, həm də indiki hökumət zamanı ramazan ayında biz adətən Nəhcül-bəlağədən bir cümlə oxuyub qısa şəkildə izah edirik. Mən bu il də həmçinin Nəhcül-bəlağənin müxtəlif yerlərindən iman haqqında bir neçə cümlə seçmişəm. Əlbəttə, şərafətli Nəhcül-bəlağə kitabında iman barədə daha çox sözlər var, lakin mənim kitabım iki cilddə çap olunmuş dördcildlik kitabdır və mən ٣٠-٤٠ ildir ondan istifadə edirəm. Buna görə, həmin cildlərdən birini seçib gətirməli idim və mən mərhum Əbdühün şərhi ilə çap olunmuş ikinci cildi - əslində üç və dördüncü cildləri .gətirmişəm

Həzrət Əli (ə) buyurur: İman tam aydın bir yol və ən işıqlı çıraqdır.(١) Bu cümlədə danışılan imanda məqsəd dini imandır; yəni Allah-Taalaya, qiyamət gününə, Peyğəmbərə (s) iman və dinlərin insanları dəvət etdiyi iman. Əlbəttə, imanın mütləq əhəmiyyəti bəllidir, çünki iman insanın əməl və hərəkətinin əsasıdır. İnsan bir şeyə könül verib inanmasa, hərəkət etməz. İman elmdən fərqli bir şeydir. İnsanın bəzən nəyəsə elmi olur, amma imanı olmur. Yəni imanda yalnız bilmək və doğruluğuna dair məlumatlı olmaq kifayət etmir, bundan əlavə bir şey lazımdır. Əlbəttə, elmsiz iman da mümkün deyil. İman şəkk və tərəddüdlə olmur, amma elm də təklikdə kifayət etmir. Siz Quranın Musa peyğəmbər (ə) və firondan danışarkən belə buyurduğunu görürsünüz: (Möcüzələrimizin) həqiqiliyinə daxilən möhkəm əmin olduqları halda, haqsız yerə və təkəbbür üzündən onları inkar etdilər(٢). Musa (ə) öz dəvətinə başlayanda fironun adamları onun doğru dediyini və haqq olduğunu bilirdilər. O özünün möhtəşəm möcüzəsini göstərəndə sehrkarların və cadugərlərin özləri – onlar Musanın (ə) işinin də bu tipdən olduğunu düşünürdülər - bu işin fərqli bir iş olduğunu etiraf etdilər, fironun təhdidinə rəğmən, səcdə edib Musaya (ə) iman gətirdilər və ölümü gözə aldılar. Bu zaman Musanın (ə) haqq olduğu hamıya aydın oldu, amma eyni zamanda onu inkar etdilər. Musanın (ə) doğru dediyinə yəqinləri vardı, amma inkar

etdilər. Nə üçün? Çünki hegemonluqları, nəfsləri və zülm istəkləri onları təslim olmağa qoymurdu. İman gətirmək bir növ təslim olmaqdır; həqiqi təslim olmaq. Bəzən insan həqiqəti anlayır, amma



---

۱- [۱۶۸] Nəhcül-bəlağə, səh: ۲۱۹.

۲- [۱۶۹] Nəml/۱۴.

qəlbini ona təslim etmir və onun qarşısında dayanır. Buna görə, elmin qarşı tərəfində cəhalətin və şəkkin durduğunu görürsünüz. İmanın qarşısında cəhalətdən danışmırlar, küfrdən, yəni həqiqəti örtməkdən danışırlar. İnsan bəzən həqiqəti qəbul edir, amma onu örtür və gizlədir. Örtməyin qarşı tərəfi imandır; yəni könül vermək, inanmaq, özünü ona tapşırmaq, həqiqəti bütün vücudu ilə qəbul etmək və ona təslim olmaq. Siz həqiqət saydığınız hər hansı bir şeyə iman gətirdikdə bu sizin əməlinizin əsası olur. Bu gün görürsünüz ki, bir qrup adam çox hərarətlə hansısa iqtisadi, yaxud ictimai proqramı müdafiə edir və onun üçün pullar xərcləyirlər. Daha aydın misal öz gənclik dövrümüzdə olan marksist təmayüllərdir. Sizin bəziləriniz o dövrü görmüsünüz. Bir qrup adam həmin marksist məfhumlar qarşısında həqiqətən canlarını verməyə hazır idilər. Bunlar könül vermiş və iman gətirmişdilər. Bu iman əməlin mənşəyidir, özü də belə bir çətin bir əməlin; mübarizə aparmaq, öldürmək və öldürülmək. Əgər bir əsasa iman olsa, o insan avtomatik olaraq həmin imanın məqsədlərinə sarı gedir, daim ona tapşırmaq lazım gəlmir. İmanın ardınca əməl gəlir. Sonrakı cümlədə buna .toxunacağam

Dedik ki, burada Əmirəlmömininin (ə) məqsədi dini imandır, batil bir şeyə, bütə və bütpərəstliyə iman deyil; şəriki olmayan Allaha, nübüvvətə, həqiqətə və qiyamətə imandır. Buyurur ki, bu imanın yolu çox aydındır. Əgər insan öz ağlı və fitrəti ilə bu yola qoşulsa, yolun aydın, şəksiz və şübhəsiz olduğunu görər. İnsan imanla saleh əməllərə nail olur. İnsanı dartıb saleh əməllərə sövq edən imandır. Sonra dərhal buyurur: və saleh əməllər də imana yönəldir.(١) Yəni onların arasında qarşılıqlı təsir vardır. Mənim fikrimcə, bu çox mühüm məqamdır. Biz öz imanımızı saleh əməllə gücləndirməliyik; .necə ki, saleh əməli də iman vasitəsi ilə tanımalıyıq

Siz Ühüd döyüşündə baş verən hadisəyə diqqət yetirin. Bu on dörd əsr boyunca bütün müsəlmanların nifrininə və gileyinə düçar olan o əlli nəfər müsəlman idilər, Peyğəmbərin (s) səhabələri idilər, onların çoxusu Bədr döyüşündə iştirak etmişdilər, pis adamlar deyildilər. Amma onlar həmin problemə düçar oldular, yəni qənimət toplamağa görə keçidi tərk etdilər, meydanı düşmənə verdilər və çoxlu pak qanların tökülməsinə səbəb oldular; bu əlli nəfərin səhlənkarlığına görə Həmzə Seyyidüş-şühəda kimi bir insanın qanı töküldü, Peyğəmbər (s) yaralandı, İslam hökuməti və yeni

İslam quruluşu zəiflədi. Quran bu əlli nəfər barədə buyurur: (Ühüd müharibəsində) iki ordu qarşılaşdığı gün sizdən üz döndərənləri Şeytan, məhz etdikləri bəzi əməllərlə



---

.Tühəf əl-üqul, səh: ۱۶۴ [۱۷۰] -۱

yoldan çıxmağa məcbur etdi.(١) Yəni bunların etdiyi iş bundan öncə etdikləri səhvlərin nəitcəsi idi. Hər bir səhv öz növbəsində insanı başqa səhvlərə məcbur edir. Yəni imanın təməlini zəiflədir və imanın zəifliyi özünün pis təsirini bizim sonrakı əməllərimizdə göstərir. Biz səhvə yol verdikdə bu səhv hissolunmaz şəkildə olsa da, bizim imanımıza təsir edir: Şeytan onları məhz etdikləri bəzi əməllərlə yoldan çıxmağa məcbur etdi. Bir nəfər öncə bir yanlış iş görür, sonra bu yanlışlıq onun imanına mənfi təsir göstərir, insanın özünün isə xəbəri olmur; çox zaman insanın bir vəziyyətdən başqa bir .vəziyyətə düşdüyü, lakin öz vəziyyətinin dəyişikliyini hiss etmədiyi kimi

Allah mərhum cənab Xatəmiyə rəhmət eləsin! Mən ١٩٧٨-ci ildə sürgündən qayıdanda Ərdəkanda onu ziyarət etdim. O zaman təxminən ٧٠ yaşı vardı. Deyirdi ki, mən özümü qoca hiss etmirəm; dilimdə deyirəm qocayam, amma qoca olduğumu əsla hiss etmirəm, özümü ٣٠-٣٥ yaşımdakı kimi təsəvvür edirəm. Mən illər sonra ondan soruşdum ki, siz bir zaman mənə belə bir söz dediniz, indi də elədirmi? Dedi ki, bəli, elədir. İndi bizim özümüz də eləyik. Biz ağsaqqalların və qocaların özümüz haqda təsəvvürümüz otuz il öncəki kimidir. Biz ömrün ötməsini, bütün hissolunan fiziki təsirlərinə rəğmən, baş vermiş böyük dəyişiklikləri dərk etmirik. İman dəyişikliyi də belədir, insan imanın azlığını hiss etmir. Onun hətta hissolunan fiziki təsirləri də yoxdur ki, insan anlasın və dərk etsin. Deməli, o səhv imana təsir göstərdi. İmanın azlığı bizim sonrakı əməllərimizə öz təsirini buraxır. Misal üçün, cihad və imtahan qarşıya çıxdıqda bizim imanımızın azlığı özünü göstərir. Çoxlu imanla hansısa bir yerdə yüksələ bilən, hərəkət edən və böyük iş görən bizlər həmin işin qarşısında qaldıqda əl-ayağımızın titrədiyini görürük. Misal üçün, bir şəxs gənclikdə ikimetrlik bir kanaldan atıla bilirdi, indi isə bacarmır. Əməlin iman və imanın əməl üzərindəki mənfi təsirinin nəticəsi Ühüd döyüşünün məğlubiyyəti olur, müxtəlif geriliklər olur. Nəticə bu olur ki, Peyğəmbərin (s) hicrətindən ٦٠ il və o həzrətin vəfatından ٥٠ il sonra Peyğəmbərin (s) ən əziz adamı və nəvəsi İmam Hüseyn (ə) Peyğəmbər canişininin hökuməti qarşısında dayanır və elə faciəli şəkildə şəhidliyə qovuşur. Mən bir dəfə dedim ki, bunlar tarixin ibrətləridir, .dərsdən üstündür

## İmanın dörd şərti və təməli

Nəhcül-bəlağənin otuzuncu hikmətində qeyd olunur ki, həzrət Əlidən (ə) iman haqda

danışmasını istədilər. Buyurdu ki, imanın dörd təməli var.(۲) Məqsəd



---

.Ali-İmran/۱۵۵ [۱۷۱] -۱

Yenə orada, səh: ۴۷۳ [۱۷۲] -۲

odur ki, bunlar möhkəm olsa, iman qalar, zəifləsə, yaxud uçsa, iman da uçar. Tamamilə məhv olmaz, amma uyğun nisbətlə uçar. Həzrət bu dörd təməli bəyan edir: dözüm, yəqin, ədalət və cihad. Birincisi budur ki, bütün işlərdə dözüm olmalıdır. Bir proqramı icra etmək istəyirsinizsə, sona qədər gedin. Bir işə başlamısınızsa, onu bitirin. Əgər bir bəla gəlmişsə, özünüzü itirməyin. Boynunuza vacib bir əməl düşdükdə onu yerinə yetirməyə dözümünüz olsun, hövsələdən çıxmayın, əldən düşməyin. Əgər bir günah təhlükəsinə düşmüsünüzsə, müqavimət göstərin və günaha təslim olmayın. Müqavimət hər yerdə bir formada təzahür olunur. Əlbəttə, müqavimətin mənası hər yerdə eynidir; bəlli insani qüvvə, möhkəmlik və davamlılıqdır, lakin bu hər yerdə özünü bir formada göstərir: itaət qarşısında dözümlülük, günah qarşısında dözümlülük, .müsibət qarşısında dözümlülük

İmanın digər təməli yəqindir. Qeyd etdiyimiz kimi, yəqin elə elmdir. Yəqin təməlini zəiflətmək, şəkk-şübhəni qarışqa kimi imanın canına salmaq olmaz. Yəqini güclü saxlamaq lazımdır. Əgər təbii şəkildə insanın zehnində bir sual yaransa, gedib onu öyrənməli, şəkk-şübhəni aradan qaldırmalıdır. Amma özü vəsvəsə etməməli, özündə, yaxud digərlərində yəqini sıradan çıxarmamalıdır. Yəqin olunan məsələlərdə tərəddüd .yaranıb şəkkə çevrilməməlidir

İmanın üçüncü təməli ədalətdir. Ədalət hər şeyi öz yerinə qoymaqdır. Ədalətin leksik mənası orta hədd deməkdir. Mötədillik bu sözdəndir; yəni ifrat və təfrit etmədən, sola və sağa yayınmadan öz yerində durmaq. Ədalətin hər şeyi öz yerinə qoymaqdan ibarət olduğunu da buna görə deyirlər. Yəni hər şey öz yerinə qoyulduqda təbiətdə ədalət və həqiqət əsasında bir mötədillik yaranır. İnsanın rəftarında ədalət vacib məsələdir. Hökmdara ədalət lazımdır, mövqe seçməkdə ədalət lazımdır, məhəbbət və nifrət bildirməkdə ədalət lazımdır. Quranda buyurulur: Hər hansı bir camaata qarşı olan kininiz sizi ədalətsizliyə sövq etməsin(١). Buna əsasən, ədalət də imanın .təməllərindən biridir; əgər ədalət olmasa, iman qalmaz

Sonuncu təməl cihaddır. Cihad mübarizə deməkdir, müharibə və döyüş demək deyil. Deyirsən mən mübarizə aparıram; elmi mübarizə aparıram, ictimai mübarizə aparıram, siyasi mübarizə aparıram, silahlı mübarizə aparıram - bunların hamısı mübarizədir. Mübarizə bir maneə, yaxud düşmən qarşısında güclü səy deməkdir. Əgər

insanın qarşısında heç bir maneə olmasa, mübarizə də yoxdur. Asfalt yolda insan ayağını qazın üzərinə qoyub gedir. Buna mübarizə demirlər. Mübarizə insanın bir maneə ilə qarşılaşdığı yerdədir. Müharibədə bu



---

.Maidə/۸ [۱۷۳] -۱

maneə düşməndir, təbii yerlərdə təbii maneələrdir. Əgər insan bu maneələrlə üzləşsə və onları aradan qaldırmağa çalışsa, bu olur mübarizə. Ərəb dilində cihad sözünün mənası məhz budur, mübarizə deməkdir. Quran və hədislərdə işlənən cihad sözü də bu mənayadır, hər yerdə silahlı döyüş demək deyil; bəzi yerlərdə silahlı döyüşlə uyğun .gəlir, bəzi yerlərdə isə qeyri-silahlı döyüşlə

Sonra Əmirəlmöminin (ə) bu sözləri izah edir. Mən bu haqda danışmayacağam. O həzrət həm dözümlülüyü, həm yəqini, həm ədaləti, həm də cihadı şərh edir. Məsələn, deyir ki, cihadın dörd şaxəsi var: yaxşı işlərə dəvət etmək, pis işlərdən çəkindirmək, doğru danışmaq və mövqedə sədaqətlilik; yəni insan siyasi və ictimai mövqelərdə sadiq olsun. Odur ki, mövqelərdə sadiqliyin özü də cihaddır. Möminlərin arasında .elələri də vardır ki, Allaha etdikləri əhdə sadiq olarlar(۱) ayəsinin mənası da budur

Cihadın şaxələrindən başqa birisi "fasiqlərə qarşı olan kin",۲ yəni günah və küfr cərəyanından ayrılmaqdır. Bunu mən xüsusən sizə deyirəm. Hamı buna diqqət yetirsin. Siz bu cərəyandan uzaq durmalı, ona qarışmamalısınız. Siz məni tanıyırsınız, sizinlə təxminən səkkiz ildir, bəzilərinizlə isə daha çox vaxtdır işləyirik. Mən kafirlərlə əlaqənin kəsilməsini əsla düzgün saymıram. Xeyr! Lakin sizinlə kafirlər arasında sərhəd bəlli olmalıdır; sizinlə günahkarlar arasında sərhəd bəlli olmalıdır; sizinlə İslam Respublikasını qəbul etməyənlər arasında sərhəd bəlli olmalıdır. Bəzən insanın İslam Respublikasını qəbul etməyən bir şəxslə münasibətdə olması lazım gəlir, amma onun və sizin kimliyiniz bəlli olmalıdır. Bir-birinizə qarışmayın. Mən öz quruluşumuzda və təşkilatımızda bəzilərindən həmişə buna görə gileyli olmuşam. Onlar sərhədləri götürürlər. Bəzən bunlara deyirdim ki, sizin sərhədləri götürmənizin eybi budur: sərhədin olmadığına görə çoxları bu tərəfdən o tərəfə keçəcəklər, o tərəfdən bu tərəfə; daim get-gəl edəcəklər. Yəni sərhədlər unudulacaq. Bir ölkənin sərhədləri bəlli olmasa, ümumi kimlik və birlik olmaz. Qoyun sərhədlər müəyyən olsun, sizin harada .durduğunuz və onların harada durduğu bəlli olsun

## Sabit və birovuz iman

İman Əli (ə) buyurur ki, iman iki növdür: sabit iman və birovuz iman. Birovuz iman da imandır. Onun sahibi münafiq deyil, amma imanı möhkəm deyil və tez məhv olur. Sabit

iman isə qəlbə hopmuş, dəlili və dərin baxışı olan və saleh əməllə dəstəklənən imandır. İmanın başqa növü məntiqlə deyil, hisslərlə yaranan imandır. İnsan onun üçün saleh əməl etməyib, sadəcə iman



---

.Əhzab/۲۳ [۱۷۴] -۱

şüarı verib. Bəzən çox sərt şüar verib, amma onun üçün öz nəfsi ilə mübarizə aparıb saleh əməl xərcləməyib. Yəni bu iman saleh əməllə suvarılmamışdır. Bu olur birovuz iman. Buyurur ki, bu iman müəyyən vaxta qədər qalır, sonra isə sinəsində gizlətdiyi bir sərçə kimi uçub gedir. Çünki bu iman onun vücudundan olmamışdır. Bu növ iman nə zaman məhv olur? İmtahan zamanı və nəfsin baş qaldırdığı anlarda. Məsələn, kimsə pulgirdirsə, pul və imandan ibarət olan iki yol arasında qaldıqda imanı uçub gedir. Bəziləri nəfsin həvəslərinə və cinsi ehtiraslara qarşı zəifdirlər, bəziləri vəzifəpərəstdirlər; hər kəs bir cürdür. Bizim hər birimiz üçün uçurum vardır. Bu uçurun gicgahımız kimidir. Allahdan istəyək ki, ona zərbə toxunmasın. Bunun yolu isə təqvadır. Mən bu məclisdə və digər məclislərdə həmişə təqvadan danışıram. Təqva özündən ehtiyatlı olmaq deməkdir. İnqilabın əvvəlindən indiyədək bəzi adamların ١٨٠ dərəcəli dönüşlərinin sirri bundadır. İnqilabın əvvəlindən iyirmi beş il ötür və indi siz bəzilərinin ١٨٠ dərəcə döndüyünü görürsünüz; yəni ixlaslı, sədaqətli, fəal və şüar verən bir mömindən inadkar müxalifə və bəhanə axtaran düşmənə çevrilmişlər. Bizim bir neçə növ düşmənimiz var: bəziləri düşməndirlər, amma daim inqilabın üzünü cırmaqlamaq istəmirlər, bəziləri isə yox, daim inqilabın və İslam quruluşunun üz-gözünü cırmaqlamaq istəyirlər. Baxanda görürsən ki, bunların bəzisi çox sərt və radikal idilər, çoxlarını qəbul etmirdilər, çır-çırpıdan qalxan şölə kimi idilər. Düzdür, bəzən möhkəm odundan da böyük şölə saçılır, amma heç bir şeyi olmayan çır-çırpıdan qalxan şölə tez sönür. Bizdə beləəri də var. Bunların imanı sabit deyil, birovuz və zəifdir və güclü dəlillərə söykənmir. Qeyd etdiyim kimi, bu iman məhv olub gedəndə zəng vurub xəbər etmir; demir ki, mən getdim, bu saatdan sonra daha kafir oluram və namaz qılmayacağam. İnsan tədricən anlamır və bu imanın necə məhv olduğunu bilmir. Çox .ehtiyatlı olmaq və Allaha sığınmaq lazımdır

### Əmirəlmöminin Əlinin (ə) Malik Əjdərə fərmanında olan çoxlu hikmətlər

Dördüncü və sonuncu cümlə həzrət Əlinin (ə) Malik Əjdərə fərmanına aiddir. Onun bu məktubu çox möhtəşəmdir. Bu məktubda olan hikmətlər doğrudan da saymaqla qurtaran deyil. İnsan bu məktubun dərin məzmununa baxanda onun hər bir cümləsində olan əzəmət qarşısında həqiqətən təzim hissi keçirir. Buyurur ki, Yerin məhvi Yer adamlarının yoxsulluğundan yaranır. Yəni camaat yoxsul olanda Yer məhv olur. Həzrət bunu fəlsəfi bir məsələ kimi demir, reallıq kimi bəyan edir. Burada Yer

dedikdə məqsəd Malik Əjdərin getdiyi Misir məmləkətidir. Əlbəttə, o zaman Şam, İraq, İran, Mədinə və hər bir ölkə və

ya vilayət Misirlə müqayisəolunası idi. Deyir ki, sən getdiyin yerdə xalqı varlandıra bilsən, ora abadlaşacaq. Əgər xalqı yoxsul saxlasan və ya yoxsul etsən, məmləkət də abad olmayacaq, xaraba qalacaq. Öz fəallıqları və bacarıqları ilə məmləkəti abadlaşdırmalı olan xalqın özüdür. Yerin hər tərəfini abadlaşdıran amil insanların yaradıcılığıdır. Sonra buyurur ki, xalqın yoxsulluğu hakimlərin təqsiridir.(١) Xalqın yoxsulluğuna onlar bais olurlar. Çünki sərvət və mənafeyi özləri mənimsəyirlər və bu, xalqın yoxsulluğuna səbəb olur. Əlbəttə, bir zaman hakimlər qədim müstəbidlər kimi olurlar. Məsələn, Rza xan hər şeyi istəyirdi və heç bir şeylə doymurdu. Bir qrup da onun yanında istifadə edir və bacardıqlarını aparırdılar. Şahın payı birinci idi, sonra da tədricən şahın ətrafında duranların hər biri öz qədərincə aparırdı. Qədim avtoritarlar belə idilər. Əlbəttə, Pəhləvi hökuməti onun daha müasir forması idi, daha qədim formasını da kitablarda Qacarlardan, Nasirəddin şahdan və digərlərindən oxumuşuq. Bir forması da modern üsuldur – yəni zahirən demokratik, əslində isə avtoritar olan hökumətlərin üsulu. Bu gün bu hökumətləri iqtisadi kompaniyalar idarə edir. Onlar siyasi ideoloqlardır. Zahirdə heç kimdirlər, amma əslində parlamentə deputatı bunlar göndərirlər, prezidenti bunlar iş başına gətirirlər. Prezidentin köməkçiləri var, səfirlər var, nazirlər var, müxtəlif sahələrin başçıları var. İstibdadın icra növü də qabaqkı kimi deyil ki, desin hökm edirəm. Rza xan müstəbidlik edəndə Tehranda bəyanat verir və onda dörd-beş dəfə hökm edirəm sözünü işlədirdi. Bu gün hakim demir ki, hökm edirəm. O öz demokratik nəzakətini əldən vermir, əsla hökm etmir, amma mahiyyəti elə hökmdür. Yəni bu kompaniya üçün lazım olan qanun mütləq qəbul olunur. Bu kompaniyaların yaşaması üçün lazım olan işlər mütləq görülür; hətta İraq kimi bir .ölkəyə hücum etməklə olsa belə

Məgər İraqın abadlaşmasından və neftindən kimlər istifadə edirlər? Amerikanın, yaxud İngiltərənin hökumət başçıları dövlətin mənafeyi üçün çalışmırlar ki, kompaniya, neft və hər şey dövlətə məxsus olsun və onun istifadə etdiyini deyək. Xeyr! Hər bir yeni şeydən bu ölkələrə hakim olan maliyyə və iqtisadi qurumlar istifadə edir. Onlar öz aralarında rəqabət də aparırlar, bir-birinə düşmənlikləri də var, amma Orta Şərqin neftindən, Orta Şərqə hökmranlıqdan və Böyük Orta Şərq layihəsindən istifadə edənlər həmin maliyyə qurumlarıdır, sonda faydalanan onlardır. Hökumət, prezident, Xarici işlər naziri, Müdafiə naziri və digərləri də çox zaman ölkənin əsas

maliyyə və sənaye müdirlərindən olurlar. Ön cəbhə və ön xətt onlardır, dəstəkləyir və .dayaq olurlar



---

.Yenə orada. ۴۳۷ [۱۷۶] -۱

Siz deyə bilərsiniz ki, məsələn, ABŞ-da, yaxud İngiltərədə bu ölkələrin əhalisinin nisbətinə görə yoxsul yoxdur. Bunu hesabalamaq lazım deyil. Baxmaq lazımdır ki, İngiltərə dövləti Hindistan yarımadasında nə qədər yoxsul yaratmışdır; yaxud Afrikanı və ya Latın Amerikasını müstəmləkəyə çevirən hansısa dövlət orada nə qədər yoxsul yaratmışdır; yaxud bu gün ABŞ bütün dünyada malik olduğu iqtisadi təsir gücü ilə dünyada nə qədər yoxsul, aclıq və məhrumluq yaratmışdır. Meyar bunlardır. Əlbəttə, bu ölkələrin özündə də yoxsulluq, yoxsul və təbəqələrarası fərq olduqca çoxdur; ümumiyyətlə heyrətamizdir. Təəssüf ki, bəzən bizim statistikalarda yersiz, sadəlövh və yaxıngörən fikirlər müşahidə olunur ki, məsələn, ölkəmizdə iqtisadi fərqlər ABŞ-dan, yaxud filan yerdən çoxdur. Bunlar reallıqları bilməzlikdən deyilən sözlərdir. Onların reallıqlardan heç bir xəbərləri yoxdur. Xeyr, kapitalist ölkələrində iqtisadi uçurum dəhşətli, təsəvvürolunmaz və dünyanın hər yerindən çoxdur. Bundan əlavə, onları o ölkələrin özündə ölçmək düzgün deyil, bütün dünya üzrə hesablamaq lazımdır. Çünki bunların təsir, güc və hərəkət dairəsi bütün dünyadır. Biz indi hələlik beynəlxalq məsələlərdən danışmaq istəmirik, özümüzü götürürük, özümüzdən danışırıq. Əgər dünyanın düzəlməsini istəyiriksə, özümüzə nəzarət etməliyik. Başçı və müdir olan, ölkənin maliyyə, sənaye, əkinçilik işlərinə və mühüm instansiyalarına rəhbərlik edən mən və siz özümüzə nəzarət etməliyik. Yalnız özümüz deyilik, biz dedikdə bütün orqanları nəzərdə tuturam. Siz - yəni siz, müavinləriniz, müdirləriniz və digər aparıcı məmurlarınız. Əlbəttə, bir tərəfdə və çox aşağı bir səviyyədə birinin nəzarət və proqnozdan kənar bir səhv etməsi mümkündür. Bu başqa məsələdir, amma sizin başçılıq etdiyiniz təşkilatınız bu xüsusiyyətlərə malik olmalıdır. Buyurur ki, hakimlər xalqı yoxsul edir, çünki hər şeyi özləri üçün istəyirlər, qalan ömürlərindən ötrü də nigarandırlar. Nigaran və bədgüman olmaq lazım deyil. Allah-Taalaya nikbin olmaq lazımdır. Həmçinin buyurur ki, onlar ibrətlərdən az istifadə etdiklərinə görə belə .edirlər

Ümidvaram dediklərim əvvəlcə özümə təsir etsin. Hamıdan çox ehtiyacı olan həqiqətən mənəm. Bizim belə mövzuları seçib danışmaqda məqsədimiz budur ki, özümüzə təsir etsin, Allah yolunda, doğru yolda hərəkətimiz daha həqiqi və daha ciddi olsun. Kumeyl duasında oxuyuruq ki, İlahi, öz qorxunda bizə ciddilik bəxş et![١] İnsan Allah qorxusunda ciddi olmalı, onu zarafat saymamalıdır. Bunlar zarafat götürən

məsələlər deyil. Əgər biz ağıllı olsaq, həyatın həqiqi məsələlərini heç zaman zarafata salmarıq, ciddi qəbul edərik. Ölüm məsələsi, qəbir məsələsi, ilahi sorğu-sual, bərzəx və qiyamət məsələsi bu



---

.İqbal əl-əmal, c. ۲, səh: ۷۰۹ [۱۷۷] -۱

həyatın işlərindən daha ciddidir. Bunları zarafat saymaq olmaz, ciddi saymalıyıq. .Bunlar mühüm məsələlərdir

.Dövlət Şurasının üzvləri ilə görüşdə çıxışından: ۲۰۰۴

səh:۱۷۰

## Ramazan – Yer əhalisinin mələklərlə yoldaşlığı üçün müstəsna fürsət

Ramazan ayı çox müstəsna və əlverişli bir fürsətdir. Allah-Taalanın lütfü ilə bu il də bizə bu fürsət verildi və bu mübarək ayda ilahi ziyafət süfrəsində əyləşə bildik. İl ərzində bu müstəsna fürsətin bənzəri yoxdur. Ramazan ayında ilahi mələklərlə və əmanətdar Ruhla oturmaq biz Yer sakinləri üçün çox böyük səadətdir. O gecə mələklər və Ruh Rəbbinin izni ilə hər bir işdən ötrü yerə enərlər(١). Ramazan ayında olan qədr gecəsi Yer əhalisinin göyün mələkləri ilə yoldaşlıq etdiyi gecədir. Bəşər karvanının bir sona doğru daimi hərəkət halında olduğu kimi, hər bir insan da öz həyatında bir sona və mənzilə doğru hərəkət halındadır: Sən (ölənə qədər) Rəbbinə doğru çalışıb çapalayırsan. Sən Ona qovuşacaqsan(٢). Bu uzun və enişli-yoxuşlu yol müxtəlif keçidlərdən keçir, onda əziyyətlər, bəlalar, çətinliklər, eləcə də qurtuluş, uğur və sevinc var: Onları yaxşı-yamanla imtahan etdik.(٣) Bunların hamısı sınaqdır. Bütün insanların keçməli və özlərini insani kamillik zirvəsinə - yəni Allahla görüşə çatdırmalı olduğu bu uzun yolun bəzi hissələrində hərəkət etmək çətindir. Bu, adi həyatın yollarına bənzəyir. Bəzən insan çətin bir keçiddən, bəzən çətin yoldan keçməli, bəzən bir aşırımla qalxmalı olur; bəzən insanın yoluna bataqlıq çıxır, bəzən də yol geniş və minik yaxşı olur.

Biz il ərzində və uzun yolumuzda nəfsin istəkləri və günahlarla rastlaşarkən və öz əlimizlə yaratdığımız qaranlıq yerlərdə problemlərə düçar oluruq. Bəzən insan üçün dua halı çətin yaranır, bəzən bir damla göz yaşı tökmək çətin olur; çünki yol çətindir və biz öz səhvlərimiz və günahlarımızla əhatə olunmuşuq. Ramazan ayı isə hərəkətin asan olduğu hissədir. Sanki bir yerə, yaxud bir şəhərə sarı getdiyiniz bu çətin yolda bəzən piyada getməyə məcbur olursunuz, bəzən sudan, bəzən də bataqlıqdan keçməyə. Bir dəfə də bir hava limanına çatırsınız və təyyarə sizi sürətlə və rahatlıqla məqsədə çatdırır. Ramazan ayı girəndə insan bu hava limanına çatmış olur. Allah-Taala ramazan ayında yolu açmışdır. Ramazan ayında mühit əngəlsizdir. Sizin tutduğunuz bu oruc nəfsi və onun istəklərini zəncirləyir. Bu ibadətlər, bu dualar, bu təzimlər, bu zikrlər və bu qədr gecəsi sizi kilometrlərlə irəli salan sürətli vasitələrdir. Əgər çalışsaq və özümüzü çatdırsaq, il boyu və digər aylarda bəzən metr-metr getməli olduğumuz yolu ramazan ayında fərsəng-fərsəng gedərik. Məhz buna görə Allah övliyaları ramazan ayı çatanda sevinir, onunla ayrılanda isə ağlayırdılar.

İmam Səccad (ə) güman ki, Səhifeyi-Səccadiyyənin ۴۵-ci duası olan ramazan ayı ilə vidalaşma duasında bu ayla ayrıldığına görə fəryad edir və ramazan ayını dəfələrlə salamlayır: Salam olsun sənə! Burada salam əziz ramazan ayı ilə, bu nurlu gündüz və gecələrlə vidalaşma və xudafizləşmə mənasındadır; bizim ömrümüzün və bütün ilin bir .cənnət parçası olan ramazan ayı ilə vidalaşır

## Ramazan – təqva ehtiyatı toplamaq ayı

Ramazan ayının səmərəsi təqvadır; insanın özü ilə məşğul olması, öz qeydinə qalması və özü üçün təqva ehtiyatı toplaması: Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də vacib edildi ki, (bunun vasitəsilə) təqvalı olasınız.(۱) Ramazan ayı bizdə təqva yaradır. Bu təqvanın özü də daha uca məqamlara vasitədir. Təqva bizi uca məqamlara çatdıran minikdir: Təqvalı olun ki, nicat tapasınız(۲); Təqvalı olun ki, rəhm olunasınız(۳); Təqvalı olun və Allah (ehtiyacınız olan şeyləri) sizə öyrədər(۴). Elm, hidayət və ilahi rəhmət Allah tərəfindən insana təqvaya görə bəxş olunur. Hamısından üstünü qurtuluşdur. Qurtuluş təqvaya görə əldə olunur. Mənim əzizlərim! Ramazan ayında əldə etdiyimiz təqva ehtiyatını - əgər ilahi ziyafət süfrəsində dayanmış və ondan bəhrələnmişiksə, ümidvarıq əldə etmiş olaq - qorumalıyıq. Bu çox dəyərli səmərədir; zəhmət çəkib öz buğda məhsulunu yığan, sonra onu yaxşı bir anbarda saxlayan və il boyu ondan istifadə edən bir əkinçi kimi. Bu bizim il boyu azuqəmizdir. İl boyu bu azuqə təhdid olunur: vəsvəsələr var, bərbəzəklər var, nəfsin istəkləri, ehtiraslar və günahlar var. Bunların hamısı bu dəyərli ehtiyat üçün təhlükələrdir. .Həmin təhlükələrə qarşı bu ehtiyatdan istifadə edin və onu qoruyun

Bu gün bayramdır: Elə bir gün ki, onu müsəlmanlara bayram, Məhəmməd (s) və Əhli-beytinə (ə) ehtiyat, şərəf, hörmət və üstünlük etmisən(۵). Fitr bayramında Peyğəmbər (s) üçün təyin olunmuş bu üstünlük odur ki, Peyğəmbərin (s) biz ardıcılları dünyanın harasında olsaq, həyatın çətin yollarını keçmək, dünya və axirəti abadlaşdırmaq və .qurtuluşa nail olmaq üçün özümüzü bu təqva ehtiyatı ilə silahlandıraq



---

۱- [۱۸۱] Bəqərə/۲۱.

۲- [۱۸۲] Bəqərə/۱۸۹.

۳- [۱۸۳] Hucurat/۱۰.

۴- [۱۸۴] Bəqərə/۲۸۲.

۵- [۱۸۵] İqbal əl-əmal, c. ۱, səh: ۲۸۹.

## İslam inqilabı – cəmiyyətdə Quranın qürbətini aradan qaldıran amil

Bu gün Allaha şükür olsun ki, İslam quruluşunun sayəsində ölkəmizdə Quran sədası ucalmışdır. Bizim əziz gənclərimiz bilsinlər ki, bir zaman Quran bu ölkədə sözün həqiqi mənasında qərib idi. Təkcə Qurana əməl etmək və ona sayğı göstərmək yox, hətta Quranın oxunuşu da qərib idi. Bəzən nümayişkarlıq üçün bir tərəfdə bir hərəkət görünürdü. Amma Quran ölkə xalqı, xüsusən də bizim gənclərimizin arasında ideal və hakim cərəyan deyildi. Bu gün mən baxıb görürəm ki, Quran oxunuşunu lazımi həddə yerinə yetirən gənclərin və hətta yeniyetmələrin sayı çoxdur. Bu gün burada Quran oxuyan əziz gənclərin hamısı doğrudan da çox yaxşı oxudular. Bu Quran hərəkatı .ölkədə tədricən güclənmişdir

Mən dəfələrlə demişəm, yenə də deyirəm: Biz bu ölkədə Quranla ünsiyyətin və Quran qiraətinin xalq arasında ümumiləşməsindən ötrü Quranın peşəkar qiraətinə önəm veririk. Mənim əzizlərim! Quranla ünsiyyət qurun. Bizim dilimiz Quran dili deyil, amma Quranın tərcüməsinə müraciət edə bilərik. Quran məzmunlarının dərinliyi isə yalnız tərcüməyə müraciətlə əldə olunmur, necə ki, onun mənasını başa düşən adamlar üçün Quranın mətnini oxumaqla da həmişə əldə olunmur. Bunun üçün təfəkkür etmək və .dərindən düşünmək lazımdır

Quranın bizim qəlbimizdə əks olunması üçün onu təmiz, şəffaf və parıltılı bir güzgü kimi bilmək lazımdır. Quran bizim canımızda əks olunmalıdır. Bu həmişə və hamı üçün deyil, qəlblərini mənəvi saflıqla təmizləyənlər üçündür. Qurana iman və inamla yanaşmaq lazımdır. Çünki Quranın sədası, kəlamı və sözü inadkar qəlbi olan, eşitmək və anlamaq istəməyən şəxslərə təsir etmir: Əgər Biz (istədikləri kimi) mələkləri onlara göndərsəydik, ölülər onlara danışsaydı və hər şeyi dəstə-dəstə toplayıb onların qarşısına qoysaydıq belə, Allah istəmədikcə, iman gətirməzdilər(١). Bəzi adamlar üçün yeri-göyə calasan da, inanmaz və paslı ürəkləri yaxınlaşmaz və iman gətirməzlər. .Odur ki, Quranı da oxuyur, amma ona yaxınlaşmır

Qurana yaxınlaşmaq lazımdır. Siz əziz gənclər və ölkədə bu sözü eşidən bütün gənclər! Bilin ki, Quranda hikmət var, nur var, şəfa var və dünyanın maddi problemləri səbəbindən qəlbdə və ruhda yaranan düyünlər Quran hikməti ilə açıla bilər. Bu

həqiqətdir; ürəkləri açır, səbir və dözümlülük verir, ümid verir, nur verir, düzgün yolda .hərəkət etmək üçün güclü iradə verir. Quranla üzləşmək və bunları götürmək lazımdır



---

.Ənam/۱۱۱ [۱۸۶] -۱

Biz dünyaya qərq olanda özümüzü məhrum edir, sanki güzgünü bulaşdırırıq. Bəllidir ki, bir şey görünməyəcək. Biz özümüzü Qurandan məhrum etməməliyik. Təəssüf ki, bu gün İslam dünyası özünü Qurandan məhrum etmişdir. Biz İslam ümməti özümüzü Qurandan məhrum etmişik. Buna görə Quran ayəsini oxuyurlar, onun Allahdan qeyrisinə bel bağlamağa, Allaha şərik qoşmağa, qeyri-ilahi cinah və düşərgələrə qoşulmağa necə qəzəbli yanaşdığını görürlər, amma eyni zamanda ürəkləri Amerika ilə, dünya hegemonları ilə, sionist və qeyri-sionist korporasiyalarladır. Əgər İslam dünyası inkişafa doğru lazımi hərəkəti etmir və lazımi təkanı götürmürsə, həmin .problemlərə görədir

Bu gün xoşbəxtlikdən, müsəlmanlar oyanmışlar. Bu gün bütün dünyada İslam oyanışı .hiss olunur. İnşallah bu oyanış və müsəlmanlar arasında qardaşlıq günbəgün artacaq

.Qurani-kərim qiraətçiləri ilə görüşdə çıxışından: ۲۰۰۵

səh:۱۷۵

Bu gecə və gündüzlər haqda bir cümlə deyim. Biz ramazan ayının ilahi ziyafət ayı olmasını və bu ayda ilahi ziyafət süfrəsinin açılmasını bilirik. Bəs bu süfrədə nələr var? Bizim üçün bu süfrəyə qoyulanların biri orucdur, biri Quranın fəzilətidir – çox dəyərli olan bu süfrəyə Quranı qoymuş və bizə onu oxumağı tapşırmışlar – biri oxuduğumuz bu dualardır: Ya Əliyyu, ya Əzim duası, İftitah duası, Əbu Həmzə duası. Bunlar bu süfrəyə qoyulmuş qida məhsullarıdır. Bəzi adamlar bu süfrənin kənarından keçirlər, amma o qədər başları qarışıb, diqqətləri ayrı yerə yönəlib ki, ümumiyyətlə onu görmürlər. Ramazan ayı süfrəsini görməyən, ramazan ayının gəlib-getdiyini xatırlamayan şəxslərimiz var. Elələri də var ki, süfrəni görürlər, amma başları qarışdığından bu süfrədə oturmağa vaxt tapmırlar. Başqa bir məşğuliyyət axtarır, başqa işlər görür, dükanları, sənətləri, dünyaları və ehtirasları ilə məşğul olurlar, bu süfrədə oturub ondan bəhrələnməyə macal tapmırlar. Elələri də var ki, süfrəni görür, süfrədə oturur və onu dəyərləndirirlər. Lakin çox qane insanlardırlar, azla qane olurlar, bir tikə götürüb gedirlər, axıracan oturub yaxşı istifadə etmək, özlərini tam doyurmaq və süfrəyə düzülənlərdən həzz almaq istəmirlər; kiçik bir tikə götürüb gedirlər. Elələri var ki, könülsüz və meylsizdirlər, iştahları küsüb, faydasız bir qida qəbul etdiklərinə görə gözəl, rəngarəng və çox faydalı ziyafət süfrəsində iştahları olmur. Elələri də var ki, çox olan iştahları həddində bu süfrədən istifadə edir və həqiqətən doymurlar. Bu süfrə mənəvi süfrə olduğuna görə ondan bəhrələnmək dəyər sayılır, insan ruhunun yüksəlişinə və nailiyyətinə səbəb olur. İnsan bu süfrədən nə qədər çox istifadə etsə, onun ruhu daha çox ucalar və yaranışın məqsədinə yaxınlaşar. Bu, fiziki süfrələrdən deyil. Fiziki süfrələr insanın bədəninin ehtiyacını aradan qaldımaq üçündür. Ondan çox istifadə etmək səhvdir, yanlışdır. Mənəvi və ruhi süfrə isə belə deyil. Çünki biz ümumiyyətlə mənəvi və ruhi yüksəliş üçün yaranmışıq. Bizim üçün bu yüksəlişi mümkün və asan edən və həyata keçirən amil mənəvi süfrədir. Buna görə bacardığımız qədər istifadə etməliyik. Adlarını eşitdiyimiz mömin və ixlaslı bəndələrin işlərindən danışanda bizim üçün yaxşı anlaşılmır, amma həqiqətən möhtəşəmdir. Azana ٢-٣ saat qalmış oyanır və ramazan ayının gecələrində göz yaşı tökürlər. Danışırlar ki, mərhum Mirzə Cavad Ağa Məliki oyanıb dəstəmaz almaq üçün hovuzun başında otururdu; suya baxıb dua oxuyur, ağlayır və münacat edirdi; su götürüb

üzünə tökür, ağlayır və münacat edirdi; səmaya baxıb dua oxuyur və ağlayırdı. Nəhayət gəlib səccadə üzərində durur, gecə namazı qılır, böyük həvəslə, mənəvi halla, təravət və eşqlə ibadət edirdi. Mərhum Hacı Mirzə Əli Ağa Qazi də belə olmuşdur. ,Onun ramazan ayından

orucundan, ibadətindən, zikrindən, namazından əhvalatlar danışırlar. Bunlar bizim üçün həqiqətən düzgün anlaşılmır, lakin bizə aydın xətt göstərir və biz ondan .maksimum istifadə etməliyik

## Quranı təfəkkürlə yanaşı oxumaq

Dostlar çalışıb hər zaman, xüsusən də ramazan ayında Quran oxumağı yaddan çıxarmasınlar. Quran həyatınızdan çıxmamalıdır. Mümkün olan həddə mütləq Quran oxuyun. Quran diqqətlə və təfəkkürlə oxunduqda öz təsirini bağışlayır. Quran qiraəti tövsiyə olunarkən insanın Quranı tələsik oxuyub keçməsi, mənaları anlamaması, yaxud düzgün anlamaması istənilmir. Demirəm ki, bu faydasızdır, çünki hər halda insan onun Allah kəlamı olduğuna diqqət yetirir və bunun özü bir ünsiyyət və rabitədir. O da faydalıdır və kimisə belə Quran oxumaqdan çəkindirmək olmaz. Lakin bizdən istənilən, həvəsləndirilən və əmr olunan Quran qiraəti bu deyil. Bizdən Quranı təfəkkürlə oxumaq və Allahın kəlamını başa düşmək istənilmişdir. İnsan ərəb dilini bilsə, bilmədikdə də tərcüməyə baxsa və oxuduğu mətləblər üzərində düşünsə, iki dəfə, üç dəfə, beş dəfə oxuduqdan sonra onda həmin ayənin məzmununa dair xüsusi dərk və zehin açıqlığı yaranar. Bu da çox təfəkkürlə hasil olur. Bunu sınayın. Odur ki, insan məsələn, bir-birinə bağlı olan on ayəni birinci dəfə oxuduqda onda bir cür təsəvvür yaranır, ikinci dəfə, beşinci dəfə, onuncu dəfə oxuduqda isə ayrı cür. Yəni insanın zehni və düşüncə dairəsi genişlənir. İnsan nə qədər çox oxusa və dərinliyə .varsa, daha çox anlayar. Və bizim buna ehtiyacımız var

## Quranla ünsiyyət və Quran üzərində təfəkkür – insanı haqq yolda qoruyan amil

Mənim əzizlərim! Bəzi şəxslərin yoldan yayınması din və İslam bilgilərini dərindən mənimsəmədiklərinə görə idi; dillərində olan şüar və emosiya idi, qəlblərinə girməmişdi. Buna görə, biz keçmişdə çox sərt və aktiv olan, sonlar isə vəziyyətləri ١٨٠ dərəcə dəyişən bəzi şəxsləri gördük. İnqilabın ilk illərində elələri vardı ki, - mən bu adamları şəxsən tanıyıram, ümumi olaraq danışmıram - inqilabçılıq, inqilabın və imamın yolunu düzgün dərk baxımından Şəhid Behişti kimi adamları açıq şəkildə tənqid edirdilər, amma bir müddətdən sonra inqilabın və quruluşun əsaslarını inkar etdilər. Onların bəzisi daha insaflı idilər və açıq şəkildə, bəzisi də hiyləgərliklə inkar

etdilər. Daha insafsızları isə bəzi məsələlərə meyl göstərən, amma əslində belə olmayan şəxslər idi. Bu, onlarda dərin etiqadın olmamasından irəli gəldi. Əlbəttə, bu, uyğun amillərin yalnız biridir. Bir amil də onları azdıran ehtiraslar, dünyagirlik və bu kimi

məsələlərdir. Dərin etiqadı olmayan çoxlu şəxslər vardı. İnsanın etiqadlarında, düşüncə təməllərində, ruhunda və imanında bu dərinliyi yaradan vasitələrdən biri də Quranla ünsiyyətdir. Buna görə həyatda mütləq təfəkkürlə Quran oxumağı unutmayın .və proqramlarınızdan çıxarmayın

**Məsumlardan nəql olunan dualarda mövcud olan çoxlu bilgilər**

Biri də bu dualardır. Mötəbər dualarda başqa heç bir yerdə görünməyən çoxlu bilgilər vardır. Bu dualardan biri Səhifeyi-Səccadiyyənin dualarıdır. Bizim bilgi mənbələrimizdə elə şeylər var ki, onları Səhifeyi-Səccadiyyədən, yaxud imamlardan nəql olunan digər dualardan başqa bir yerdə tapmaq mümkün deyil. Bu bilgilər dua dili ilə bəyan olunmuşdur. Onlar gizlətməyə çalışmayıblar, əslində o bilginin xisləti elədir ki, bundan başqa dillə bəyan olunmur. Bəzi məfhumlar dua, münacat, Allah-Taala ilə söhbət və pıçıltıdan başqa yolla bəyan ediləsi deyil. Odur ki, biz hədislərdə və hətta Nəhcül-bəlağədə belə zərif nöqtələri az, Səhifeyi-Səccadiyyədə, Kumeyl duasında, Şəban münacatında, İmam Hüseynin (ə) Ərəfə duasında, həzrət Səccadın (ə) Ərəfə və Əbu .Həmzə Sumali dualarında isə çox görürük

Duaları yaddan çıxarmayın, onlara diqqət yetirin, dua da edin. Sizin boynunuzda böyük vəzifələr var, çoxlu düşmənləriniz, çoxlu müxaliflərinız var. İslam dövləti həmişə belə olmuşdur. İnqilabın əvvəlindən bizim hökumətlərimiz xüsusən yeni iqtidara gələndə - bu hökumətin inqilabın təməllərinə dair açıq-aydın şüarları olduğundan daha çox - müxalifləri olur; həm xarici müxalifləri, həm daxili müxalifləri. Ajiotaj yaradırlar, şayiə yayırlar, mənfi göstərirlər, yalan yayırlar, bəzən əməli işlərə əngəllər törədirlər. Bu müxaliflərlə mübarizə bir qədər iradə, qətiyyət, əməldə ciddilik, yorulmazlıq və müntəzəmlik tələb edir. Bir qədər də dua, ibadət, münacat etmək və Allahdan kömək istəmək lazımdır. Əgər Allahdan kömək istəsək, bizdə yorulmazlıq yaradar. Allahın böyük nemətlərindən biri insanın yorulmaması və səbrinin tükənməməsidir. Uzun yollarda bəzən insanın qüvvəsi olur, ayaqları və dizləri yorulmur, amma psixoloji cəhətdən yorulur. Bu psixoloji yorğunluq insanı məqsədlərdən saxlayır. Təhlükəsi bəzən fiziki yorğunluqdan da çox olan bu mənəvi yorğunluğun yaranmaması üçün Allahdan kömək diləmək, Allaha təvəkkül etmək və ilahi yardıma ümid bəsləmək lazımdır. Bunu əldən verməyin. Mən və siz Allah-Taalanın yanında bizdən öncəkilərdən

və bizdən sonra gələnlərdən daha əziz deyilik; amma əməlimiz yaxşı və təqvamız onlardan çox olsa, heç. Bunu yadda saxlayın. Əgər təqvamız daha çox olsa, özümüzdən daha çox ehtiyatlı olsaq, daha yaxşı işləsək, vəzifələrimizə daha yaxşı əməl etsək, qanuna

daha çox hörmət göstərsək və bu məqsədlərə doğru daha çox getsək, Allah-Taalanın yanında daha əziz olacağıq. Əgər bu olmasa, xeyr. Biz səyimizi bu istiqamətə yönəltməliyik. Ehtiyatlı olaq və digərlərinin səhvlərini təkrar etməyək. Kim o səhvləri etsə, həmin bəla və aqibət onları da yaxalayacaq. Odur ki, bizimlə onlar arasında fərq .yoxdur

.Dövlət şurasının üzvləri ilə görüşdə çıxışından: ۲۰۰۵

səh:۱۷۹

## Ramazan – insanın ruhən paklanması və mənəvi saflıq qazanma fürsəti

Quran ayəsinə əsasən, ramazan ayının orucunda məqsəd təqvadan və insanın bu mənəvi ehtiyatını artırmaqdan ibarətdir.

Bu ay ilahi ziyafət ayıdır. Bu ayda Allahın öz bəndələrinə mənəvi hədiyyəsi rəhmət və əfv qapılarını açmaq, bu ayda bəndələrin etdiyi xeyir əməllərin savabını artırmaqdır. Ramazan ayının orucu da Allahın böyük ziyafətinin nümunələrindən biridir. Bu, insanın mənəvi saflığına və oruc tutanın ruhən paklanmasına bais olur. İmam Səccad (ə) bir xütbədə buyurmuşdur ki, ramazan ayı mənəvi paklıq və əfv ayıdır.(١) Çünki Allah-Taala bu ayda bağışlamaq məsələsinə ilin digər günlərindən daha çox önəm verir. Məhz buna görə bir hədisdə deyilir ki, Allahın rəhmət və əfv qapılarının insanların üzünə açıldığı ramazan ayında bağışlana bilməyən şəxs bəs nə zaman bağışlanacaq?(٢)

Bu ilahi süfrənin və ziyafətin meyvələrindən biri qədr gecəsidir. Mən bu gün birinci xütbədə qədr gecəsinin vəzifələri haqda bir qədər danışmaq istəyirəm. Qədr gecəsi min aydan xeyirlidir(٣). Qədr gecəsi adlandırılan bu gecə ramazan ayında bir neçə gecədən biridir və min aydan üstündür. Mömin bəndə Qədr gecəsinin möcüzəvi saatlarından maksimum istifadə etməlidir. Bu gecədə ən yaxşı əməl duadır. Dua barədə bu gün siz qardaş və bacılara bəzi mətləblər deyəcəyəm. Əhya (səhərədək oyaq qalmaq) da dua, təvəssül və zikr üçündür. Qədr gecələrində müstəhəb əməl olan namaz da əslində dua və zikrdir. Hədisdə göstərilmişdir ki, dua ibadətin məğzidir.(۴) Yəni ibadətin məğzi, yaxud daha çox işlənən ifadə ilə desək, ibadətin ruhu duadır. Dua nədir? Dua - Allah-Taala ilə danışmaq, Allahı özünə yaxın hiss etmək və ürək sözünü Ona deməkdir. Dua ya istəkdir, ya tərif və sənadır, ya da məhəbbət və sevgi bildirməkdir. Bunların hamısı duadır. Mömin bəndənin, düzgünlük və qurtuluş istəyən bir insanın ən mühüm işlərindən biri duadır. Ruhun paklanmasında duanın belə rolu var.

## Duanın faydaları

### ١. Allahı yada salmaq

Duanın faydası nədir? Biz Allahla danışdıqda Onu özümüzə yaxın hiss edir, öz

dinləyicimiz bilir və Onunla danışırıq. Bu, duanın səmərələrindəndir. Ürəkdə Allahın xatirəsini yaşatmaq insanın bütün yayınmalarının və



---

۱- [۱۸۷] Səhifeyi-Səccadiyyə, dua ۴۴, səh: ۱۸۶.

۲- [۱۸۸] Şeyx Səduq, əl-Əmali, səh: ۵۳.

۳- [۱۸۹] Qədr/۳.

۴- [۱۹۰] Vəsail əş-şiə, c. ۷, səh. ۲۷. Hədis həzrət Peyğəmbərdəndir (s).

fəsadlarının anası olan qəfləti yox edir. Dua insanın qəlbindən qəfləti yox edir, Allahı xatırladır, Allahın xatirəsini ürəkdə yaşadır. Duadan məhrum olan insanların mübtəla olduğu ən böyük zərər budur ki, Allahın xatirəsi onların ürəyindən çıxır. Allah-Taalanı unutmaq və yaddan çıxarmaq bəşər üçün çox zərərlidir. Quranda bu haqda bir neçə .ayə vardır

### Ürəkdə imanın gücləndirilməsi .۲

Duanın ikinci faydası ürəkdə imanın güclənməsidir. Duanın xüsusiyyəti budur ki, ürəkdə imanı möhkəm və qərarlı edir. Sıradan çıxması mümkün olan iman dünya hadisələri, insanın çətinlikləri, şadlıqları, nemətləri və müxtəlif vəziyyətləri zamanı məhv olmaq təhlükəsində olur. İmanlı olan, lakin dünya malı, dünyəvi qüdrət, fiziki ləzzət və ehtiraslar səbəbindən imanlarını əldən verən insanlar görmüsünüz. Bu, zəif və qərarsız imandır. Duanın xüsusiyyəti budur ki, imanı insanın ürəyində qərarlı və möhkəm edir. Dua ilə və Allah-Taalanı həmişə yad etməklə imanın sıradan çıxma .təhlükəsi dəf edilir

### İnsana ixlas ruhunun üfürülməsi .۳

Üçüncü fayda insana ixlas ruhunun üfürülməsidir. Allahla danışmaq, özünü Ona yaxın bilmək insana ixlas ruhu verir. İxlas - yəni işi Allah üçün görmək. Bütün işləri Allah üçün görmək olar. Allahın yaxşı bəndələri həyatın bütün adi və gündəlik işlərini də Allaha yaxınlaşmaq niyyəti ilə görürlər. Bəziləri də hətta ən yaxın və ən ibadi işləri, misal üçün, namazı da Allahdan ötrü qıla bilmirlər. İxlassızlıq insan üçün böyük dərddir. Dua .insana ixlas ruhunu aşılayır

### İnsanda özünüislahın yaranması və əxlaqi dəyərlərin inkişafı .۴

Duanın dördüncü faydası insanda özünüislahın yaranması və əxlaqi dəyərlərin inkişaf etməsidir. İnsan Allaha diqqətlə, Allah-Taala ilə danışmaqla əxlaqi dəyərləri özündə gücləndirir. Bu, Rəblə ünsiyyətin zəruri və təbii xüsusiyyətidir. Buna əsasən, dua insanın kamala sarı yüksəliş pilləkanı olur. Qarşılıqlı olaraq dua əxlaqi rəzilətləri - tamahkarlığı, təkəbbürlülüyü, xudpəsəndliyi, Allah bəndələri ilə düşmənliyi, zəifliyi, .qorxaqlığı və dözümsüzlüyü insandan uzaqlaşdırır

## Ürəkdə Allah–Taalaya məhəbbət yaratmaq .۵

Duanın beşinci faydası Allah-Taalaya məhəbbət yaratmaqdır. Dua ürəkdə Allah-Taalaya eşqi dirildir. Bütün gözəlliklərin və yaxşılıqların tərənnümü

Pərvərdigarın müqəddəs zatıdır. Allah-Taala ilə danışmaq, dua və ünsiyyət ürəkdə bu .məhəbbəti vücuda gətirir

### İnsana ümid və müqavimət ruhunun üfürülməsi .۶

Duanın altıncı faydası insana ümid ruhunu üfürməsidir. Dua insana həyatın problemləri qarşısında müqavimət qüvvəsi verir. Hər kəs öz həyatında müxtəlif hadisələrlə rastlaşır və problemlər peyda olur. Dua insana qüdrət verir, onu hadisələr qarşısında bərkidir. Buna görə hədisdə dua silah sayılmışdır. Əziz Peyğəmbərdən (s) nəql olunmuşdur ki, sizi düşmənlərinizdən xilas edəcək bir silah göstərimmi? Bu, gecə-gündüz Rəbbi çağırmaqdan ibarətdir və möminin silahı duadır.(۱) Hadisələrlə qarşılaşdıqda Allah-Taalaya diqqət yetirmək mömin insanın əlində kəsərli bir silahdır. Buna görə, İslamın əziz Peyğəmbəri (s) döyüşdə bütün lazımi işləri görürdü, qoşunu düzürdü, əsgərləri sıralayırdı, onlara lazımi imkanları yaradırdı, lazımi tövsiyələri verirdi, öz komandanlığını icra edirdi, lakin eyni zamanda meydanın ortasında diz çöküb, əlini qaldırır, dua və münacat edir və Allah-Taala ilə danışıb ondan istəyirdi. .Allahla bu əlaqə insanın qəlbini möhkəmlədir

### İstəklərin verilməsi .۷

Duanın digər faydası istəklərin verilməsidir. Duanın faydalarından biri budur ki, insan istəklərini Allah-Taaladan istəyir və Allah onları təmin edir. Əlbəttə, duanın bütün xüsusiyyəti bu deyil. Bu, duanın digər xüsusiyyətlərinin yanında bir xüsusiyyətdir. Buyurdu: "Allaha Onun lütfündən istəyin"(۲) Allah-Taaladan istəyin və öz ehtiyaclarınızı Ondan umun. Əbu Həmzə Sumali duasında İmam Səccadın (ə) dilindən belə deyilir: "Sənin xüsusiyyətlərində belə bir şey yoxdur ki, istəməyə əmr edib, əta etməkdən çəkinəsən"(۳) Sənin Öz bəndələrinə istəməyi əmr etmən, lakin onların istəyini yerinə yetirməyi planlaşdırmaman imkansızdır. Allah-Taala mənə və sizə Ondan istəməyimizi əmr edirsə, deməli, istəyimizi bizə verməkdə qərarlııdır. Buna görə hədisdə deyilir ki, .Allah-Taala dua qapısını açıb qəbul etmək qapısını bağlamaqdan daha səxavətlidir

## Duanın və onun qəbul olunmasının şərtləri

### Təravətli və təmiz ürəklə istəmək .۱

---

۱- [۱۹۱] Saleh Mazandarani, Şərh əl-Kafi, c. ۱۰, səh. ۲۰۶.

۲- [۱۹۲] Nisa/۳۲.

۳- [۱۹۳] Bihar əl-ənvar, c. ۹۰, səh. ۸۲.

Duanın qəbul olunmasından ötrü hansı duanı etməliyik? Bəzən insan Allahdan bir şey istəyir və zahiri hesabla bu istəyin həyata keçmədiyini hiss edir. Duanın qəbul olunmasının mühüm şərti budur ki, o, sözün həqiqi mənasında və öz şərtləri ilə baş tutsun. Duanın birinci şərti budur ki, təravətli və bulaşıqsız ürəklə istənilsin; gənclərin ürəyi kimi. Buna görə, gənclərin dualarının qəbul olunma ehtimalı digərlərindən çoxdur. Bəzən mənə deyirlər ki, bizim gənclərimiz üçün dua elə. Düzdür, biz həmişə bütün gənclər üçün dua edirik. Lakin əslində bu gənclər özlərinin təmiz və təravətli ürəklərinin qədrini bilsələr, onların duası qəbul olunmağa hər bir duadan daha yaxın .ola bilər

### İnamla dua etmək .٢

Qəbul olunan duaların şərtlərindən biri budur ki, insan duanı inamla etsin, bilsin ki, bu dua və istək insanın arzularını həyata keçirməyə qadir olan bir şəxsə edilir; yəni duanın təsirinə inamı olsun. İmam Sadiqə (ə) deyildi ki, biz dua edirik, amma qəbul olunmaq əlaməti görmürük. Buyurdu ki, inamsız dua etməyin.(١) İnamsız dua edirsiniz. Bir hədisdə duada inam barədə buyurulub ki, Rəbbin qəbul etmək qüdrətinə inamları (olsun.(٢

Duada baxışınız geniş olsun, böyük istəklər diləyin, dünya və axirətin səadətini istəyin. Deməyin ki, bunlar böyükdür, çoxdur. Xeyr! Allah-Taala üçün bunlar bir şey deyil. Əsas budur ki, siz sözün həqiqi mənasında həmin şərtlərlə istəyəsiniz. Allah-Taala bu istəyi .qəbul edəcək. Bəzən də insan işin onun duasına görə baş tutduğunu bilmir

### Tövbə və günahdan çəkinmək .٣

Duanın şərtlərindən başqa birisi günahdan çəkinmək və tövbə etməkdir. Bu gecələr də tövbə gecələridir. Hamımız günaha düçar olmuşuq. Nöqsanların kiçiyi və böyüyü olur. Allah-Taaladan üzr, əfv və bağışlanma istəməli, tövbə etməli və Allaha sarı qayıtmalıyıq. Biz günah etməməyə çalışmalıyıq. Bəzən insan qərara gəlir ki, günah etməsin, lakin sonra unutqanlığa və səhvə düçar olur, yenə həmin günah baş verir. Yenidən tövbə etmək və bağışlanmaq istəmək lazımdır. Lakin tövbə ciddi və həqiqi olmalıdır. Bir hədisdə dua və onun qəbul olunması barədə deyilir ki, insan xalqın haqqını verməlidir ki, duası qəbul olunsun.(٣) Başqa bir hədisdə göstərilir ki, Allah-

Taala həzrət Musaya müraciətlə

səh:۱۸۳

---

.Nur əs-səqələyn təfsiri, c. ۴, səh. ۵۳۳ [۱۹۴] -۱

.Bihar əl-ənvar, c. ۹۰, səh. ۳۲۳ [۱۹۵] -۲

.Yenə orada, səh: ۳۲۱ [۱۹۶] -۳

buyurdu: “Ey Musa! Məni pak qəlblə və doğruçu dillə çağır!”(١) Pak qəlblə və doğruçu .dillə Allah-Taala ilə danışın və dua edin. Dua mütləq qəbul olunacaq

### Qəlbin hüzuru və təzim .۴

Duanın qəbul olunmasının şərtlərindən başqa birisi qəlbin hüzuru və təzimdir. Qeyd etdiyimiz kimi, duanın mənası budur ki, siz Allahla danışasınız, Allahı öz qarşınızda hiss edəsiniz, yanınızda sizə baxdığını biləsiniz. İnsanın adət üzündən bir sözü dilinə gətirməsi, bir istəyi deməsi - “İlahi, bizi bağışla! İlahi, bizim ata-anamızı bağışla” - lakin doğrudan da öz ürəyində istəmək halətini hiss etməsə, bu, dua deyil, dilin vərdişidir: “Allah-Taala diqqətsiz qəlbin duasını qəbul etməz” (٢). Qafil və diqqətsiz bir ürək dua etsə, Allah-Taala duasını qəbul etməz. Bulaşıq ürəklər, nəfsi istəklərdə və ehtiraslarda qərq olmuş qafil ürəklər necə dua edəcəklər? Əgər insan belə dua etsə, onun qəbul !?olunmasını necə gözləyə bilər

Bəziləri duanı, ibadəti və tövbəni qocalıq dövrünə saxlayırlar. Bu böyük səhvdir. Tövbə edin! – deyəndə cavab verirlər ki, hələ vaxtımız var. Əvvala vaxtımızın olması bəlli deyil. Ölüm insana xəbərdarlıq etmir, bütün yaşlar üçün də var. Əgər həqiqətən vaxtımızın olmasını fərz etsək, yəni qocalığa çatacağımız bəlli olsa da, gənclik dövrünü qafilliklə və ehtiraslar içində keçirib sonra asanlıqla tövbə etmənin mümkün olduğunu düşünən şəxs böyük səhvə düçar olmuşdur. Dua və tövbə halı elə bir şey deyil ki, insan nə zaman istəsə, bacarsın. Bəzən istəyirik, amma olmur; mənəvi hal axtarırıq, amma alınmır. Əgər insan Allaha diqqətin və Allaha qayıdışın şəraitini özündə vücuda gətirməsə, istədiyi zaman Allahın qapısına gedə bilməyəcək. Siz görürsiniz ki, pak qəlbi olan bəzi adamlar - adətən gənclər çox asanlıqla rabitə yarada bilirlər, amma bəziləri nə qədər çalışırlarsa, bu rabitə yaranmır. Fürsəti olanlar və öz ürəklərini yumşaq saxlaya bilənlər bunun qədrini bilsinlər, özlərinin Allahla rabitələrini qorusunlar ki, .istədikləri vaxt Allahın qapısına gedə bilsinlər

### Məsumlardan nəql olunmuş duaların əhəmiyyəti

Dua barədə son məqam məsumlardan nəql olunmuş dualardır. İmamlardan çatmış dualar ən yaxşı dualardır. Əvvəla bu dualarda yerləşdirilmiş istəklər bizim kimilərin ümumiyyətlə yadına düşmür və insan imamların dili ilə onları Allahdan istəyir. Əbu

Həmzə duasında, İftitah duasında, Ərəfə duasında insan üçün ən yaxşı istək və hacətlər dilənir. Əgər insan bunları Allahdan istəsə



---

۱- [۱۹۷] Yenə orada, səh: ۳۴۱.

۲- [۱۹۸] (Əl-Kafi, c. ۲, səh. ۴۷۳. Hədis Əmirəl-mömininindəndir (ə).

və alsa, onun üçün böyük sərvət olar. İkincisi budur ki, bu dualarda kiçilmə və yalvarış amilləri var. Mətləb elə dillə, elə tonla və nitqlə deyilmişdir ki, ürəyi təzimə vadar edir və yumşaldır. Fəsahətli və səlis ifadəli bu dualarda eşq, məhəbbət və şövq dalğalanır. .İnsan bu duaların qədrini bilməli və onlardan istifadə etməlidir

Sözsüz ki, bu duaların mənasını bilməliyik. Xoşbəxtlikdən, indi yaxşı tərcümələr mövcuddur, Məfatih əl-cinan kitabı və müxtəlif dualar tərcümə olunmuşdur. Tərcümələrə diqqət yetirib oxusunlar. Əlbəttə, biz gördüyümüz qədərincə, heç bir tərcümə bu duaların sözlərinin gözəlliyini əks etdirə bilmir. Lakin hər halda, duanın məzmunu bəlli olur. Bu tərcümələrə diqqətlə duanı oxuyun. Oxuyan şəxslər duanın ən azı hamının ucadan dediyi bəzi hissələrini tərcümə etsinlər. Aşağı dərəcəsi də budur ki, əgər insan duanın mənasını bilmirsə, ürək yanğısından xəbər verən aşiqanə bir dillə .Allah-Taala ilə danışdığına diqqət yetirsin

### Duanın ən böyük nağd faydası

Ümidvarıq Allah-Taala bizim hamımıza qarşıdan gələn mübarək qədr gecələrindən yaxşı istifadə etmək səadəti nəsib etsin! Mənim əzizlərim! Dua edin. Dua problemin qarşıya çıxdığı zamana məxsus deyil, həmişə dua etmək lazımdır. Bəzi adamlar elə bilirlər ki, problem, müsibət və bəla zamanı dua etmək lazımdır. Xeyr! İnsanın adi halda yaşadığı zaman da dua etmək və Allahla əlaqəni qorumaq lazımdır. Bir hədisdə işlənən ifadə ilə desək, insan öz səsini yüksək ruhani aləmin mələklərinə tanış etməlidir. Dua həmişə lazımdır. Allahdan öz istəklərinizi, mömin qardaşlarınızın istəklərini, dünyanın bütün müsəlmanlarının istəklərini, ölkənin ümumi məsələlərini, problemlərin aradan qalxmasını, ölkənin və İslam Respublikası quruluşunun parlaq inkişaflarının asanlaşmasını istəyin. Duanın ən böyük nağd faydası, yəni Allah-Taala ilə əlaqə, Ona sevgi hissi və Ona yaxınlaşmağa rəğbət dua edənin özünə aiddir. Bu, dua edənin .özünə aid olan ən nağd səmərədir. Onun qəbul olunması isə başqa bir mövzudur

.Tehranın cümə namazı xütbələrindən: ٢٠٠٥

səh:١٨٥

Ramazan ayı öz bərəkətləri və geniş ilahi süfrəsi ilə birgə sona çatmaqdadır. Bu böyük ölkənin öz vəzifələrini yaxşı yerinə yetirmək üçün həmişə ilahi qüvvədən kömək almağa ümid bəsləyən biz məmurları bu əziz ayı arxada qoyuruq, halbuki bu aydan, ondakı və qədr gecələrindəki ilahi lütf və mərhəmətdən nə qədər pay götürdüyümüzü bilmirik. Biz bu böyük xeyirdən, böyük mərhəmətdən vaz keçə bilmərik. Bizim işimiz ağır, yolumuz uzun və vəzifəmiz böyükdür. İlahi yardım olmadan bu ağır vəzifələri yerinə yetirmək olmaz. Odur ki, bu fürsətləri fövtə verməməliyik. Mənim bugünkü .sözüm əsasən bu məsələ haqdadır

Allah-Taala Quranda dəfələrlə, o cümlədən bu ayədə bağışlanmaq diləyib Allaha qayıtmağı bizə əmr edir. Tövbə qayıtmaq deməkdir. Bu qayıtmaq həm iman mərhələsindədir, həm də əməl və rəftar mərhələsində. Bizim səhlənkarlıqlarımız olub və var. Biz özümüzü islah etməliyik və bu birinci dərəcəli əhəmiyyətə malikdir. Mübarək Hud surəsi belə başlayır: Bismillahir–Rəhmanir-Rəhim. Əlif, Lam, Ra! Bu, ayələri hikmət sahibi, (hər şeydən) agah olan (Allah) tərəfindən təsbit olunmuş, sonra da müfəssəl izah edilmiş bir kitabdır ki, siz Allahdan başqasına ibadət etməyəsiniz - ən sizi Allah tərəfindən qorxudan və müjdələyənəm - və Rəbbinizdən bağışlanmağınızı diləyə, sonra Ona tövbə edəsiniz(١). Yəni Quranın missiyası birinci növbədə tövhid məsələsidir, amma ondan sonra dərhal Allaha qayıtmaqdan və Allahdan əfv diləməkdən danışır. Bu, peyğəmbərlərdən tutmuş aşağı səviyyələrə qədər bütün təbəqələrə məxsusdur. Lakin bağışlanmaq istədiyimiz günah bizdə bir şeydir, pak və dəyərli insanlarda başqa bir şey. Onların da bağışlanma diləməyə ehtiyacları var. Onlar da məxluqdurlar. Onların da əfv istəməyə, bu nöqsanı və nisbi zəifliyi Allahdan bağışlanma diləməklə düzəltməyə ehtiyacları var. Bizim günahlarımız və mənfi cəhətlərimiz də bir-iki deyil. Bizim müxtəlif növ səhvlərimiz var. Bu bizim əsas .sözümüzdür

Burada bir hədis oxuyum: Əfv diləməklə bəla qapılarını bağlayın.(٢) Həmin ayədə də belə deyilirdi: Sizə yaxşı gün-güzəran versin(٣). Yəni həyatdan yaxşı faydalanmaq .Allah-Taaladan əfv diləməklə və tövbə ilə hasil olar

Başqa bir hədisdə deyilir ki, ən yaxşı dua bağışlanma diləməkdir.(١) Şəban münacatında da belə deyilir: İlahi! Güman etmirəm ki, ömrümü Səndən istəməklə keçirdiyim istəyimi rədd edəsən.(٢) Bu istək nədir? Bütün ömrünü istəməklə keçirdiyini .dediyi bu istək ilahi əfvdən ibadətdir

İlahi əfv səhvləri düzəltmək, özümüzə və digərlərinə vurduğumuz zərbələri düzəltmək deməkdir. Əgər bəşər səhv və fəsadları ciddi şəkildə düzəltmək fikrinə düşsə, Allahın yolu açılar və bəşərin aqibəti yaxşı olar. Biz insanların eybi budur ki, öz səhvimizi, onu düzəltməyin zəruriliyini və özümüzü islah etməyi unuduruq. Əgər bu diqqətsizliklər aradan qalxsa və bu iradə yaransa, hər şey düzələr. Bizim ən böyük vəzifələrimizdən olan birinci mərhələdə özümüz islah oluruq. Əsas məsələ də budur. Yəni bütün işlər bizim islahımıza və Allahın razılığını qazanmağımıza müqəddimədir: Özünüzü qorumaq sizin borcunuzdur. Siz doğru yolda olsanız, (haqq yoldan) azanlar sizə heç bir zərər yetirə bilməzlər(٣). Bütün səy və mübarizələr Allahı özümüzdən razı salmaqdan və .yaranışda bizim üçün nəzərdə tutulmuş kamilliyə çatmaqdan ötrüdür

Digər mərhələ ictimai əfv diləyi və ictimai islahdır. Biz bacardığımız dairədə ümumi yolu, məqsədi və fünksiyanı islah etməliyik. Bu, bağışlanma diləyinin təsirinə ən bariz nümunə və onun həqiqi məfhumu və məzmunudur. Bu işi çətin hesab etmək olmaz. Əgər iradə etsək, asandır və biz bacararıq. Bu gecələrdə şərafətli Əbu Həmzə duasında belə oxudunuz: Sənə sarı gələnin yolu yaxındır.(٤) Əsas məsələ iradə və hərəkət etmək, çalışmaqdır. Sonra deyilir ki, biz öz əlimizlə və səhvlərimizlə özümüzlə Allah arasında məsafə yaradırıq. Allah-Taala bizə uzaq deyil, yol yaxındır. Əgər bir səadət nəsib olsa, bu, ilahi rəhmət əlamətidir. Əgər ürəkdən bağışlanma diləyib iradə və hərəkət edə bilsəniz, bilin ki, ilahi yardım və ilahi diqqət sizə şamil olmuşdur; sizi cəzb edib çəkirlər. Allah çoxlu yerlərdə tövbəni Özünə aid edir: İnsanların tövbə etməsi üçün Allah tövbə etdi(٥). Tövbə nədir? Yəni diqqət və qayıdış. Allah sizə diqqət yetirdi .və bu sizin qəlbinizin Allah-Taalaya yönəlməsinə bais oldu

Sözügedən Əbu Həmzə Sumali duasında deyirik ki, Sənin məni Özünə yönəltmən, mənim üçün dəlilin yaranması, Sənin məni yönəltmənə şahiddir. Sən məni çəkir və cəzb edirsən. Əgər ramazan ayında bizim gənclərimizin

---

۱- [۲۰۲] Ehtiyacsız dərgaha ehtiyac bildirməyin qaydaları, səh: ۳۶۱.

۲- [۲۰۳] İqbal əl-əmal, c. ۱, səh: ۶۸.

۳- [۲۰۴] Maidə/۱۰۵.

۴- [۲۰۵] İqbal əl-əmal, c. ۱, səh: ۶۸.

۵- [۲۰۶] Tövbə/۱۱۸.

əllərinin məscidlərdə səmaya ucaldığını və bağışla sədalarının bütün cəmiyyəti bürüdüyünü görürsünüzsə, bilin ki, Allah bu xalqa lütf etmişdir. Bu, ilahi cazibədir, Allah-Taalanın yaratdığı cəzbetmədir. Allah Öz rəhmətini göndərmək istəyir: İlahi! Mən Səndən rəhmət amillərini istəyirəm.(١) Bu, həmin rəhmət amillərini yaradır. Allah-Taala .Öz lütf və mərhəmətini xalqa şamil etmək istəyir

**Günahın üç növü və onlar üçün bağışlanma diləməyin zəruriliyi**

Üç növ günahdan ötrü bağışlanma diləmək lazımdır. Bunlar bizim üçün faydalıdır. İdarəetmə işlərində olan mənim və sizin də buna ehtiyacımız var. Bunları unutmaq bizi .böyük ziyanlara sürükləmişdir və sürükləyir

Üç növ günah vardır: Biri yalnız özünə zülmdən ibarət olan günahdır. Özünə zülm etmək ifadəsi Quran və hədislərdə çox işlənmişdir. İnsan bu günahı edir və onun təsiri .birbaş özünə qayıdır. Adi fərdi günahlar belədir

İkincisi elə günahlardır ki, insan onu edir, amma təsiri birbaş xalqa və digərlərinə toxunur. Bu günah daha ağırdır. Bu günah həm də özünə zülm etməkdir, amma digərlərinə təcavüz olduğundan daha çətin və əlacı daha müşküldür. Zülm, qəsbetmə, insanların haqqını tapdamaq, insanların ümumi hüquqlarını pozmaq bu qəbildəndir. Bu günah daha çox hökumətlərə aiddir, məmurların günahıdır, siyasətçilərin günahıdır, beynəlxalq şəxsiyyətlərin günahıdır, bir sözləri, bir imzaları, bir təyinatları ailələrə və hətta xalqa təsir edən şəxslərin günahıdır. Adi camaat adətən belə günahlar etmirlər. Əgər etsələr də, bunun dairəsi çox kiçik olur. Biri yolla gedir və misal üçün, bilərəkdən başqasının ayağını tapdayır; bu həddədir. Amma mən və siz bu növ günahdan edəndə dairəsi geniş olur. Qeyd etdiyimiz kimi, bizim bir imzamız, bir fərmanımız, bir sözümüz, bir mühakiməmiz, qərar mərkəzində bir oturub-qalxmağımız çoxlu toplumlara birbaşa təsir göstərə bilər. Bu növ günah üçün də özünə münasib bağışlanma diləmək lazımdır. Birinci növ günaha tövbə etmək üçün insan sədaqətlə Allah-Taaladan əfv diləməlidir. İkinci növ günah isə yalnız bağışlanma diləməklə həll olmur, insan onu düzəltməlidir. İslah etmək, düzəltmək və problemləri aradan qaldırmaq məsələsi burada meydana .çıxır

Üçüncü növ günah xalqların kollektiv günahlarıdır. Bir nəfər adamın günahı deyil ki, bir

səhv etsin və bir qrup ondan zərər görsün. Bəzən bir xalq, yaxud bir xalqdan olan təsirli toplum bir günah edir. Bu günahın da öz bağışlanma üsulu var. Bir xalq bəzən uzun illər pis işin və zülmün qarşısında sükut edir, heç bir reaksiya göstərmir. Bu da bir günah və bəlkə də daha ağır



---

.Misbah əl-mütəhəccid, c. ۱, səh: ۶۱ [۲۰۷] -۱

günahdır. Bu Hər hansı bir tayfa öz vəziyyətini dəyişmədikcə, Allah onun vəziyyətini dəyişməz(١) məsələsidir. Bu, böyük nemətləri məhv edən günahkar qruplara və xalqlara ağır bəlaları yönəldən günahdır. Bir xalq Tehranda durub Şeyx Fəzlullah Nuri kimi böyük bir müctəhidin dar ağacından asılmasına tamaşa etdi və yerindən tərpənmədi; Məşrutənin ingilis və qərbpərəst qoluna qoşulmadığına görə onun əsasını qoyanlardan və rəhbərlərindən olan bu şəxsə antiməşrutə damğası vurduqlarını - hələ də bizim bir qrup qələm adamımız, natiq və yazıçımız bu əsassız və məntiqsiz yalanı çeynəyir və təkrar edirlər – gördülər və əlli ildən sonra altını çəkdilər: bu Tehran şəhərində Təsisçilər məclisi təşkil olundu və orada şahlığın və hökumətin Rza şaha keçməsini qəbul etdilər. Onlar xüsusi bir qrup deyildi. Bu, ümumi və milli bir günah idi: Sizin aranızda təkcə zalımlara toxunmayacaq bəladan qorxun(٢). Bəzən cəza təkcə günahı törədən şəxslərə şamil olmur, ümumi olur. Hamı onda birbaşa iştirak etməsə də, hərəkət ümumi olmuşdur. Həmin xalq küçələrə çıxıb Məhəhəmmədrza Pəhləvinin tankları önündə sinələrini sipər edəndə və ölümdən qorxmayanda - yəni əlliillik dözüm və sükut günahını tərk edəndə Allah-Taala onların mükafatını verdi. Zülm hakimiyyəti devirildi və xalq hakimiyyəti yarandı. Rüsvayçı siyasi asılılıq götürüldü, müstəqillik başlandı. Bu müstəqillik davam edir, davam edəcək və bu xalq Allahın yardımı və öz istəyi ilə amallarına qovuşacaq. Bu, hərəkət etdiyinə görə idi. Buna əsasən, üçüncü növ .günah üçün də bir cür bağışlanma istəmək lazımdır

Biz ümumi əfv diləməliyik. Bu əfv diləyi şəxsi əfvdən fərqli bir şeydir. (Şəxsi əfvə qalsa,) mən də özüm üçün bağışlanma diləməliyəm, siz də. Demək olmaz ki, biz günahkarıq, əslində günaha qərq olmuşuq. Bizim şəxsi əməllərimizdə bu qədər səhlənkarlıq, bu qədər yayınma və bu qədər təqsir var. Odur ki, bağışlanmağımızı istəməliyik. Bağışlanma diləmək həm də qəlbi, zehni və ruhu işıqlandırır. Bu, bizimlə Allah arasında .olan şəxsi bağışlanmadır. Lakin ümumi günahlar üçün də əfv diləmək lazımdır

Quranda tövbə sözü dəfələrlə "islah" – günaha əvəz olaraq yaxşı iş görmək - sözü ilə yanaşı işlənmişdir: "Ancaq tövbə edənləri, yaxşı işlər görənləri"(٣) "Tövbə edib iman gətirən və yaxşı işlər görənlər"(۴) Bir yerdə bu islahın nümunəsi də qeyd olunmuşdur: "Kitabda (Tövratda) insanlara aşkar etdiyimiz dəlillərdən sonra göndərdiyimiz nişanələri və doğru yol göstərən ayələrimizi gizlədən kimsələr Allahın lənətinə düçar

olar və bütün lənət edə bilənlər onlara lənət oxuyarlar. Mən ancaq tövbə edənləri, yaxşı işlər görənləri və (Tövratda buyurduqlarımı) bəlli edənləri əfv edərəm"(۵) "Tövbə edənlər, özlərini islah edib düzəldənlər, Allahdan möhkəm yapışanlar və Allah qarşısında dinini (etiqadını) təmizləyənlər müstəsnadır"(۶) Münafiqlik edənlər



---

۱- [۲۰۸] Rəd/۱۱.

۲- [۲۰۹] Ənfal/۲۵.

۳- Bəqərə/۱۶۰.

۴- Məryəm/۶۰.

۵- Bəqərə/۱۵۹-۱۶۰.

۶- Nisa/۱۴۶.

haqda buyurur ki, bunların tövbəsi və islahı üçün özlərini saflaşdırmaları lazımdır. Buna .əsasən, islah tövbənin zəruri şərtidir

Biz ümumi əfv diləməliyik. Bu əfv diləyi şəxsi əfvdən fərqli bir şeydir. (Şəxsi əfvə qalsa,) mən də özüm üçün bağışlanma diləməliyəm, siz də. Demək olmaz ki, biz günahkarıq, əslində günaha qərq olmuşuq. Bizim şəxsi əməllərimizdə bu qədər səhlənkarlıq, bu qədər yayınma və bu qədər təqsir var. Odur ki, bağışlanmağımızı istəməliyik. Bağışlanma diləmək həm də qəlbi, zehni və ruhu işıqlandırır. Bu, bizimlə Allah arasında .olan şəxsi bağışlanmadır. Lakin ümumi günahlar üçün də əfv diləmək lazımdır

.Quruluşun məsul şəxsləri ilə görüşdə çıxışından: ۲۰۰۵

səh:۱۹۰

Ramazan ayını ibadət, oruc, dua, zikr və təzimlə keçirib fitr bayramına çatmaq mömin üçün həqiqətən bayramdır. Bu bayram dünyanın maddi bayramlarından deyil, Allah rəhmətinin, ilahi əfvin bayramıdır; möhtəşəm ilahi ziyafətə qoşulub ramazan ayını Haqqa ibadətlə sağ-salamat keçirən və ramazan ayında zikrdən, duadan, ibadətdən, orucdan və namazdan öz imkanları həqqində bəhrələnməyə müvəffəq olmuş xalqın şükür bayramıdır. Bu, bir ibadət mövsümünü ilahi əfvə və mükafata ümidlə fitr gününə .çatdırmış müsəlmanların bayramıdır

Süveyd ibn Qəfələ Əmirəlmömininin (ə) dostlarındandır. Onun barəsində belə yazmışlar: Əmirəlmömininin (ə) yaxınlarından olmuşdur.(١) Bir rəvayətdə bu şəxs deyir ki, fitr bayramında Əmirəlmömininin (ə) evinə getdim. O həzrət süfrə başında xörək yeyirdi, qarşısına çox adi bir xörək qoyulmuşdu; yəni ən imkansız bir şəxsin hazırlaya biləcəyi bir xörək, məsələn, bir qədər süd və undan hazırlanmış çox adi bir xörək. Mən dedim ki, ey Əmirəlmöminin, siz bayram günü belə əhəmiyyətsiz və adi xörək yeyirsiniz? Adətən bayramda insanlar ən yaxşı xörəklərini yeyirlər, siz isə bununla kifayətlənirsiniz? İmamın cavabı belə oldu: Bu, yalnız bağışlanmış şəxslərin bayramıdır. Yəni bu günün bayram olması rəngarəng xörəklər yeməkdə və uşaq kimi sevinməkdə deyil, bu, ilahi əfvi qazanmış şəxslər üçün həqiqi bayramdır. Əmirəlmöminin (ə) başqa bir cümlədə buyurdu: Bu yalnız orucu və ibadəti Allah tərəfindən qəbul olunan şəxsin bayramıdır və Allaha günah edilməyən hər gün bayramdır(٢). Mənim və sizin heç bir .günah etməmək səadətinə nail olduğumuz gün bizə bayram və sevinc günüdür

Əlbəttə, fitr bayramında bir-birimizi təbrik etmək tövsiyə olunmuşdur. Öz yeni paltarlarınızı geyinin, o günü bayram kimi qeyd edin və şadlıq keçirin, amma bu bayramın mahiyyəti mənəviyyata, əfvə diqqət yetirməkdən və Allahın rəhmətini .diləməkdən ibarətdir

Əziz qardaşlar! Əziz bacılar! Ramazan ayı ərzində oruc tutan siz möminlər öz orucunuz, ibadətiniz, duanız, təvəssülünüz, gecələr oyaq qalmanız, Quran oxumanız, Allahı yada salmanız və Onu təqdis etmənizlə qəlblərinizi Allah-Taalaya yaxınlaşdırdınız. Bu fürsətin qədrini bilin və bunu qoruyun. Bizim xalqımız mömin

xalqdır. Bizim gənclərimizin qəlbi pak və işıqlıdır. Ölkə boyu bizim qadın və kişilərimizin Allah-Taala ilə əlaqələri səmimidir. Bu, ilahi rəhməti cəlb etmək üçün bir xalqın böyük .sərvətidir



---

.Məkatib əl-əimmə, c. ۱, səh: ۴۹۷ [۲۱۴] -۱

.Nəhcül-bəlağə, səh: ۵۱۵ [۲۱۵] -۲

Fitr bayramı – müsəlmanın ruhunun və qəlbinin paklığını yada salan amil

Fitr bayramı müsəlmanlar üçün böyük gündür. Bu günün əzəməti sırf razılaşdırılmış bir məsələ deyil, həqiqi məsələdir; Allah bəndələrinin mübarək ramazan ayındakı zəhmət və ibadətlərinin mükafatını aldıqları gündür. İlahi ziyafət sayəsində müsəlmanın ruhunun və qəlbinin paklığını yada salan amildir. Bu günü fürsət bilməliyik. Çünki bu, İslam dünyasının müştərək cəhətlərindəndir. Müsəlman xalqlar arasında birlik yaratmaq üçün bundan istifadə etmək lazımdır. Bu gün müsəlman xalqların bu birliyə .çox ehtiyacı var

.Quruluşun məsul şəxsləri ilə görüşdə çıxışından: ۲۰۰۵

səh:۱۹۳

Əgər Quran oxumaq bizim cəmiyyətimizdə ümumiləşsə, hamı Quranı düzgün oxusa və Quran oxumağa rəğbət dalğası bütün evlərə çatsa, o zaman bu ölkədə həqiqi İslam və Quran cəmiyyətinin formalaşmasına ümidimiz daha çox olacaq. Biz bu gün bir İslam hökuməti və İslam cəmiyyətiyik. Amma bunlar ilk addımlardır. Ölkəmiz və hökumətimiz daxilində dövlət adamlarının söz və əməllərində müşahidə etdiyimiz İslam onun minimum həddidir, bir İslam cəmiyyəti üçün lazım olandan azdır. Bu günə qədər İslam Respublikası quruluşundan törəyən faydalar həmin minimum hədlə əldə olunmuşdur. Əgər İran xalqı bu ölkədə istibdad bütünü qırıb uçura bilmişsə, əgər İran xalqı dünyada heç kəsdən hegemon söz qəbul etməmək və boyunduruq altına girməmək cürəti və cəsarəti əldə etmişsə, əgər bizim gənclərimiz elmin müxtəlif sahələrində sürətlə irəliləyir və daim ucalırlarsa, – xoşbəxtlikdən, ölkəmizdə elmi inkişafın dairəsi günbəgün genişlənir – əgər ölkəmizdə ədalətin icrasına dair əlamətlər görürsünüzsə, – bir də deyirəm ki, ədalətin icrasına dair yalnız əlamətlər var, tam ədalətin icrasına isə hələ çox qalır – xülasə, əgər cəmiyyətimizdə və ölkəmizdə İslamın bəyəndiyi işlərin bəyənilən və İslamın bəyənmədiyi işlərin bəyənilməz olduğunu görürsünüzsə, bu bizim cəmiyyətimizdəki minimum İslam həddinin nəticəsidir. Biz İslam dərkinin, İslam ruhiyyəsinin dairəsini nə qədər genişləndirə bilsək, bu səmərələr .bir o qədər çoxalacaq və digər ölkələr üçün də örnək olacaq

Bu gün xoşbəxtlikdən, müsəlman xalqlar İslamla şərəf duyurlar. Bu çox mühüm məsələdir. Gənclər! Bir gün İslam dünyasında, o cümlədən bu ölkədə müsəlman gənc özünün müsəlman olması ilə fəxr etmirdi, hətta buna utanırdı da. Bismillah deməyə utanırdılar, digərlərinin gözü önündə namaz qılmağa utanırdılar. Bir zaman belə idi. O zaman ya Qərbə, ya da Şərqə – marksist təfəkkürlərə güvənməklə fəxr edirdilər. Bu gün isə vəziyyət dəyişmişdir. Bu gün Şərq düşərgəsi məğlub olmuşdur, Qərb düşərgəsi də getdikcə daha çox uğursuzluqlara düçar olur, daha çox gözdən düşür və heysiyyətini itirir. Demokratiya, insan haqları və azadlıq iddiaçıları özlərini bütün dünyada rüsvay etmişlər. İslam günbəgün daha çox nur saçır, İslam günəşi get-gedə yüksəlir. Müsəlman xalqlar İslamla şərəf duyur, fəxr edirlər. Bütün müsəlman ölkələrində belədir; Şimali Afrikadan tutmuş Şərqi Asiyaya qədər hər yerdə belədir; İndoneziyada, Malayziyada, Hindistanda, Pakistanda, Banqladeşdə, Şərq regionu

qeyri-ərəb ölkələrində - harada müsəlmanlar və müsəlman gənclər yaşayırlarsa, .İslamla şərəf duyurlar

Bu şərəf hissi onları qalib edir. Nə üçün Livan Hizbullahı - dünyanın normal siyasi, hərbi və iqtisadi imkanlarından məhrum olan bir qrup gənc dünyanın böyük güclərinin inanıb güvəndiyi və tam təchiz olunmuş bir ordu üzərində qələbə çaldı. Çünki İslamın sayəsində özünə güvəndi. İslama əməl etməyin Quranın sözünü və vədini qəbul etməkdən ibarət olduğunu dedikdə mənası budur ki, Quran Allah Ona (Onun dininə) yardım edənlərə, şübhəsiz ki, yardım edər. Həqiqətən, Allah yenilməz qüvvət, qüdrət sahibidir!(١) deyəndə inanaq. Əgər Allaha yardım etsəniz, Allah da sizə yardım edəcək. Allah Öz işində (əmrində) qalibdir(٢) ayəsinə inanaq. Bu Quran dərki bizə belə bir inam verir. Onun səmərəsi və nəticəsi xalqların oyanışında, təcavüzkar güclərin günbəgün zəifləməsində, işğalçı və hegemonların müsəlman ölkələrinə dair planlarının alt-üst .olmasında görünür

Buna əsasən, Quranla ünsiyyət quraq, Qurana inanaq, onu dərk edək. Xoşbəxtlikdən, ölkəmizdə genişmiqyaslı Quran işləri başlanmışdır. Lakin bu hərəkət heç zaman dayanmamalıdır. Quranla məşğul olan, işləyən və Quranla fəxr edən siz əziz gənclərə tövsiyə edirəm ki, bu yolu və mübarək üsulu davam etdirin. İnşallah onun sizə, .xalqınıza və ölkənizə olan faydaları günbəgün çoxalacaq

Beynəlxalq Quran müsabiqələrinin iyirmi üçüncü mərhələsində iştirak edən .qiraətçilərlə görüşdə çıxışından: ٢٠٠۶



---

١- [٢١۶] Həcc/۴٠.

٢- [٢١٧] Yusuf/٢١.

## Ramazan ayının digər aylardan üstünlüyünün səbəbləri

Allahın köməyi olmadan heç bir şəxsə və xalqa heç bir başucalığı və səadət nəsib olmaz. İlahi yardımın da şərtləri və amilləri var. Duada deyirik ki, İlahi, Səndən rəhmət amillərini istəyirəm.(١) İlahi rəhmətin ən mühüm amillərindən biri də ölkə məmurlarının, müxtəlif sahələrin icraçılarının Allah-Taala və xalq qarşısında öhdəlik hissinə malik olmasıdır. Bu hiss nə qədər çox olsa və öz ardınca daha yaxşı və daha güclü fəaliyyət gətirsə, şübhəsiz, ilahi rəhmət bizə daha çox şamil olacaq. Biz ilahi niyyətlə, Allaha yaxınlaşmaq qəsdi ilə hərəkət etməli və bilməliyik ki, bu zaman Allahın yardımı və lütfü qaçılmaz olacaq. İndi ramazan ayı və əlverişli fürsətdir. Ümumiyyətlə Allah-Taala orucu təqvalı olmaqdan ötrü vacib etmişdir. Ən azı orucun bu ayda vacib olmasının məqsədlərindən biri və bu ayın mühüm səciyyəsi təqva qazanmaqdır. Gündəlik namazlardan sonra oxunan duada deyirik: Bu, digər aylardan əzəmətli, (böyük, şərafətli və fəzilətli etdiyin aydır.(٢

Allah-Taala bu ayı digər aylardan üstün etmişdir. Onu üstün edən amillərdən biri orucdur, biri Quranın nazil olmasıdır, biri qədr gecəsidir. Bunlar həmin duada bu ayın səciyyələri kimi qeyd olunmuşdur. Ramazan ayı bizim inkişafımız üçün əlverişli mövsümdür, bahar fəsli kimidir. İlin hər bir fəslinin təbiətə xüsusi təsiri olduğu kimi, bəzi gündüzlərin, gecələrin, həftələrin və ayların da insanların mənəvi inkişafı, fəaliyyəti və onların yüksəlişi üçün xüsusi təsiri vardır; cümə axşamının bir xüsusiyyəti var, cümə gününün bir xüsusiyyəti. Buna təəccüb etmək lazım deyil. Bəzi zamanların maddi təbiətə xüsusi təsiri olduğu kimi, mənəvi təbiətə, insan ruhuna, insan yüksəlişinə, əməllərin qəbul olunmasına və ibadətlərə də xüsusi təsiri vardır. Qeyd etdik ki, cümə günü, şəbanın on beşinci gecəsi və xüsusən müqəddəs şəriət tərəfindən təyin olunmuş zamanlar belədir. Bu günlər təsadüfi seçilməyib. Məsələn, ramazan ayı təbiət və təsir baxımından rəcəb, yaxud zilqədə ayı ilə eyni deyil. Xeyr! İlin fəsilləri kimi, .onların da öz xüsusiyyətləri var. Bundan istifadə edin

Bir hədisə görə əziz İslam Peyğəmbəri (s) ramazan ayı ərəfəsində xalqa müraciətlə buyurdu: Sübhanəllah! Görün siz nəyi qarşılayırsınız və sizi nə qarşılayır!(٣). Bu, ramazan ayının uca tutulmasıdır. Əziz Peyğəmbərin (s) həqiqəti və batinləri görən gözü ramazan ayının faydalarını görür. Oruc bir fürsətdir. Onun təsir və faydalarını

.eşitmisiniz və bilirsiniz

səh:۱۹۶

---

.Misbah əl-mütəhəccid, c. ۱, səh: ۶۱ [۲۱۸] -۱

.İqbal əl-əmal, c. ۱, səh: ۲۴ [۲۱۹] -۲

.Müstədrək əl-vəsail, c. ۷, səh: ۴۲۵ [۲۲۰] -۳

## Əmirəlmömininin (ə) kəlamında cismin və ruhun orucu

Əmirəlmöminin (ə) bir hədisdə orucu cisim və ruh oruclarına bölür. Cismin orucu haqda buyurur: Cismin orucu əzab qorxusundan, savab və əcrə rəğbət üzündən iradə və ixtiyarla qidalardan çəkinməkdir.(١) Bu, cismin orucudur. Davamında buyurur ki, ruhun orucu isə beş hiss orqanını bütün günahlardan saxlamaq və qəlbi şər amillərindən uzaqlaşdırmaqdır. Bu, ruhun orucudur. Bəs şər amilləri hansılardır? Beş hiss orqanını günahlardan saxlamaq asandır, qəlbi şər amillərindən uzaqlaşdırmaq isə çox çətindir. Bunun üçün çalışmaq lazımdır. Əziz dostlar! Bu fərman mənə və sizə verilmişdir. Bu mübarizə bizim öhdəmizə düşür. Bizim etdiyimiz günahla cəmiyyətdə yüksək vəzifəsi olmayan adi bir insanın günahının təsiri eyni deyil. Biz həm ürək günahlarına, həm də digər günahlara qarşı çox ehtiyatlı olmalıyıq. Şər səbəbkarı olan günahlar paxıllıq, tamahkarlıq – dünyaya tamahkarlıq, mal toplamağa və maddiyyata tamahkarlıq, digərlərinə qarşı bədxahlıq, bədgümanlıq, qürur, təkəbbür, özünü üstün, digərlərini isə kiçik bilmək, təhqir etmək və xalqı kiçik saymaqdır. Dünyada yaranan şərlər bunlardan hasil olur. Bəzi insanların qüruru, təkəbbürü, tamahkarlığı, paxıllığı, xəsisliyi və şəhvətpərəstliyi onları bəzi hərəkətlərə sövq edir. Əvvəldə bu hərəkətlərin təsiri çox da görünmür, lakin tədricən insani və tarixi faciələrə çevrilir. Böyük tarixi faciələrə baxdığımızda və bu fəsadların mənşəyini axtardıqda bir insanda və bir şəxsdə mövcud olan belə xüsusiyyətlərə çatırıq. Bir insanda, yaxud müəyyən bir qrupda olan tamahkarlıq, dünyagirlik, xəsislik və ehtiras böyük faciələrə səbəb olur. Riyakarlıq, onun qarşı tərəfi olan əhəmiyyətsizlik, laqeydlik və həyasızlıq da şər amillərindəndir. .İnsan qəlbini bunlardan təmizləməlidir

Ramazan ayı bu işlər üçün təlim və bizim tərbiyə ayımızdır. Biz bu yola qədəm qoymalı, bu yolla hərəkət etməliyik. Məmurların üzərinə düşən məsuliyyət ağır, lakin çox şərəfli məsuliyyətdir. İslam Respublikası quruluşu toplumların xoşbəxtliyini tarix boyu peyğəmbərlərin gətirdiyi və bəşərə çatdırdığı mesajlarla təmin etməyə çalışan bir quruluşdur. Bu quruluş tağutların mesajı qarşısında peyğəmbərlərin mesajını əməli surətdə təsdiq edir. Bu gün də mövcud olan tağutlar bundan xoşlanmır, bununla mübarizə aparırlar. Bu qarşıdurmada qələbənin yolu da yalnız imanla, özünəi və öz yoluna inamla yanaşı, müqavimət göstərməkdir. Gərək yola inamımız olsun: Peyğəmbər Rəbbi tərəfindən ona nazil edilənə inanmış və möminlər də iman

gətirmişlər. (Onların) hamısı Allaha iman gətirmişlər(۲). Yəni bu yola inananların hamısı -əl

səh:۱۹۷

---

۱- [۲۲۱] Təsnif Ğürər əl-hikəm və dürər əl-kəlim, səh: ۱۷۶.

۲- [۲۲۲] Bəqərə/۲۸۵.

ələ verib möhkəm dayansınlar və müqavimət göstərsinlər. Bu, inkişaf və qələbə yoludur. Əgər bu işi görsələr, qələbə qətidir. Biz bu iyirmi yeddi il boyu bunu təcrübə etmişik. Müxtəlif məsələlərdə harada öz sözümüzə inanmışıqsa, onun üstündə möhkəm dayanmışıqsa, uğur qazanmışıq. Müqəddəs müdafiədə bu məsələ qarşıya çıxdı, bu müqəddəs quruluşun əsasını qorumaqda qarşıya çıxdı, ölkənin müxtəlif sahələrdə günbəgün və hətta saatbasaat inkişafında qarşıya çıxdı. Biz bu gün ölkəmizin inkişaf göstəricilərinə baxıb onları inqilabın əvvəli ilə müqayisə edəndə görürük ki, ümumiyyətlə müqayisəolunası deyil. O zaman təxmin olunmurdu ki, bütün problemlərə rəğmən, bu mərhələyə çatmaq mümkün olsun. Amma Allahın yardımı ilə çatdıq. Bu, inamla yanaşı olan müqavimətin təsiridir. Yol budur. Əgər məmurlar .səhlənkarlıq etsələr, onun məhvedici təsiri yalnız özlərinə yox, bütün xalqa toxunacaq

Məmurların adi insanlara məxsus günahlardan əlavə, özlərinə məxsus günahları da var. Onlardan biri səhlənkarlıq – görə bildiyi və görməli olduğu işi göməməkdir. Bizim günahlarımızdan başqa birisi ümumi əmlaka əl uzatmaqdır. Yəni bu günahı mən və siz edə bilərik, adi camaat edə bilməz. Onun təsiri də adi bir adamın etdiyi oğurluğa nisbətən dəfələrlə artıqdır. Ümidsizlik yaratmaq və ölkənin ümumi hərəkətini zəiflətmək bizim günahlarımızdan başqa birisidir. Xalqı, fəal qüvvələri məyus etmək, həvəs və ümidlə hərəkət etməli olan şəxsləri həvəsdən salmaq xalqın hərəkətini zəiflətməkdir. Bu, böyük günahdır. Ölkənin hərəkətini zəifldən amillərdən biri təfriqə, ixtilaf və intriqadır. İxtilaf yaratmaq, yaxud ixtilafı dərinləşdirmək biz məmur və siyasətçilər zümrəsinə məxsus günahlardandır. İqtisadi fəsad – istər iqtisadi fəsadda rolunun olması, istər iqtisadi fəsada göz yummaq da ölkənin ümumi hərəkətini zəifldən amillərdəndir. İqtisadi fəsadın özü həm fəsad kimi ölkənin ümumi maliyyə durumunda problem yaratdığından hərəkəti zəifldən amildir, həm də xalqdakı mənfi təsirinə görə başqa bir cəhətdən fəsada səbəb olur və ümidsizlik yaradır. Buna görə istər Allah eləməmiş, bir fəsadda iştirak etmək, istərsə də bir fəsadı görüb ona göz yummaq, yaxud xalqı fəsada çəkmək, fəsada cürətləndirən sözlər danışmaq və işlər görmək ölkənin hərəkətini zəifldən və bizə məxsus olan günahlardandır. Bu cəhətdən .fəsadın növləri arasında fərq yoxdur

## Təqva, ehtiyatlılıq və özündən muğayat olmaq

Oruc təqvalı olmaqdan ötrüdür. Dəfələrlə demişik ki, təqva özündən ehtiyatlı olmaqdır. Təqva odur ki, özünüzdən muğayat olasınız, özünüzü daim diqqətdə saxlayıb səhvə düşməyəsiniz. Çox zaman bizim gözlərimiz digərlərinin səhvlərini görür, kimin harada hansı səhvi etdiyinə baxırıq, öz

səhvlərimizi isə görmürük. Bu pisdir. Biz bir şəxs kimi, bir məmur kimi, bir müdir kimi öz səhv və xətalarımıza baxmalıyıq. Təbii ki, bu çətindir. İnsanın öz səhvini təsdiqləməsi, öz səhvini tapması və özünü qınaması asan deyil. Biz bu çətin işi görməliyik. Allah-Taala qiyamətdə və o çətin məhkəmədə yaxamızı tutub bizdən soruşacaq. Əgər indi .fikirəşməsək, orada cavaba aciz qalacağıq

Bu gündüz və gecələrin imamlardan nəql olunan duaları daim üzərimizdə işləyib özümüzü islah etməmiz üçün bizə Allahla ünsiyyət yolunu öyrədir. Əbu Həmzə duasında deyilir ki, İlahi, Sənin sualına və mühakimənə cavabım olmayacaq, dəlil göstərə bilməyəcəyəm. Deyəcəksən ki, nə üçün bu işi gördün, nə üçün bu hərəkəti etdin. İndi bizdən soruşsalar, bir-birinin ardınca dəlillər söyləyib işimizi əsaslandırarıq, amma orada əsaslandıra bilməyəcəyik. Çünki həqiqətlər aydındır. Orada bəhanələrə yer olmayacaq. İlahi, o zaman mənə rəhm et, çünki onda ilahi sual və qınaq qarşısında insanın dili bağlanır, fikri qarışır.(١) Bu haqda fikirləşmək lazımdır. Bu gün mən və siz sağıq, nəfəs almaq fürsətimiz var, bunu bacarırıq. Bunun yolu da ehtiyatlı olmaqdır. Bu ayda ehtiyatlı olmaq mümkündür. Bu bizim əsas sözümüzdür. Əlbəttə, bu tövsiyələrin birinci ünvanı özüməm. Çünki bu ehtiyatlılığa mənim sizdən daha çox ehtiyacım var. .Bunları deyirik ki, Allah-Taalanın yardımı ilə həm bizə təsir etsin, həm də sizə

.Quruluşun məsul şəxsləri ilə görüşdə çıxışından: ٢٠٠۶

səh:١٩٩

---

.İqbal əl-əmal, c. ١, səh: ٧٣ [٢٢٣] -١

Bu ayın orucunun, ibadətlərinin, qədr gecələrinin əməllərinin və Quran qiraətinin ən .mühüm təsirlərindən biri bizim qəlbimizin təqvalı olmasıdır

Bu xütbədə dua haqda qısaca danışmaq istəyirəm. Çünki ramazan ayının dua ayı olmasından əlavə, qədr gecələri və gündüzləri də duaya məxsus saatlardır. Bu .fürsətdən istifadə etməliyik

Dua barədə bizim sözümüzün qısası budur ki, dua Allah qarşısında bəndəliyin təzahuri və insanda bəndəlik ruhunun gücləndirilməsi üçündür. Allah qarşısında bu bəndəlik ruhu, Allahın peyğəmbərlərinin əvvəldən sona qədər tərbiyə və səylərinin yönəldiyi nöqtədir. Onlar insanlarda bəndəlik ruhunu dirçəltməyə çalışmışlar. Bütün insani dəyərlərin və bir insanın istər şəxsi, istər ictimai və ümumi dairədə görə bildiyi xeyir işlərin mənşəyi Allah qarşısında bəndəlik hissidir. Bu bəndəlik hissinin qarşı tərəfi xudbinlik, eqoistlik və qürurdur. Bu, insanda bütün əxlaqi ziyanların və onların əməli nəticələrinin mənşəyidir. Dünyanın bütün bu müharibə və qırğınlarının, edilən zülmlərin və tarix boyu baş vermiş, sizin oxuduğunuz, eşitdiyiniz, yaxud bu gün gördüyünüz bütün faciələrin qaynağı insanların bir qrupunda olan qürur, eqoistlik və xudbinlik hissidir. Bəndəlik isə bu eqoistliyin, qürurun və xudpərəstliyin qarşı tərəfidir. Əgər Allah qarşısında bu xudpəsəndlik və eqoistlik olsa, yəni insan özünü Allahın qarşısında görsə, onun insanda nəticəsi tüğyan etməkdir: tağut. Tağut da təkcə padşahlar deyillər. Biz insanların hər birimizin öz daxilimizdə – Allah eləməmiş – bir tağut və büt yetişdirməyimiz mümkündür. Allah qarşısında üsyankarlıq etməyin və xudpəsəndliyin nəticəsi tüğyanın inkişaf etməsindən ibarətdir. Əgər bu xudpəsəndlik digər insanların qarşısında olsa, nəticəsi digərlərinin hüququnu görməzdən gəlmək, onun-bunun haqqına təcavuz etmək və əl uzatmaq olacaq. Əgər bu xudpəsəndlik təbiət qarşısında olsa, nəticəsi təbii mühiti məhv etmək olacaq; yəni bu gün dünyada haqlı olaraq diqqət göstərilən məsələ. İnsanın təbii yaşayış mühitini görməzdən .gəlməsi də təbiət qarşısında tüğyanın, xudpəsəndliyin və xudbinliyin nəticəsidir

Dua bunların hamısının ziddidir. Dua etdikdə əslində özümüzdə bu təzim etmək halını vücuda gətirir, xudpəsəndliyi və eqoistliyi məhv edirik. Nəticədə, varlıq aləmi və

cəmiyyətlər tüğyandan, haqlara və təbiətə təcavüzdən qorunur. Buna görə buyurdu ki, hər bir ibadətin məğzi duadır. İbadətlər insana Allah-Taala qarşısında təzim etdirmək, onun ürəyini müti və təslimçi etmək üçündür. Allah qarşısında olan bu itaət və təzim insanların bir-biri qarşısında təvazökarlığı, kiçilməsi və təzim göstərməsi kimi deyil, mütləq xeyir, mütləq gözəllik, mütləq yaxşılıq və mütləq fəzilət qarşısında .kiçilməkdir

Buna görə, dua və dua etmək imkanı bir nemətdir. Əmirəlmöminin (ə) İmam Müctəbaya (ə) vəsiyyətində deyir ki, yerin və göyün bütün qüdrətinə malik olan Allah-Taala sənə dua etmək, danışmaq və ondan istəmək icazəsi vermişdir: "Sənə əmr edib ki, ondan istəyəsən və O sənə əta etsin". Allahdan bu növ istəmək və istəyi almaq əlaqəsi insan ruhunun yüksəliş amili və bəndəlik ruhiyyəsinin gücləndirilməsidir. Allah-Taala da səxavətlidir, Özü ilə sənin aranda heç bir məsafə və sədd yaratmamışdır.(١) Nə vaxt Allahla danışmağa, ehtiyacı söyləməyə başlasanız, Allah-Taala sizin istəyinizi və səsinizi eşidəcək. Allahla həmişə həmsöhbət olmaq, danışmaq, ünsiyyət qurmaq və .Ondan istəmək olar. Bu, bəşər üçün çox böyük fürsət və nemətdir

Duanın ən mühüm səciyyəsi Allahla əlaqə, Allahın qarşısında bəndəlik hissidir. Bu, duanın ən böyük təsiri və xüsusiyyətidir: Allahdan istəmək və Allah-Taalanın da qəbul etməsi. Əlbəttə, Allah tərəfindən cavab üçün heç bir qeyd-şərt yoxdur. Biz öz əməllərimizlə qəbul olunmaya maneçilik törədirik. Duamızın diqqətsiz qalmasına səbəbkar özümüzük. Bunun özü duadan istifadə edilməsi mümkün olan bilgilərdəndir. .Duanın xüsusiyyətlərindən biri budur

### Gənclərin məsumlardan nəql olunmuş duaların tərcüməsinə diqqət yetirməsi

İmamlardan nəql olunmuş duaların faydalarından biri onlarda mövcud olan ilahi bilgilərdir. Kumeyl duası, Şəban münacatı, Əbu Həmzə Sumali duası və digər dualar ilahi bilgilərlə doludur. Əgər insan bunları oxuyub anlasa, Müqəddəs Allahla və Həzrət .Haqla mənəvi əlaqədən əlavə, çoxlu belə məlumatlar da toplayar

Mən gənclərə təkidlə tövsiyə edirəm ki, bu duaların tərcüməsinə baxsınlar. Bu Ərəfə və Əbu Həmzə duaları dini təlimlə doludur. Biz Kumeyl duasında belə oxuyuruq: Allahım, cəzaları endirən günahlarımı bağışla! Allahım, duaları həbs edən günahlarımı bağışla!(٢). Bütün bunlar ilahi təlimlərdir. Mənası budur ki, bizim etdiyimiz günahlar bəzən dualarımızın qəbul olunmasına mane olur. Bəzən elə günahlar edirik ki, onlar bəlanı bizə ərməğan edir. Bəzən günahların təsirindən ümumi və milli bəlalar yaranır. Təbii ki, hansı bəlanın hansı günah ucbatından baş verdiyi elan olunmur, amma düşüncəli insanlar bunu bilirlər. Bəzən əməllərin təsiri sürətli olur, bəzən isə fasilə ilə. Bunları dua bizə deyir. Yaxud Əbu Həmzə duasında deyirik ki, mənim Səni tanımağımın

özü məni Sənə yönəldir və mənim Səni sevməyimin özü Sənin



---

.Bihar əl-ənvar, c. ۷۴, səh. ۲۰۵ [۲۲۴] -۱

.Misbah əl-mütəhəccid, c. ۲, səh: ۸۴۴ [۲۲۵] -۲

yanında mənə şəfaətçidir. Mən bu bələdçini görəndə özümün Səni tanımağımı, Sənə olan bu sevgimi görəndə onu Sənin yaratdığını görürəm, bilirəm ki, kömək edən Sənsən.(۱) Baxın, bu, insanın gözünü açır və bir təsəvvür yaradır. Bunlar ilahi bilgilər, ilahi yardım, ilahi uğur və ilahi səadətdir. Bunları dualarda tapmaq olar. Duanın qədrini .bilin

Dua Allahı çağırmaqdır. Bu fars dilində də ola bilər, öz dilinizdə də ola bilər. Allaha nə demək istəsəniz, bu, duadır. Nəyi istəyirsinizsə, onunla bir arada qoyun. Bəzən də istək dilənmir, yalnız Allahla ünsiyyət qurulur. İstəklər də müxtəlifdir. Bəzən insan Allah-Taaladan Onun razılığını, yaxud əfv etməsini istəyir. Bu bir cür istəkdir. Bəzən də insan maddi istəklər diləyir. Bunun eybi yoxdur. Nə olursa-olsun və hansı dillə olursa-olsun, Allahdan istəmək yaxşıdır və onlarda qeyd etdiyimiz xüsusiyyətlər - Allahla əlaqə və bəndəlik hissi vardır. Məsumlardan nəql olunan dualar ilahi bilgilərlə dolu olan ən gözəl formalı və ən yaxşı məzmunlu dualardır. Onların qədrini bilmək və onlardan .yararlanmaq lazımdır

.Tehranın cümə namazı xütbələrindən: ۲۰۰۶

səh:۲۰۲

---

.İqbal əl-əmal, c. ۱, səh: ۶۸ [۲۲۶] -۱

Mömin insanların paklıq, ixlas və mənəviyyat ayı olan mübarək ramazan ayı bitdi. Xalqımız bu ay boyu həm mənəviyyat sahəsində, həm də siyasi məsələlərdə öz fəallığını göstərdi. Siyasi sahədə mübarək ramazan ayının son cümə günü ölkənin hər yerində ayağa qalxdı, öz fəryadı, şüarı və uca səsi ilə məzlum Fələstin xalqını dəstəklədi. Bu il Allahın lütfü ilə İslam dünyasının bir çox yerlərində eyni fəallıq, şüur və məsuliyyət hissi müşahidə olundu. Şübhəsiz, İslam ümmətinin Hizbullahın .qələbələrindən yaranan yüksək əhval-ruhiyyəsi bu mənəvi və siyasi fəallıqda təsirli idi

Bu il bizim əziz xalqımız ölkənin hər yerində çox mənəviyyatlı bir ramazan ayı keçirdi. Çox rövnəqli namaz və Quran məclisləri, dua və təvəssül məclisləri və qədr gecələrində əhya məclisləri təşkil olundu. Bütün ölkədə, şəhər və kəndlərdə bizim xalqımız, xüsusən də gənclər bu gecələrdə öz ruh və qəlblərini tövbə suyu ilə yudular. Mənim dəqiq məlumatım var və gözlə müşahidə kimi dəqiq məlumatlarda da göstərilir ki, qədr gecələrində Tehranın və rayonların məscidlərində və ölkənin bütün ibadət mərkəzlərində bizim hər bir cinahdan, hər bir görkəmdə, hər bir hiss və təmayüldə olan gənclərimiz öz qəlblərini götürüb məscidlərə gəldilər, öz Allahları ilə raz-niyaz etdilər. Bu gənclik paklığı, gənc qəlblərin nuru, bizim gənclərimizin ilahi yaxınlığa rəğbəti və Allah-Taala ilə danışmaq istəyi çox böyük nemətdir. Allaha şükür olsun ki, bu nemət var və günbəgün də çoxalır. Mübarək ramazan ayının son günlərində ölkənin bəzi məscidlərində minlərlə insan etikaf etdi, gecə-gündüz ibadət və zikrlə məşğul oldular, minlərlə Quran oxundu. Mən gənclərimizin bu mənəvi saflanması və :qəlblərinin paklanması haqda iki məqama toxunmaq istəyirəm

Birinci məqam budur ki, bütün xalq, xüsusən də əziz gənclər bu mübarək günlərin və nurlu gecələrin sayəsində Allah-Taala ilə əldə etdikləri bu rabitənin qırılmasına qoymasınlar. Allah-Taala ilə bu rabitəni qoruyun. Bu rabitəni qorumaq vasitəsi də hamının ixtiyarındadır. Əgər gündəlik beş namaz diqqətlə, qəlbin hüzuru ilə və Allah qarşısında durmamıza diqqətlə qılınsa, ən yaxşı rabitədir və sizin qəlbinizi günbəgün işıqlandırar. Qədr gecələrində məscidlərə, hüseyniyyələrə və müqəddəs məqbərələrə toplaşıb ağlayan, dua oxuyan, başlarına Quran tutan, səhərədək oyaq qalan və qəlblərini ilahi sevginin işığı ilə nura boyayan gənclər bu əlaqəni qorusunlar və ondan

istifadə etsinlər. İnşallah zaman ötdükcə bu əlaqə də çoxalacaq. İnsan bu yolla öz yaranışının ideal məqsədinə nail ola bilər. Həyatın bütün sahələrində uğur da buna .bağlıdır

İkinci məsələ budur ki, bu münacatlarda, raz-niyazlarda, istəklərdə hər cür istəyi, hətta kiçik istəkləri də Allahdan diləmək olar və lazımdır. Lakin öz istəklərinizi kiçik istəklərlə məhdud edib daha böyük istəkləri yaddan çıxarmayın. Onların ən böyüyü ilahi əfvdir. Allahdan istəyin ki, günah və yayınmalardan yaranmış təsirləri bizim qəlbimizdən və ruhumuzdan silsin. Allahdan istəyin ki, tövbə yolunu sizə açsın. Başqa bir böyük dilək ilahi sevgidir. Allah-Taaladan ilahi sevgini diləyin. Başqa böyük dilək İslam ümmətinin vəziyyətinin yaxşılaşmasıdır. Allahdan istəyin ki, yalnız İran xalqının yox, bütün müsəlmanların və bütün İslam ölkələrinin işlərini düzəltsin. Hətta Allah-Taaladan bəşəriyyətin düz yola yönəlməsini də istəyin. Bu duaların qəbul olunma şansı çoxdur. Onlar təsir edir, yolları açır, vasitələri asanlaşdırır və böyük ideallara .çatmaqda bizə kömək edir

Allah-Taaladan istəyirik ki, sizin hamınıza uğur bəxş etsin və bu ayın müsbət təsirlərini .özünüz üçün qoruya biləsiniz

.Fitr bayramı namazının xütbələrindən: ۲۰۰۶

səh:۲۰۴

## Qurana dair üç əsas vəzifə: öyrənmək, anlamaq və düşünmək

Siz müsəlman gənc, müsəlman kişi və qadın və müsəlman uşaqlar Quranla ünsiyyət qurmalısınız. Quranda oxuduqlarınız haqda düşünün və onlardan öyrənin. Sonrakı mərhələ də əməldir. Amma mən əməldən öncəki mərhələsini deyirəm: Quranı .öyrənmək, anlamaq, ayə və sözlər üzərində düşünmək

Sizin oxuduğunuz bu sözlər Allah-Taalanın ilahi vəhyin son mənəvi ehtiyatı kimi bəşəriyyətə bəxş etdiyidir. Bunlar bəşəri bu dünyanın sonuna qədər xoşbəxtlik və qurtuluş yoluna yönəltməli olan sözlərdir. Dərin bilgilərlə dolu olan bu sözləri anlamaq .lazımdır

Təəssüf ki, bizim dil və lüğət problemimiz var. Bu bizim, yəni qeyri-ərəb xalqların çatışmazlığıdır. Özləri ərəb olanlar qiraətçi oxuduqca oturduqları yerdə tam olmasa da, onu başa düşürlər. Quranın sözü fəsahətli, bəlağətli və çox ucadır, onun xırdalıqlarını hər kəs anlamaz. Bənzətmə qüsurlu olsa da, Sədinin Gülüstanını buna misal vurmaq olar. Bəli, Sədinin Gülüstanı bəlağətli fars dilindədir, camaat onu başa düşür, amma zərif nöqtələrini və xırdalıqlarını yalnız ədiblər və yüksək düşüncə sahibləri anlayırlar. İndi siz bunu min qat artırın. Quran belədir. Onun dəqiq və zərif nöqtələrini və xırdalıqlarını ərəb dilini bilən adi bir dinləyici başa düşməyə bilər, amma hər halda bu sözlərin mənasını anlayır. Buna görə də ürəyi yumşalır və Quran qiraətini eşidərkən ilahi nəsihəti dərk edib ağlayır. Bu bizim problemimizdir, amma həll olunasıdır. Kimsə düşünməsin ki, mümkün deyil, daha neyləyək. Xeyr! Bu tamamilə mümkündür. Quranın çoxlu sözləri bizim fars dilimizdə təkrar olunmuşdur və biz onları anlayırıq. Qədimdə mənim Məşhəddə Quran məclisim olurdu. Belə otururduq. Mən .bəzən ozamankı gənclər üçün - onlar indi qocalmışlar - söhbət edir və bunu deyirdim

Xoşbəxtlikdən, bu gün yaxşı tərcümələr çoxdur. O zaman Quranın bir yaxşı tərcüməsi də yox idi ki, camaat istifadə etsin və məna baxımından etimadlı olsun. Bu gün Allaha şükür olsun ki, çoxlu sayda yaxşı tərcümələr vardır. Bu tərcümələrə müraciət edin, onlara baxıb Quranın mənasını anlayın. Deməli, bu bir nöqsandır, amma onu aradan .qaldırmaq, yəni ayələrin mənasını başa düşmək olar

## Qurani-kərimlə rabitəni il boyu qorumaq

Quran oxumaq ayı, Quranın nazil olduğu və Quran məclisləri ayı olan mübarək ramazan ayında məscidlərdə və müxtəlif yerlərdə çoxlu Quran məclisləri təşkil olunur, amma ramazan ayı bitəndən sonra Quranı bağlayır və

öpüb kənara qoyuruq. Belə olmaz. Biz Quranı özümüzdən ayırmamalı, daim Quranla rabitədə və ünsiyyətdə olmalıyıq. Hədislərdə deyilir ki, hər gün ən azı əlli ayə Quran oxuyun. Bu bir meyardır. Əgər imkanınız çatmasa, gündə on ayə oxuyun. Deməyin ki, namazda Həmd və surə oxuyuruq, elə bir rükətdə filankəsin dediyi on ayəni oxumuş oluruq. Xeyr! Müstəhəb, yaxud vacib namazda oxuduğunuz ayələrdən əlavə, Quranı açın, oturun və qəlbin hüzuru ilə on ayə, iyirmi ayə, əlli ayə, yüz ayə oxuyun. Quranı düşünmək, anlamaq və istifadə etmək üçün oxuyun. Bir növ oxumaq budur ki, insan Quranı götürüb mənasına fikir vermədən axıracan oxusun. Demək istəmirik ki, bunun heç bir təsiri yoxdur. Mən əvvəllər deyirdim ki, heç bir təsiri yoxdur, amma sonra fikrimi dəyişdim. Bunu demək olmaz, amma Quran oxumaqdan gözlənilən təsir .qarşısında yox kimi bir şeydir

Bir qiraət budur ki, ayəni hansısa minbərdə danışmaq, hansısa çıxışda, məclisdə söyləmək üçün oxuyurlar. Bu bizim kimilərin qiraətidir. Bunun eybi yoxdur, amma bizə .vəzifə olan oxumaq bu növdən də deyil

Bir oxumaq da budur ki, insan bir dinləyici kimi Allah-Taalanın söhbətinə qulaq assın. Allah-Taala sizinlə danışır. Sanki bir əzizinizdən, bir böyük adamdan sizə bir məktub gəlmişdir. Siz bu zaman məktubu nə üçün oxuyursunuz? Sizin üçün nə yazıldığını bilməkdən ötrü. Quranı da belə oxuyun. Bu, Allah-Taalanın məktubudur. Ən etimadlı dili və qəlbi olanlar bu Quranı Allah-Taaladan alıb sizə çatdırmışlar. Biz ondan bəhrələnməliyik. Buna görə hədisdə deyilir ki, bir surəni oxuyanda sonuna çatmağa yox, onu anlamağa çalışın. Fikirləşin, düşünün. Quranı belə oxuyun. Əgər insan Quranla ünsiyyət qursa, ondan əl çəkməz. Əgər biz Quranla ünsiyyət qursaq, .həqiqətən ondan əl çəkmərik

### Quranı əzbərləmək neməti

Axırıncı məsələ bizim dəfələrlə təkrarladığımız Quranı əzbərləmək məsələsidir. Quranı əzbərləmək böyük nemətdir. Gənc və yeniyetmələr əzbərləmək yaşının qədrini bilsinlər. Siz elə bir yaşdasınız ki, əzbərləyib yadınızda saxlaya bilirsiniz. Biz də əzbərləyə bilərik, bizim yaşımızda da mümkündür, amma yaxşı alınmır və tez yaddan çıxır. Mümkünlüyünə gəlincə, bizim kimilər üçün də mümkündür, bizdən yuxarı

yaşlarda – ۷۵-۸۰ yaşlarında olanlar üçün də. Mən eşitmişəm ki, mərhum Ayətullah Xoi ömrünün son illərində Quranı əzbərləmişdi. Bu çox mühüm məsələdir; məsələn, ۸۰ yaşlı bir qoca Quranı əzbərləyir. Əzbərləmək olar, amma yaxşı yadda qalmır, yaddan çıxır. Əgər siz gənclik, xüsusən də yeniyetməlik çağında, yəni burada bizim

üçün Quran oxuyan bu yeniyetmələrin yaşında, yaxud bunlardan yuxarı yaşlarda Quranı əzbərləsəniz, sizin üçün bir sərvət və ehtiyat olar. Quranı əzbər bilən şəxsin onun sözləri üzərində düşünmək imkanı dəfələrlə artıq olur. Bəzən insan Quranda bir ayəyə baxır, elə bilir ki, bu ayəni heç vaxt oxumayıb, amma Quranı əzbərləyən adam üçün belə bir hal qarşıya çıxmır. Ümidvarıq Allah-Taala deyib-eşitdiklərimizi .qəlblərimizə təsirli etsin

Bir neçə Quran duası

İlahi! Bizi Quranla yaşat və Quranla öldür! İlahi! Bizi qiyamətə Quranla birgə gətir! Bizi Quranda mövcud olan uca bilgilərdən faydalandır! İlahi! Bizim qəlblərimizi Quranla yaşat, Quranla işıqlandır! İlahi! Bizi sözün həqiqi mənasında Qurana hafizlərdən et! Bizim cəmiyyətimizi Quran cəmiyyəti et! İlahi! Öz lütfünü, mərhəmətini və şükrünü bu Quran qiraətçilərinə, quransevərlərə və məclisimizdə iştirak edən Quran müəllimlərinə şamil et! İlahi! Bizim əziz müəllimlərimizin çalışdığı işdə yardımçı olub Quranın təsir dairəsini günbəgün genişləndir! Dövrün imamının müqəddəs qəlbini bizdən razı et! Əziz imamımızın qəlbini, pak ruhunu və Quran yolunda mübarizə !aparmış şəhidlərin pak ruhlarını bizdən razı et

.Qurani-kərim qiraətçiləri ilə görüşdə çıxışından: ٢٠٠٧

səh:٢٠٧

## Ramazan – ilahi qonaqlığa dəvət və fürsətlər ayı

Namazda iştirak edən əziz qardaş və bacıların hamısını və özümü bu mübarək ayın ən dəyərli məhsulu və səmərəsi olan ilahi təqvaya çağırıram. Mübarək ramazan ayı bütün faydaları və mənəvi gözəllikləri ilə birgə yenidən gəlmişdir. Mübarək ayın gəlişindən öncədən əzəmətli İslam Peyğəmbəri (s) xalqı bu mühüm və faydalı aya hazırlayırdı: Allahın ayı bərəkət və rəhmətlə sizə doğru gəlir.(١) Rəvayətə əsasən, bu cümləni şəban ayının son cümə gününün xütbəsində buyurub ramazan ayının gəlişini xalqa xəbər verdi. Əgər ramazan ayını bir cümlədə tərif etmək istəsək, deməliyik ki, bu ay fürsətlər ayıdır. Bu ayda mənim və sizin üçün çoxlu fürsətlər yaranır. Əgər bu fürsətlərdən düzgün istifadə edə bilsək, çox dəyərli və əzəmətli bir azuqə toplamış olacağıq. Mən bu barədə bir qədər danışmaq istəyirəm. Birinci xütbə ramazan ayına və .bu bənzərsiz fürsətlərə dair məsələlərə həsr olunacaq

Həmin xütbədə əziz Peyğəmbər (s) buyurur ki, siz bu ayda Allah ziyafətinə dəvət olunmusunuz. Bu cümlənin özü diqqətəlayiqdir; ilahi qonaqlığa dəvət. Hamını bu qonaqlıqdan istifadəyə məcbur etməyiblər. Bu, vacib əməldir, amma ondan istifadə edib-etməməyimiz bizim öz əlimizdədir. Eləələri var ki, bu böyük qonaqlıqda ümumiyyətlə bu dəvətnaməyə baxmağa imkan tapmırlar. Onların qafilliyi, maddiyyatda və dünya işlərində qərq olmaları elə bir həddədir ki, ramazan ayının gəlib-getdiyini anlamırlar. Sanki bir nəfər çox möhtəşəm və xeyirli bir qonaqlığa dəvət olunur, amma buna macal tapmır, hətta dəvətnaməyə baxmağı da unudur. Bunlar ondan tamamilə məhrum olurlar. Bəzi adamlar bu qonaqlıqdan xəbərdar olurlar, amma ona getmirlər. Allah-Taalanın lütf etmədiyi, üzrləri olmayan halda oruc tutmaq səadətini vermədiyi, Quran oxumaqdan və ramazan ayının dualarından məhrum qalan insanlar bunlardır. Eləələri var ki, bu qonaqlığa qoşulmurlar, gəlmirlər. Bunların məsələsi aydındır. Müsəlman camaatın əksəri - bizim kimilər bu qonaqlığa gəlirlər, amma bundan götürdüyümüz faydalar eyni deyil. Bəzi adamlar bu fürsətdən .maksimum yararlanırlar

## Ramazan ayının ilahi ziyafətinin mənəvi faydaları

Bu ayda mövcud olan oruc və aclıq təlimi bəlkə də bu ilahi ziyafətin ən böyük

səmərəsidir. Mənəvi cəhətdən və insan qəlbində paklıq yaratmaq baxımından orucun faydaları o qədər çoxdur ki, bəlkə də bu ayın ən böyük faydasının orucdan ibarət olduğunu demək olar. Bəzi adamlar oruc tutmaqla bu qonaqlığa qoşulmuş və ondan bəhrələnmiş olurlar, lakin bu mənəvi təlimdən



---

۱- [۲۲۷] Şeyx Səduq, əl-Əmali, səh: ۹۳.

əlavə, özlərini Quran cəhətindən də yüksək həddə təmin edir, təfəkkürlə Quran oxuyurlar. Oruc halda, yaxud axşamlar və gecələr orucluqdan yaranan mənəviyyat halında Quran oxumağın, Quranla ünsiyyətin və Allaha dinləyici olmağın başqa bir ləzzəti və mənası var. İnsanın belə bir qiraətdə Qurandan öyrəndiyi adi halda öyrənilmir; onlar bundan da bəhrələnirlər. Bunlardan əlavə, Allah-Taala ilə danışmaq, söhbətləşmək, raz-niyaz etmək, öz qəlbinin sirlərini Allaha söyləməkdən də istifadə edirlər; yəni dualardan da oxuyurlar. Bu Əbu Həmzə Sumali duası, gündəlik dualar, axşam və gecələr oxunan dualar Allahla danışmaq, Allahdan istəmək, qəlbi ilahi izzət mənbəyinə yaxınlaşdırmaqdır. Onlar bundan da bəhrələnir, bu qonaqlıqda onun bütün .faydalarından istifadə edirlər

Bunlardan birinci olan və bəlkə də bir baxımdan ən üstünü günahları tərk etməkdir. Sözügedən şəxslər bu ayda günah da etmirlər. Əzəmətli Peyğəmbərin (s) həmin xütbəsində Əmirəlmöminin (ə) soruşur ki, bu ayda hansı əməl daha fəzilətlidir? Cavabda buyurur ki, Allahın haramlarından çəkinmək və günahlardan uzaqlaşmaq - ruhun və qəlbin bulaşmasının, paslaşmasının qarşısını almaq. Bu insanlar günahdan da çəkinirlər. Deməli, həm oruc tutmaqdır, həm Quran oxumaqdır, həm dua və zikrdir, həm də günahlardan uzaqlaşmaq. Bunlar ümumi şəkildə insanı əxlaq və rəftar baxımından İslamın nəzərdə tutduğuna yaxınlaşdırır. Bu işlərin məcmusu baş verdikdə insanın qəlbi kinlərdən təmizlənir, onda fədakarlıq ruhu oyanır, məhrum və yoxsullara kömək etmək, maddi işlərdə digərlərinə görə öz xeyrindən keçmək asanlaşır. Buna görə ramazan ayında cinayətin azaldığını, xeyir işlərin çoxaldığını, cəmiyyətdə sevgi və .səmimiyyətin artdığını görürsünüz. Bunlar sözügedən ilahi ziyafətin təsiridir

### Bağışlanmaq istəyi və onun faydaları

Bəzi adamlar ramazan ayından bu şəkildə tam faydalanırlar, bəzi adamlar isə bir şeydən faydalanır, bir şeydən yox. Bu ayda müsəlman bu ilahi ziyafətdən maksimum bəhrələnməyə, ilahi rəhmətə və əfvə qovuşmağa çalışmalıdır. Mən burada bağışlanma diləyi üzərində dayanmaq istəyirəm; istər kiçik, istər böyük günahlardan, səhvlərdən bağışlanma diləmək. Bu ayda qəlbləri paslardan təmizləmək, çirkablardan yumaq çox mühüm məsələdir və bu, bağışlanma diləməklə mümkündür. Elə buna görə müxtəlif hədislərdə göstərilir ki, ən yaxşı dua bağışlanma diləməkdir. Bağışlanma diləyi

də hamı üçündür. Uca insan olan əziz Peyğəmbər (s) də bağışlanmasını istəyirdi. Bizim kimilərin bağışlanmaq istəyi bir növ günahlara görədir - bizim vücudumuzda olan bu adi və normal günahlara, heyvani təmayüllərə, açıq-aşkar günahlara görə. Bəzilərinin

bağışlanmaq istəyi isə belə günahlara görə deyil, daha yaxşını tərk etdiklərinə görədir. Bəziləri daha yaxşını da tərk etmirlər, amma bağışlanma istəyirlər. Bu bağışlanma istəyi Pərvərdigarın müqəddəs zatının əzəməti qarşısında bir məxluq olan insanın mahiyyətcə və təbiətcə qüsuruna görədir, kamil dərkin olmamasına görədir. Bu, .övliyalara və böyüklərə məxsusdur

Biz günahlarımızdan ötrü bağışlanmamızı istəməliyik. Bağışlanma istəyinin böyük faydası bizi öz barəmizdə qafilikdən çıxarmasıdır. Biz bəzən özümüz haqda səhv düşünürük. Bağışlanma fikrinə düşdükdə isə günahlar, səhvlər, dikbaşlıqlar, nəfsə etdiyimiz itaətlər, aşdığımız hədlər, özümüzə və digərlərinə etdiyimiz zülmlər gözümüz önündə canlanır və nə etdiyimizi xatırlayırıq. O zaman qürur və təkəbbür etməz, özümüzdən xəbərsiz olmarıq. Bağışlanma istəyinin ilk faydası budur. Sonra da Allah-Taala söz verib ki, həqiqətən dua edib Allah-Taaladan bağışlanmasını diləyən və günaha peşman olan insanı bağışlasın: Allahın tövbələri qəbul edən və mərhəmətli olduğunu bilərdilər(١). Allah-Taala tövbəni qəbul edəndir. Bu bağışlanmaq istəyi Allaha sarı qayıdış, səhvlərə və günahlara arxa çevirməkdir. Və əgər bağışlanmaq istəyi .həqiqi olsa, Allah bunu qəbul edər

Yadınızdan çıxarmayın ki, insan dili ilə dəfələrlə Allah məni bağışla - desə, amma fikri oyan-buyanda olsa, bunun faydası yoxdur. Bu, bağışlanma diləmək deyil. Bağışlanma diləmək bir duadır, istəkdir. İnsan həqiqətən Allahdan əfv diləməlidir: İlahi, mən bu günahı etmişəm, mənə rəhm et, günahımı bağışla. Günahların hər birinə qarşı belə bağışlanma diləmək, şübhəsiz, bağışlanmaya səbəb olar. Allah-Taala bu qapını açıq .qoymuşdur

Əlbəttə, müqəddəs İslam dinində digərlərinin yanında günahı etiraf etmək qadağandır. Bəzi dinlərdə ibadətgahlara gedir, ruhani və keşişin yanında oturub günahı etiraf edirlər. İslamda belə bir şey yoxdur və bu qadağan olunmuşdur. Digərlərinin qarşısında özünü rüsvay etmək, öz sirlərini və günahlarını açmaq yasaqdır. Bunun faydası da yoxdur. Həmin mövhumatçı və təhrif olunmuş dinlərdə deyirlər ki, keşiş günahı bağışlayır. Xeyr! İslamda günahı bağışlayan yalnız Allahdır. Hətta peyğəmbər də günahı bağışlaya bilməz. Şərafətli ayədə buyurur: Onlar özlərinə zülm etdikləri zaman dərhal sənin yanına gəlib Allahdan bağışlanmaq diləsəydilər və

Peyğəmbər də onlar üçün əfv istəsəydi, əlbəttə, Allahın tövbələri qəbul edən və mərhəmətli olduğunu bilərdilər(٢). Yəni orada Peyğəmbər (s) onlar üçün bağışlanma diləyir, özü isə günahı bağışlaya bilməz. Günahı yalnız Allah-Taala bağışlamalıdır. Bağışlanma diləmək



---

١- [٢٢٨] Nisa/٦٤.

٢- [٢٢٩] Yenə orada.

həqiqətən mühüm məsələdir. Bu ayda bağışlanmanızı diləməyi yaddan çıxarmayın. Xüsusən axşam və gecələrdə ramazan ayının dualarını mənalarına fikir verərək .oxuyun

Allaha şükür olsun ki, bizim cəmiyyətimiz mənəviyyatlı bir cəmiyyətdir. Bizim xalqımız arasında dua, ibadət, təvəssül və münacat geniş yayılmışdır, xalq bunları sevir. Bizim gənclərimizin pak və işıqlı qəlbləri Allah zikrinə meyllidir. Bunların hamısı mühüm məsələlərdir. Ramazan ayı da bizim ixtiyarımızda qoyulan bir ilahi fürsətdir. Bu mübarək aydan istifadə edin. Çox böyük olan bu fürsətdən istifadə edib qəlbləri Allaha yaxınlaşdırın, Allahla tanış edin. Bağışlanma diləməklə qəlbləri və canları paklayın, istəklərinizi Allah-Taalaya deyin. Bizim xalqımızın Allah-Taala ilə mənəvi əlaqəsi böyük işlər görmüşdür. Ramazan ayı da bunun üçün möhtəşəm bir fürsətdir. Bu fürsətdən .istifadə etmək lazımdır

Allah-Taala bu ramazan ayında vücudumuzun mələk cəhətini heyvani cəhətə qalib etmək üçün bizim hamımıza kömək etsin! Bizim bir mələk cəhətimiz var, bir də maddi və heyvani cəhətimiz. Nəfsin istəkləri maddi cəhəti mələk cəhətinə hakim edir. İnşallah bu ramazan ayında o ruhaniliyi və mənəviyyatı maddi cəhətə hakim edək, onu bir ehtiyat kimi saxlayaq və ramazan ayından il boyu bizə köməkçi olacaq bir təlim .dövrü kimi istifadə edək

.Tehranın cümə namazı xütbələrindən: ۲۰۰۷

səh:۲۱۱

## Allah zikrinin əhəmiyyəti və onun hədsiz olması

Hikmətli Allah kitabında buyurur: Ey iman gətirənlər! Allahı çox yada salın! Onu səhər-axşam təqdis edib şəninə təriflər deyin! Sizi zülmətdən nura çıxarmaq üçün mələkləri ilə birlikdə sizə salam və salavat göndərən Odur. Allah möminlərə rəhm edəndir! (Möminlərin) Ona qovuşacaqları gün (bir-birinə) xeyir-duaları (və ya Allahın onlara verəcəyi xeyir-dua) "salam"dır! (Allah) onlar üçün çox qiymətli (tükənməz) mükafat .(hazırlamışdır(١)

Ölkə idarəçiliyində ağır məsuliyyətləri üzərinə götürmüş əsas vəzifəli şəxslərin təxminən hamısı bu böyük və əhəmiyyətli məclisdə iştirak edirlər. Bu bizim üçün çox mühüm bir görüşdür. Möhtərəm prezident siyasi məsələlərə və ölkənin müxtəlif işlərinə dair məruzə ilə çıxış etdi. Bu haqda həmişə söz var, çoxdur və lazımdır. Lakin mən düşündüm ki, bu fürsətdən bir qədər bizim siyasi fəaliyyət və qərarlarımıza giriş sayılan bir məsələ üçün istifadə edək. Bu məsələ bizim ürək sözümüz, ixlaslı iman sözümüzdür. Bu, hərəkətin bütün mərhələlərində cisimdə olan bir can, zülmətdə olan bir nur və cansız cisimlərə həyat kimi rol oynaya bilər. Ona görə bu ayələri seçdim ki, bunlara birlikdə bir qədər nəzər salaq. Mənim özüm nə qədər baxıramsa, bu şərafətli Allahı çox yada salın! Onu səhər-axşam təqdis edib şəninə təriflər deyin!(٢) ayəsini təkrarlamağa, onun məzmunu haqda düşünməyə və ona əməl etməyə ehtiyacımın olduğunu görürəm. Sizi özümlə müqayisə etdim və düşündüm ki, bizim hamımız buna ehtiyaclıyıq. Bu ayələr iman cəmiyyətinin formalaşmasından və bu cəmiyyətin böyük sınaqları arxada qoymasından sonraya aiddir. Bunlar Əhzab surəsinin ayələridir və hicrətin altıncı ilindən sonra nazil olmuşdur; yəni Bədr, Ühüd və digər çoxlu döyüşlərdən və nəhayət Əhzab döyüşündən sonra. Quran belə bir şəraitdə müsəlmanlara müraciət edir ki, Allahı çox yad edin. Zikr - xatırlamaq deməkdir. Xatırlamaq və yada salmaq unutmağın və qafilliyin - müxtəlif hadisə və məsələlərə qapılıb əsas işi unutmağın əksidir. Bu, biz Adəm övladlarının böyük problemidir. Allah-Taala buna mane olmaq istəyir. Bu xatırlamaq da yalnız xatırlayıb yada salmaq deyil, .bizdən çoxlu xatırlamağı istəmişlər

Mən burada bir hədis qeyd etmişəm. İmam Sadiq (ə) buyurur ki, bütün vaciblərin və ilahi hökmlərin həddi və ölçüsü var, o həddə və sərhədə çatdıqda bitir, vəzifə

tamamlanır, amma zikrdən savayı. Zikrin həddi və sonu yoxdur. Belə deyil ki, zikr və xatırlama hansısa ölçüyə çatdıqda deyək daha bəsdir, daha lazım deyil. Sonra həzrətin özü izah edir və buyurur: Kim vacibləri yerinə



---

۱- [۲۳۰] Əhzab/۴۱-۴۴.

۲- [۲۳۱] Əhzab/۴۱-۴۲.

yetirsə, onları öz (son) həddinə çatdırmışdır. Misal üçün, ramazan ayı bitdikdə siz bu vacibi öz sərhədinə çatdırmısınız, sizə daha bir şey vacid deyil. Həcc edən şəxs həccin son əməllərinə çatdıqda onu sona çatdırmışdır: “zikrdən savayı”. Zikr digər vaciblər kimi deyil. Hədisdə digər vaciblərin adını çəkməyib. Zəkat da belədir. Zəkatı verdikdən sonra vacib olmur, təyin edilən miqdarda vacibdir. Xums da belədir, qohumlara baş çəkmək də belədir, digər vaciblər də bu qəbildəndir, lakin zikr belə deyil: “Zikr belə deyil. Allah-Taala onun azına razı olmamış və onun üçün son hədd təyin etməmişdir”.(١) Allah onun üçün elə bir hədd qoymayıb ki, o həddə çatdıqda daha bitsin. Sonra həzrət bu ayəni oxudu: “Ey iman gətirənlər! Allahı çox zikr edin!”(٢) Zikrin .əhəmiyyəti budur

Ayənin ardınca buyurur: Mələkləri ilə birlikdə sizə salam və salavat göndərən Odur(٣). Mərhum Əllamə Təbatəbai əl-Mizanda yazır ki, bu şərafətli ayə Allahı çox yad edin ayəsinə səbəb kimi göstərilir. Yəni bu çoxlu zikr sizdən ona görə istənilmişdir ki, sizə salam və salavat göndərən Allahı yad edəsiniz. Yalnız Allah-Taala yox, ilahi mələklər də siz möminlərə salam edirlər. Allahın salamı onun rəhməti, mələklərin salamı isə möminlər üçün bağışlanma diləyidir: Möminlərin bağışlanmasını diləyərlər(۴). Bu, .Quran ayələrində vardır

Nə üçün Haqqın müqəddəs zatı və ilahi mələklər qeyb aləmindən, yüksək səmadan sizin üçün rəhmət və salam göndərir, bağışlanma diləyirlər? Sizi zülmətdən nura çıxarmaq üçün(۵). Onlar sizi zülmətlərdən xilas edib nura çıxarmaq istəyirlər. Bu zülmətlər və nur söhbəti də geniş söhbətdir. Bizim düşüncələrimizdə, qəlbimizdə, .əxlaqımızda zülmətlər var və nur bunların qarşısındadır

Əməl zülmətli də ola bilər, nurlu da. İnsanın zehni, düşüncəsi və etiqadları işıqlı da ola bilər, qaranlıq da. İnsanın əxlaq və xarakterləri qaranlıq da ola bilər, işıqlı da. Bir xalqın .ictimai hərəkəti zülmətlərə və qaranlıqlara doğru da gedə bilər, nura doğru da

Əgər bir xalqa, bir ölkəyə, bir iqtidara, bir fərdə ehtiraslar hakim olsa, heyvaniyyətdən irəli gələn kobudluq hakim olsa, tamahkarlıq və dünyagirlik hakim olsa, bu, qaranlıqdır; hərəkət qaranlıqdır, istiqamət qaranlıqdır, məqsəd qaranlıqdır. Əgər mənəviyyat ,hakim olsa, din hakim olsa, insanlıq hakim olsa

---

۱- [۲۳۲] (əl-Kafi, c. ۲, səh. ۴۹۸. Hədis İmam Sadiqdəndir (ə).

۲- [۲۳۳] Əhzab/۴۱.

۳- [۲۳۴] Əhzab/۴۳.

۴- [۲۳۵] Qafir/۷.

۵- [۲۳۶] Əhzab/۴۳.

əxlaqi dəyərlər hakim olsa, xeyirxahlıq hakim olsa, sədaqət və doğruluq hakim olsa, bu olur nurluluq. İslam və Quran bizi buna dəvət edir. Allah-Taala və onun mələkləri bizi həmin zülmətlərdən xilas edib bu nur vadisinə çəkmək istəyirlər. Allahı yad edin. Onun .səbəbi və dəlili də budur

## Allahı yad etməyin mərhələləri

Allah zikrinin mərhələləri var. Biz insanlar hamımız bir həddə və bir mərhələdə deyilik. Bizim dərəcələrimiz müxtəlifdir. Bəziləri ruhi baxımdan yüksək dərəcədədirlər; misal üçün, övliyalar, peyğəmbərlər, saleh insanlar, mənəviyyat və irfan adamları. Bəziləri də o səviyyələrə malik olmayan mənim kimi və bizim kimilərdir. O səviyyələrdə nələrin olduğundan bizim bəzilərimizin xəbərimiz də yoxdur. Bizim hamımız üçün zikr var - həm onlar üçün var, həm bizim üçün. Zikr onlar üçün Əmirəlmömininin (ə) hədisində göstəriləndir: “Zikr məşuqla həmsöhbət olmaqdır”.(١) Bu, övliyalar üçündür. Onlar üçün zikrin ləzzəti həmsöhbət olmağın ləzzəti kimidir. Əmirəlmöminin (ə) başqa bir hədisdə .buyurur: “Zikr sevənlərin ləzzətidir”.(٢) Zikr aşiq və sevənlər üçün ləzzətlidir

Əgər günün bəzi hallarında, xüsusən də bu gündüz və gecələrdə sizin həyatınızda belə bir nur və qığılcım parlasa, xoş sizin halınıza. Bəzən bunun baş verməsi mümkündür. Əlbəttə, onlarınkı daimidir: "Daim namaz halında olanların xoş halına!" Bu onlara məxsusdur. Lakin aşağı səviyyələrdə olanlar üçün də bəzən qığılcım yarana bilər. Bunların qədrini bilmək lazımdır. Bu, zikrin sevənlərə və qəlb adamlarına məxsus mərhələsidir. Lakin o mərhələdə olmayan bizim üçün də zikrin böyük faydaları vardır. İndi mən burada qeyd etdiklərimi deyirəm: "Materialist duyğuları və azdırıcı həvəsləri ."dəf etmək

Zikr bu həvəslərin hücumu qarşısında bizi və qəlbimizi qoruyan bir müdafiəçi kimidir. Ürək çox zəifdir. Bizim ürəyimizin və ruhumuzun zərərə uğraması çox mümkündür. Bəzi məsələlər qarşısında təsirlənirik, ürək müxtəlif cazibələrə yönəlir. Allahın yeri və insan vücudunda ən uca məqama malik olan ürəyin - yəni insan varlığının həqiqətinin sağlam və təmiz qalmasının istəyiriksə, müdafiə lazımdır. Bu müdafiə zikrdir. Zikr ürəyin, müxtəlif həvəslərin amansız hücumlarına məruz qalmasının qarşısını alır. Zikr ürəyi azdırıcı fəsad və cazibələrə qərq olmaqdan saxlayır. Mən bu barədə çox mənalı

bir hədis gördüm. Buyurur: “Qafillər arasında zikr edən, qaçanlar arasında



---

.Qürər əl-hikəm, səh. ۱۸۹ [۲۳۷] -۱

.Yenə orada [۲۳۸] -۲

vuruşan kimidir”(١) Döyüş meydanında müdafiə edən, müqavimət göstərən, düşmənin hücumunun qarşısını almaq üçün bütün imkanlarından istifadə edən bir döyüşçünü görürsünüz. Lakin başqa bir əsgərin qaçması, dözümünü əldən verməsi və düşmən qarşısından qaçması da mümkündür. Buyurur ki, qafillər arasında zikr edən, qaçanlar arasında müqavimət göstərən əsgər kimidir. Baxın, bu bənzətmə həmin cəhətə görədir. Çünki o, əcnəbi hücumçu qarşısında müdafiə edir və müqavimət göstərir. Sizin zikriniz də müqavimət göstərir? sərhədi müdafiə edir, ürək sərhədinizi qoruyur. Məhz buna görə Quranın cihad ayələrindən olan bir şərafətli ayəsində belə buyurulur: Bir (kafir) dəstə ilə üz-üzə gəldikdə möhkəm olun və Allahı çox yada salın ki, nicat tapasınız(٢). Cihad zamanı düşmənin hücumu qarşısında qaldıqda müqavimət göstərin və Allahı çox yad edin. Allahı yad etmək orada da işə yarayır və bu sizin uğur və qurtuluşunuz üçün vasitədir. Nə üçün? Çünki bu zikr ürəyi möhkəmlədir. Ürək möhkəmlənəndə addım da möhkəmlənir. Döyüşdə belədir. Döyüş zamanı zəifləyəndə ayaqlarımızdan öncə qəlbimiz qaçmağa başlayır. Bizim ayaqlarımızı qaçmağa vadar .edən qəlbimizdir. Əgər qəlbimiz möhkəm dayansa, ayaqlarımız da dayanar

Bütün döyüşlərdə - həm hərbi döyüşdə, həm siyasi döyüşdə, həm iqtisadi döyüşdə, həm informasiya döyüşündə Allahı yada salın. Bu, sizin uğur qazanmanıza səbəb .olacaq. Allahın zikri möhkəmliyin təminatçısıdır

Allahı yada salmaq bizim doğru yolla irəliləyə bilməyimizə bais olur. Biz mömin kimi, müsəlman kimi, mütərəqqi bir məktəbin ardıcılı kimi, gələcəkdə İslam sivilizasiyasının çiçəklənəcəyindən xəbər verən bu bünövrəni qurmaqda maraqlı şəxslər kimi özümüz üçün məqsəd təsvir etmişik və həmin məqsədə sarı hərəkət etməyimiz üçün Allahı .yada salmağa ehtiyacımız var

Bizim Allahı yada salmağa digərlərindən çox ehtiyacımız var. Mənim bu məclisi qənimət saymağımın səbəbi budur ki, sizin adi insanlarla böyük fərqiniz var. Siz bu quruluşun bir sahəsini idarə edirsiniz və onu qorumaqda təsiriniz böyükdür. Əgər siz bu sahəni yaxşı saxlasanız, yaxud zəif saxlasanız və yaxud bütünlüklə əldən versəniz, vəziyyət çox fərqlənəcək. Deməli, sizin Allahı yada salmağa digərlərindən çox ehtiyacınız var. Allahın xatirəsi bizim qəlbimizə hakim olsa, şübhəsiz ki, rəftarımıza da təsir edəcək, üzərimizə düşən vəzifələri yerinə yetirməyə, bizim acı sonuclara və ilahi

qəzəbə səbəb olan haram və günah işlərdən çəkinməmizə də təsir edəcək və .bunlardan uzaqlaşmağımıza yardımçı olacaq



---

۱- [۲۳۹] (s .(Vəsail əş-şiə, c. ۷, səh. ۱۶۵. Hədis həzrət Peyğəmbərdəndir

۲- [۲۴۰] Ənfal/۴۵.

### Möminlərin olduqca mühüm və çətin olan üç vəzifəsi

Bəs zikr nədir? Bu barədə iki hədis var. Mən daha çox ikinci hədisi nəzərdə tutmuşam, lakin hər ikisini oxuyuram. Birinci hədis İmam Bariqdəndir (ə). Həzrət Baqir (ə) buyurur .ki, möminlərin çox mühüm və çətin vəzifələrindən olan üç məsələ var

Biri mömin insanın digərlərinə qarşı insaflı olması, yəni öz xeyrindən ötrü haqqı tapdamaq, yaxud haqdan ötrü özünü tapdamaq seçimi qarşısında qaldıqda ikincini seçməsidir. Haqq qarşı tərəfdə olduqda və sizin haqsız olduğunuzda insafla haqqı ona verin. Özünüzün kiçilmənizə və əzilmənizə səbəb olsa da, bu işi görün. Bu çətin, amma əhəmiyyətli işdir. İmam Baqir (ə) buyurur ki, bu ən mühüm işlərdəndir. Düzdür, .çətindir, amma heç bir böyük və yaxşı iş çətinlik çəkmədən görülmür

İkincisi mömin qardaşa kömək etməkdir. İnsan mömin qardaşına bütün işlərdə kömək etməyi öz vəzifəsi bilməlidir: düşüncə köməyi, maliyyə köməyi, fiziki kömək, etibar .köməyi

.Üçüncüsü hər bir halda Allah-Taalanı yada salmaqdır. Zikr budur

Həzrət Baqir (ə) həmin hədisdə hər bil halda Allahı yad etmək məsələsini izah etmişdir: günaha sarı getdikdə Allahın zikri ona mane olur. Zikr odur ki, Allahı yad edib, günah etməsin - doğru olmayanı danışmağı, yalan deməyi, qeybət etməyi, haqqı gizlətməyi, insafsızlıq etməyi, təhqir etməyi, xalqın malını, beytülmalı, zəiflərin malını mənimsəməyi, yaxud onların barəsində diqqətsizlik göstərməyi və digər müxtəlif günahları etməsin. Bütün bunlarda insan Allaha diqqət yetirsin. Allah zikri insanın bu .günahlara tərəf getməsinə mane olur

Sonra həzrət buyurur ki, bu, Quranın bu ayəsinin təfsiridir: “Allahdan qorxanlara şeytandan bir vəsvəsə toxunduğu zaman onlar (Allahı) xatırlayıb düşünərlər”.(١) Şeytan bunlara yaxınlaşanda, bunlara toxunanda, hələ tam canlarına düşməyəndə tez xatırlayarlar: “və dərhal görən olarlar”. Bu zikr onların gözlərinin açılmasına bais olur. .Hər bir halda Allahı yad etməyin mənası budur

### Hər bir halda və hər bir yerdə Allahı yada salmaq

Mənim əsas məqsədim olan sonrakı hədisin əvvəlində təxminən oxuduğum hədisə oxşar ibarələrlə həmin üç məsələ qeyd olunur. O hədisdə “hər bir halda Allahı yad etmək” vardı, burada İmam Sadiqin (ə) hədisində isə “hər



---

۱- [۲۴۱] Əraf/۲۰۱.

bir yerdə Allahı yad etmək" kimi göstərilmişdir. Lakin mənim nəzərdə tutduğum budur: Deyir hər bir halda Allahı zikr etmək dedikdə məqsədim bu deyil ki, "subhanəllah vəl-həmdu lillah və la ilahə illəllah vallahu əkbər" deyəsiniz. Bu, söz zikridir: "Baxmayaraq ki, bu da ondandır". Yəni bu da zikrdir, bu da yaxşıdır, bu da dəyərlidir, lakin mənim məqsədim təkcə bu deyil. Məqsəd budur ki, Allahın itaətinə, yaxud günaha sarı getdikdə Allahı yad et. Belə yad etmək, Allahın belə zikri nəzərdə tutulur. Düzdür, bizim rəvayətlərimizdə, bu dualarda, bu müxtəlif zikrlərdə, həzrət Zəhra (ə) təsbehində və digər zikrlərdə göstərilənlərin hamısı zikrin vasitələri, kapsullarıdır. İnsan mənalarına və həqiqətlərinə diqqət yetirməklə bunları dilinə gətirməli, diqqət halı əldə etməlidir. .Əlbəttə, bunlar çox dəyərlidir

Bu məsələlər haqda söz bitmir. Bizim üçün çox faydalı olan bu mənəvi məsələlər haqda saatlarla danışsaq da, həqiqətən çox deyil. Doğrusu budur ki, biz geridəyik. Biz İslam tərbiyəsi sahəsində İslam quruluşunun tələb etdiyi həddə inkişaf etməmişik. Bəziləri deyirlər ki, biz məsələn, quruculuq, texnologiya və digər hansısa sahədə bundan çox inkişaf edə bilərdik, amma etməmişik. Lakin bizim bütün sahələrdən çox inkişaf etməli olduğumuz, amma etmədiyimiz sahə mənəviyyat, özünüislah və əxlaq .sahəsidir. Biz bu sahələrdə həqiqətən geridəyik

Bizə layiq bir nümunə üçün müqəddəs müdafiə dövrünə baxmanız lazımdır. Görün cəbhəyə yollanan gənclərin, övladlarını bu şəkildə döyüşə yola salan ata-anaların, cəbhəyə elə həvəslə dayaq olan ailələrin hansı halı və hansı hissi vardı. Onlar yaxşı nümunələrdir. Ən üstün nümunələr olduqlarını demirik, amma çox yaxşı nümunələrdir. Biz həmin formada, həmin templə irəliləməli idik, amma irəliləmədik. Bəzən onları da unuduruq. Bəzilərimiz unudur, bəzilərimiz də təəssüf ki, inkar edir. Daha pisi budur ki, bəzilərimiz o halları pisləyirik. Bəzi fikirlərdə buna rast gəlmək mümkündür. Bəzən ətrafda biçimsiz və yaramaz sözlər danışılır, müqəddəs müdafiə zamanı bizim .döyüşçülərimizin və gənclərimizin gözəl və müqəddəs halları pislənir

Bizim əksərən o xırdalıqlardan xəbərimiz yoxdur. Mənim də, müharibədə iştirak edən komandirlərin də orada baş verənlərin hamısından xəbərimiz yoxdur. Orada daxili inqilab, dəyişiklik, uca xüsusiyyətlərə və insani fəzilətlərə sarı inkişaf o qədər çox olub .ki, onları saymaq həqiqətən imkansızdır

Mən bu yaxınlarda bizim hücumlarımızdan biri haqda yazılmış və həmin bir neçə günü şərh edən bir kitab oxudum. Bir diviziyanın, bir briqadanın, bir batalyonun, yaxud hətta bir bölüyün də yox, bir tağımın sağ qalanlarının dili ilə deyilənlərdir. Bu tağımın bəzi üzvləri sağ qalmış və məlumat vermişlər. Kitabı

çox gözəl üslubda qələmə almış bu yazıçı və tədqiqatçı – belə işlər həqiqətən çox dəyərlidir – gedib məlumatların hər birini o şəxslərdən almış, ۶۰۰-۷۰۰ səhifəlik bir kitab yazmışdır. Biz yalnız eşidirik ki, Fav əməliyyatı olmuşdur, amma bu əməliyyatın mühüm işlərindən çoxunu bilmirik: Ərvənddən keçdilər, Favı aldılar, duz zavodunu tutdular, filan işi gördülər. Biz ümumi məlumatları bilirik, bu əməliyyatın hər bir .addımında baş verənləri isə bilmirik

Bizim önümüzdə çox ustalıqla və gözəlliklə böyük bir miniatür əsər qoymuşlar. Biz uzaqdan baxır və bəh-bəh deyirik, amma yaxına gedib bu miniatürün hər bir tərəfində nə qədər incəsənət üslubunun işləndiyinə baxmırıq. Bu işi bəzi adamlar görürlər, görmüşlər. Mənim gördüyüm bu nümunə həmin işlərdən biridir. Ümidvarıq ki, bu işlər .davam etsin

O, əxlaqi inkişaf idi. İnsan İslamın, Allahın, qeybə etiqadın və imanın insana bəxş etdiyi əxlaqi dəyərlərin onun həyatına necə təsir göstərdiyini orada anlayır, görür. Bunu inkişaf etdirmək lazımdır. Heyf ki, lazımınca inkişaf etməmişdir. Biz özümüzlə .bunlardan olduqca çox məşğul olmalıyıq

.Quruluşun məsul şəxsləri ilə görüşdə çıxışından: ۲۰۰۷

səh:۲۱۸

## Fitr bayramı – orucun və ibadətin şükür bayramı

Ramazan ayı bayramı əslində şükür bayramıdır; biraylıq ilahi ziyafət dövrünü keçirmək səadətinin, orucun, ibadət, zikr, təzim və təvəssül səadətinin şükrü. Mömin .insan bu şükür üçün həqiqətən bayram etməlidir

Məndə olan dəqiq məlumatlara görə əziz xalqımız bu aydan çox səmərəli istifadə etdi. Bizim xalqımız mübarək ramazan ayından həqiqətən bəhrələndi. Bütün təbəqələr, bütün ictimai qruplar, üsulları, təmayülləri, adətləri, rəftarları, geyimləri və bəzi xarakterləri bir-birindən fərqli olan bütün insanlar bəhrələndilər. Bu böyük nemətə - müsəlman xalqın dinə, dini və İslami həqiqətlərə iman və rəğbət nemətinə görə çox şükür etmək lazımdır. Bu, İran xalqının üstün cəhətlərindən biridir. Kütləvi informasiya vasitələrində - radioda, televiziyada və qəzetlərdə xalqın dindarlığına dair göstərilənlər, heç şübhəsiz, əsl həqiqətin yalnız mində biridir. Bu xalq, bu gənclər, qız və oğlanlar qədr gecələrində və bu ayın digər gecə və gündüzlərində bu böyük ölkənin hər yerində, bütün bu şəhər və kəndlərdə olan on minlərlə məscid, hüseyniyyə və müxtəlif mərkəzlərə toplaşıb ibadət etdilər, Allah-Taaladan dilək istədilər, Allahla .danışdılar, münacat etdilər. Bu, çox dəyərli məsələdir

## Ramazan ayının dərsləri

Ramazan ayının bizim üçün dərsləri vardır. Bunlar insanın müəllimdən, yaxud kitabdan öyrəndiyi dərslərdən deyil, əməli bir təcrübədə və böyük bir kollektiv işdə öyrəndiyi dərslərdəndir. Birincisi Allahla rabitə və Müqəddəs Rəblə səmimi əlaqəni qorumaq dərsidir. Bu dərsin ləzzətini dadıb Allah-Taala ilə necə asanlıqla ünsiyyət qurmağın mümkünlüyünü gördünüz: Sənə doğru gələnin yolu yaxındır və insanların əməlləri onları Səndən ayırır(١). Allaha sarı yol yaxındır, bunu qədr gecəsində ibadət, ziyarət və dua zamanı gördünüz, raz-niyaz etdiniz, öz qəlbinizi Allah-Taalaya hədiyyə etdiniz, Allaha sevginizi artırdınız. Bu böyük ləzzəti özünüz üçün qoruyun, bu rabitənin qırılmasına imkan verməyin. Bu, birinci dərsdir. Başqa bir dərs isə xalqın müxtəlif cinahlara mənsub olan bütün fərdlərinin din və tövhid ətrafında birləşməsidir. Milli birlikdən danışdıqda, İran xalqının bir olduğunu dedikdə yadda saxlamaq lazımdır ki, bu birlik köksüz deyil, yalnız bir tövsiyəyə və tapşırığa görə yaranmır. Bu birliyin dayağı

sözügedən dini inancdır. Bizim hamımızı bir mərkəzə sarı çəkən amil din və etiqaddır. Həmin mərkəz Allah-Taalanın müqəddəs zatına diqqətdir. Bu, bizim milli birliyimizin amilidir; ürəkləri bir-birinə yaxınlaşdırır, yumşaldır. Camaat namazında, cümə namazında, əhya



---

.İqbal əl-əmal, c. ۱, səh: ۶۸ [۲۴۲] -۱

mərasimində, Quranı başa qoymaqda, dua və ibadətdə sizin yanınızda oturan kim olursa-olsun, hansı cinahdan, hansı ictimai qrupdan və hansı görkəmdə olursa-olsun, Pərvərdigarın müqəddəs zatı yanında sizin qardaşınız, yoldaşınız və sirdaşınızdır. Bu .səmimi rabitəni qoruyun. Bu da başqa bir dərsdir

Başqa bir dərs özünü çətinliyə salmaq və digərlərinə maddi yardım etməkdir. Bu aclığa və susuzluğa dözmək, sübh azanından şam azanına qədər oruc tutmaq özünü çətinliyə salmaqdır. Bizim xalqımızın çoxu oruc tutmaqla çətinliyə dözdülər və digərlərinə müxtəlif maddi yardımlar etdilər. Ramazan ayının on beşində İmam Həsən Müctəbanın (ə) doğum gecəsində bir çörəkçi dükanının qapısı üzərinə Bu gecə İmam Həsənə (ə) görə çörək pulsuzdur sözlərinin yazılması nə qədər gözəldir! Namsız-nişansız iftarlar, məscidlərdə verilən iftarlara olunan maliyyə yardımları bizim xalqımızın bu təşəbbüskar işlərinin nəticəsi idi. Bu başqa bir dərsdir, başqa bir təlimdir. Özümüzü çətinliyə salıb digərlərinə maddi yardım edək. Mən bu məqam üzərində bir qədər dayanmaq istəyirəm, çünki ölkəmizin və cəmiyyətimizin mühüm məsələlərindən .biri budur

Biz israfçı xalqıq. Biz israf edirik; suda israf, çörəkdə israf, müxtəlif məişət avadanlıqlarında, ləpəli meyvələrdə israf, benzində israf. Neft istehsal edən bir ölkə neftdən hazırlanan benzini idxal edir. Bu təəccüblü deyil?! Hər il milyardlala pul verib benzin idxal edirik, başqa şeylər idxal edirik. Bizim cəmiyyətimizin və xalqımızın bir hissəsinin ürəyi töküb-dağıtmaq istəyir, ona görə. Bu düzgündür? Biz xalq buna milli bir eyib kimi baxmalıyıq. İsraf pisdir, hətta Allah yolunda maddi yardımda da bunu deyirlər. Allah-Taala Quranda Peyğəmbərinə (s) buyurur: Nə əldən çox bərk ol, nə də əlini tamamilə açıb israfçılıq et(١). Allah üçün maddi yardım edərkən də belə et. İfrat və təfrit etməyin, orta yol tutun. Biz bunu milli mədəniyyətə çevirməliyik. Quran buyurur: Onlar (mallarını) xərclədikdə nə israfçılıq, nə də xəsislik edərlər(٢). İslam özünü çətinliyə salıb sıxıntı içərisində yaşamağı da tövsiyə etmir. İslam demir ki, insanlar riyazət və zahidliklə yaşamalıdırlar. Xeyr! Adi şəkildə yaşasınlar, orta həddə yaşasınlar. Bəzi xarici boşboğazlar, xarici dövlətlər bir neçə ildir daim və hər saat bizim xalqımızı hədələyirlər ki, embarqo tətbiq edəcəyik. Dəfələrlə də tətbiq etmişlər. Bu ondan ötrüdür ki, ümidləri bizim mənfi xüsusiyyətlərimizə bağlanmışdır. Biz əgər israfçı və

bədxərc olsaq, embarqo çətin ola bilər, öz işini hesablayan, mədaxil və məxaricini hesablayan, öz məsləhətini düşünən xalq isə israf etmir. Qoy embarqo tətbiq etsinlər. Belə



---

.İsra/۲۹ [۲۴۳] -۱

.Furqan/۶۷ [۲۴۴] -۲

bir xalq embarqodan ziyan görməz. Ramazan ayından bunu öyrənək və inşallah ona .əməl edək

.Fitr bayramı namazının xütbələrindən: ٢٠٠٧

## Fitr bayramı – fitrətə qayıdış və müsəlmanların birliyinin rəmzi

Fitr bayramını bir cəhətdən İslam ümmətinin birliyi bayramı hesab etmək olar. Səbəb budur ki, ramazan ayında qəlblər işıqlanmış, yumşalmış, insanların daxilində olan şeytani ixtilaf amilləri zəifləmişdir. Fitr bayramı da əslində fitrətə qayıdışdır. İnsanın fitrəti Allah-Taalaya, tövhidə, vahid və müqəddəs mərkəzə meyllidir. İnsanların bütün .hiss və duyğuları orada birləşə və bir-birinin yanında dura bilər

Fitr bayramı namazı da İslam dünyasının hər bir yerində həmin vəhdətin rəmzidir. Buna görə biz bu namazın qünutunda oxuyuruq: Sən bu günü müsəlmanlara bayram və Məhəmmədə (ə) ehtiyat, şərəf, hörmət və üstünlük etmisən(١). Bu bayram əziz Peyğəmbərin (s) müqəddəs vücudu üçün bir ehtiyatdır, şərəf və hörmətdir, o müqəddəs insanın məqamının ucalması amilidir. Bu nə zaman baş verə bilər? Onun müsəlmanların bir-biri ilə barışdığı bayram olduğunda. Bu söz həm xalqımıza aiddir, həm böyük İslam ümmətinə. Bizim böyük xalqımız inqilabın qələbəsindən bu günədək .ötən uzun illərdə söz birliyinin şərəf və qüdrət amili olduğunu təcrübə etmişdir

.Quruluşun məsul şəxsləri ilə görüşdə çıxışından: ٢٠٠٧

səh:٢٢٢

---

.İqbal əl-əmal, c. ١, səh: ٢٨٩ [٢۴۵] -١

Yalnız Allah kəlamını dinləməkdən ötrü məclislər keçirək. Məclis çoxdur, lakin Quranı ürəkdən sevən xalqımızın onu yalnız dinləməsi üçün təşkil olunan məclislərə də ehtiyac var. Bizim gənclərimizin, öyrəncilərimizin Quran qiraətini, təcvidini, yaxud müxtəlif qiraətləri öyrənmələri üçün keçirilən məclislərdən əlavə, Quranı dinləmək üçün də bir məclis təşkil olunsun, qiraətçi oturub oxusun, biz də bir minbərə, bir rövzəyə qulaq asdığımız kimi ona qulaq asaq, Quranı dinləyək və ondan bəhrələnək. Bizim sözlərimizin hamısı – əsaslandırmalar, dəlillər, xütbələr, söhbətlər, şeirlər və nəsrlər düzgün olduqları təqdirdə ikinci dərəcəli məsələlərdir. Əsas Allahın kəlamıdır, ilahi vəhydir. Bunlar qeybdən Peyğəmbərin (s) müqəddəs qəlbinə nazil olan və onun .bizim ixtiyarımızda qoyduğu pak və müqəddəs sözlərdir

Allaha şükür edirik ki, bizim Quranımız toxunulmaz qalmış və bu günə qədər təhrif olunmamışdır. Biz bundan istifadə etməliyik. Gənclər əgər ərəb dilini bilmədiklərinə görə Quranın mənasını anlamırlarsa, bu gün Allahın lütfü ilə sayı çox olan tərcüməli Quranlardan götürsünlər; qiraətçi Quranı oxuduğu zaman onlar da ayələrin tərcüməsinə baxıb başa düşsünlər və düşünsünlər. Allahın sözünü birbaşa Onun Özündən eşidin, kəlamını ürəklərinizə tanış edin, ürəklərdə ünsiyyət yaradın. Bu sahədə bizim çatışmazlıqlarımız var. Məktəblərdə Quran qiraəti gənclərə elə öyrədilməlidir ki, uşaqlıq çağında öyrəndikləri bu ayələri ömürlərinin sonuna qədər xatırlasınlar, bu ayələr hər zaman bir tablo kimi gözləri önündə qalsın və müxtəlif .zamanlarda onlardan istifadə etsinlər

.Hərbi akademiyaların məzunlarının müştərək tədbirində çıxışdan: ٢٠٠٨

səh:٢٢٣

Dözümlü olmaqla və namaz qılmaqla (Allahdan) kömək diləyin(١) cümləsi Bəqərə surəsində iki dəfə təkrar olunmuşdur. Biri kitab əhlinə müraciətdir: Dözümlü olmaqla və namaz qılmaqla (Allahdan) kömək diləyin! Bu, ağır iş olsa da, (Allaha) təzim edənlər üçün ağır deyildir(٢). Birində də möminlərə müraciətlə buyurur: Ey iman gətirənlər! Dözümlü olmaqla və namaz qılmaqla (Allahdan) kömək diləyin, çünki Allah dözümlü olanlarladır(٣). Bəllidir ki, burada əvvəla dözüm və namaz elementlərinin əhəmiyyəti, İslam cəmiyyətinin uca məqsədlərində onların böyük təsirləri nəzərə alınır, ikincisi isə dözüm və namazın bir-biri ilə əlaqəsi, müqavimət, duruş və Yaradanla səmimi mənəvi əlaqə. Bu iki məqsəd bütün bu ayədən, xüsusən də onun ey iman gətirənlər hissəsindən başa düşülür. Bu şərafətli ayədən öncə zikr və şükürdən danışılmışdır: Məni yada salın ki, Mən də sizi yada salım! Mənə şükür edin, Məni danmayın(۴). Ondan sonra isə cihad məsələsi qeyd olunur: Allah yolunda öldürülənlərə "ölü" deməyin. Əksinə, onlar (Allah dərgahında) diridirlər, lakin siz bunu dərk etmirsiniz(۵). Bu ayədən sonra da aşağıdakı məşhur ayələr gəlir: Əlbəttə, Biz sizi bir az qorxu, bir az aclıq, bir az da mal, can və məhsul qıtlığı ilə imtahan edərik. (Ey Rəsulum! Belə imtahanlara) dözən şəxslərə müjdə ver! O kəslər ki, başlarına bir müsibət gəldiyi zaman: "Biz Allahınıq (Allahın bəndələriyik) və Ona tərəf qayıdacağıq!" deyirlər. Onları Rəbləri tərəfindən salam və rəhmət gözləyir(۶). Bu iki element arasındakı güclü əlaqə bu ayələrdən anlaşılır. Həm bu iki elementin özü əhəmiyyətlidir, həm də onların əlaqəsi. Mən sonra .qayıdıb dözüm barədə bir qədər danışacağam

Burada namaz mənasını ifadə edən səlat sözü ümumi mənada götürülməlidir - yəni diqqət, zikr və təzim. Çünki zikrsiz namazın forması məqsəd seçilməyib. Məhz buna görə namaz barədə danışılan şərafətli ayədən sonra buyurur: Həqiqətən, namaz (insanı) çirkin və pis əməllərdən çəkindirər. Allahı yada salmaq, şübhəsiz ki, daha böyükdür(٧). Çirkin və pis əməllərdən çəkindirməsi namazın bir xüsusiyyətidir, amma .namazda bundan da böyük olan Allah zikri, Allahı yada salmaq xüsusiyyəti vardır



---

.Bəqərə/۴۵ [٢۴۶] -١

۲- [۲۴۷] Yenə orada.

۳- [۲۴۸] Bəqərə/۱۵۳.

۴- [۲۴۹] Bəqərə/۱۵۲.

۵- [۲۵۰] Bəqərə/۱۵۴.

۶- [۲۵۱] Bəqərə/۱۵۵-۱۵۷.

۷- [۲۵۲] Ənkəbut/۴۵.

Bu namaz – yəni zikr, diqqət, təzim, Allahla mənəvi əlaqə dözümün artmasında təsirlidir. İndi ayəyə, hədisə və İslam məfhumlarına əsasən, dözümün əhəmiyyəti anlaşıldığından namazın nə qədər mühüm olduğu aşkara çıxır. Namaz və Allah zikri o qədər əhəmiyyətlidir ki, möhkəmlik amili olan dözümü bizim qəlbimizdə, ruhumuzda, həyatımızda və düşüncələrimizdə bacardıqca möhkəmlədir və oturuşdurur. Buna görə Quranda deyilir: Dözümlü ol. Sənin dözümlü olman yalnız Allahın köməyilədir.(١) Əlbəttə, Quranda bu sözlə başlayan cümlələr çoxdur. Əgər insan onları oxusa, hər birinin bir elm dəryası olduğunu görər. Burada isə deyilir ki, sən Allahın köməyi ilə dözə bilirsən. Yəni ilahi zikrin tükənməz mənbəyinə bağlı olduğu təqdirdə onun müqaviməti bitib-tükənmir. Əgər müqavimət göstərmək, duruş gətirmək və geriyə çəkilməmək mənasında olan dözümü ilahi zikr bazasına – tükənməz mənbəyə birləşdirsək, bu dözüm heç vaxt bitməz. Dözümün bitməməsinin mənası budur ki, insanın bütün zirvələrə doğru gedişi heç zaman dayanmaz. Bu zirvələr həm dünya, həm axirət zirvələridir: elm zirvəsi, sərvət zirvəsi, siyasi iqtidar zirvəsi, mənəviyyat zirvəsi, əxlaq zirvəsi, uca insaniyyətə sarı yüksəliş zirvəsi. Bunların heç biri dayanmaz. Çünki hərəkət zamanı bizim dayanmamamız dözümsüzlükdən irəli gəlir. İki maddi qoşun bir-birinin qarşısında dayanıqda dözümü daha tez bitən məğlub olur, dözüm və müqaviməti gec .bitən isə qələbə çalır. Bu çox bariz və real misaldir. Bütün sahələrdə belədir

Problemlərlə, təbii maneələrlə və insanın kamilliyə doğru bütün hərəkətlərində qarşıya çıxan əngəllərlə üzləşdikdə dözüm bitməsə, o maneə bitəcək. İslamın qalib olmasının mənası budur. Həqiqətən bizim qoşunlarımız qalibdir(٢) sözünün mənası budur. Allah qoşunu, Allah dəstəsi, Allah bəndələri – bunlar həmin tükənməz mənbəyə birləşib insanın məğlub olması mümkün olan bütün problemlər qarşısında duruş gətirir. Əgər bu tərəf möhkəm dayandısa, təbii olaraq o biri tərəf məhv və məğlub olacaq. Təbii ki, adımız Allah dəstəsi və Allah qoşunu olsa, amma həmin əlaqəyə malik olmasaq, buna zəmanət yoxdur. Odur ki, əlaqəni bərqərar etmək lazımdır. Namazın əhəmiyyəti burada görünür; Allah zikrinin əhəmiyyəti burada görünür; ramazan ayı fürsətinin əhəmiyyəti burada görünür; özünüislah fürsətinin, təqva fürsətinin, qəlbə yəqin ehtiyatını doldurmaq fürsətinin əhəmiyyəti – ramazan ayının dualarında yəqin məsələsinin təkrar olunduğunu görürsünüz – burada görünür. Deməli, sözügedən məqsədlər üçün bu fürsəti qənimət bilmək lazımdır. Bunlar baş verdikdə o

zaman İslam cəmiyyətinin, İslam ümmətinin və müsəlman bəndənin dözümü bütün problemlərə qələbə çala biləcək. O zaman bu cəmiyyət həm siyasətdə, həm iqtisadiyyatda, həm əxlaqda, həm mənəviyyatda inkişaf edəcək. Həqiqət budur. Biz .özümüzü bu həqiqətə yaxınlaşdırmalıyıq

**Dözümün üş növü**

Çoxlu hədislərdə göstərilir ki, dözüm üç yerdə lazımdır: itaət, günah və müsibət .zamanı. Bu barədə çoxlu hədisləri var və eşitmisiniz

İtaətə dözüm odur ki, vacib bir işi və ibadət əməlini yerinə yetirəndə onun uzun çəkməsinə görə yorulmur, yarıyolda buraxmırsınız; məsələn, bir şəxs uzun bir müstəhəb namazdan, yaxud uzun bir duadan yorulmur. İtaətə dözüm budur: ramazan ayının orucunun çoxluğundan, vacib namazların uzunluğundan və Qurana diqqətdən .yorulmamaq. Bu, itaətə dözümdür

Günaha dözüm – günah qarşısında nəfsini saxlamaq, duruş gətirmək və möhkəm dayanmaqdır. Günah zamanı möhkəmlik belədir ki, insan ona sarı getməsin, təhrik olmasın, ehtirasların təsiri altına düşməsin. Ehtiras bir yerdə cinsi ehtirasdır, bir yerdə puldur, bir yerdə vəzifədir, bir yerdə şan-şöhrətdir. Bunların hamısı insani ehtiraslardır. Hər kəsin bir cür ehtirası var. Haram olduğu təqdirdə bunlar insanı özünə çəkməməlidir. Misal üçün, bir uşaq şirniyyat qabına çatmaq üçün hərəkət edir. Yolunun üstündə su var, stəkan var, boşqab var. Amma o bunlara diqqət yetirmir və vurub-sındırır. Günaha cəzb olunan insan belədir, yolda nəyin olmasına baxmır. Bu təhlükəlidir. Çünki bu halda insan həm də qəflət içərisindədir, özündə deyil, özünün bu diqqətsizliyindən xəbərsizdir. Uşaq diqqətsiz olduğunu bilmir; bilmir ki, su parçına, yaxud boşqaba, yaxud qiymətli güldana diqqətsizlik edir. O, bu diqqətsizliyin özünə qarşı diqqətsizdir. Buna görə gözlərimizi çox açmalı, bu böyük qəflətdən ehtiyatlı .olmalıyıq. Bu, günaha dözümdür

Müsibətə dözümün mənası odur ki, insan üçün qarşıya çıxan acı hadisələr – ölüm-itimlər, yoxsulluqlar, xəstəliklər, dərdlər, əziyyətlər və bu qəbildən olan acı hadisələr .onu sındırmasın, dünyanın sonunun çatdığını düşünməsin

Dözümün hər üç növü əhəmiyyətlidir. Allah-Taala bunların hamısına dözənə Öz salam və rəhmətini şamil etmişdir: Onları Rəbləri tərəfindən salam və rəhmət gözləyir(۱).



---

۱- [۲۵۵] Bəqərə/۱۵۷.

### Üç növ dözümün ictimai cəhəti

Burada başqa bir məsələ budur ki, bu üç növ dözüm bəzən yalnız şəxsi məsələlərdə olur. Bunun misalları qeyd olundu və hamımız bilirik. Amma bəzən də qeyri-şəxsi və ictimai məsələlərdədir; ümumi məsələlərdə, yaxud başqa sözlə desək, bir toplumun, bir ümmətin, bir xalqın və bir ölkənin taleyinə bağlı olan məsələlərdə. Fərz edin insanın dözməli olduğu itaət əməli bir ölkənin taleyinə bağlı əməldir, misal üçün, Allah yolunda cihad məsələsidir. Müqəddəs müdafiə dövründə cəbhəyə getməkdə, ölkəni və quruluşu müdafiə etməkdə dözümlü olmaq vacib bir iş və bir itaət idi. Müdafiədə dözümlülük yalnız insanın özünə aid olan məsələ deyildi. Döyüşə yollanan hər bir döyüşçü əslində öz getməsi və müqaviməti ilə ölkənin taleyini yazırdı. Bəzən itaət belədir. Yaxud siz məclis deputatının, nazirin, müdirin, hərbçinin, mədəni bir müəssisə işçisinin - harada çalışırsınızsa, görməli olduğunuz böyük iş bir itaətdir, Allaha itaətdir, bəndələrə xidmətdir. Allaha itaətin bu bir cəhəti İslam quruluşunda vəzifədir. Bu da Allaha itaətin başqa bir cəhətidir. Bu quruluşun, bu ilahi rejimin yuxarıdan aşağıya qədər bütün məmurlarının gördüyü işlər ilahi vəzifələrdir. Əgər siz polis, siz iqtisadi məmur, siz təhlükəsizlik məmuru, siz siyasi məmur yorulsanız, bu, dözümsüzlükdür. Bu, Dözümlü olmaqla və namaz qılmaqla (Allahdan) kömək diləyin![١] tövsiyəsinin .ziddinədir. Dözümdən kömək istəyin

Yaxud bir şey günahdır, amma elə bir günahdır ki, onun pis və xoşagəlməz nəticəsi yalnız sizə aid olmur: Sizdən təkcə zalımlara toxunmayacaq (pis əməllərin müqabilində hamıya üz verəcək) bəladan qorxun[٢]. Bəzən insan səhv bir hərəkət edir, bir yersiz söz danışır, bir yersiz iş görür, bir yersiz imza atır - biz məmurların vəziyyəti belədir - və onun nəticələri bir ölkəyə, əhalinin bir qisminə, yaxud bir təbəqəyə toxunur. Bu, günahdır. Məlum olur ki, belə yerlərdə günaha dözümlülüyün mənası daha böyük olur. Bu dözümlülük sizin məsələn, bir rüşvət qarşısında dözümlü olub rüşvət almamanızla fərqlənir. Rüşvət almamaq çox gözəl, çox böyük işdir, amma şəxsi bir günah qarşısında dözümlülükdür. Nəticəsi bütün cəmiyyətə toxunan günah qarşısında dözümlülük isə bundan da üstündür. Deməli, günaha dözümlülüyün belə geniş əhatəsi .var

Müsibətə dözümlülük də belədir. Müsibətlər bəzən insanın şəxsi müsibətləri olur,

bəzən də ümumi müsibətlər. Məsələn, indi ölkə məmurları müxtəlif təxribat, ittiham, böhtan, təhqir və açıq iftiralarla üzləşirlər. Görürsünüz ki, bu nəhəng beynəlxalq informasiya resurslarında, xəbərlərdə, mediada, yazı və danışıqlarda nə qədər sözlər deyilir. İslama görə, inqilaba səh:۲۲۷

---

۱- [۲۵۶] Bəqərə/۴۵.

۲- [۲۵۷] Ənfal/۲۵.

görə, hegemonizmin xoşuna gəlməyən amalların hər birinə görə, İslam Respublikasında çalışan və onların bəyənmədiyi bəzi şəxslərə görə – bunların hamısına görə İslam Respublikasının əleyhinə danışırlar. Yəni müxtəlif yollarla və müxtəlif cəhətlərdən İslam Respublikası əleyhinə hücumlar edilir. Bunlar müsibətdir və onlara dözmək asan deyil. Biz dünyanın bəzi başçı və məmurlarını yaxından görmüşük, bəziləri haqda eşitmişik. Elələri var ki, məhz həmin məsələlərə və təhqirlərə görə təsvir etdikləri məqsədlərdən və düz xətdən açıq şəkildə yayınırlar, .onlara dözə bilmirlər. Bu da müsibət zamanı dözümlülük barədə

Buna əsasən, dözümlülüyü bu üç sahədəki bütün əhəmiyyəti ilə birgə nəzərə almaq lazımdır; bir dəfə şəxsi məsələlərdə – bu mühüm məsələdir, mən və siz buna digərlərindən çox əhəmiyyət göstərməliyik – bir dəfə ictimai, siyasi, ümumi və milli məsələlərdə. Bu mənə və sizə məxsusdur. Yəni ümumi camaata aid deyil, onlarda belə şeylər yoxdur; bizə aiddir, dövlət rəsmisi olan, məhkəmə işində çalışan, parlament deputatı və məmur olan sizə məxsusdur. Hər iki mərhələdə və hər iki səviyyədə bu üç .dözümlülük olmalı və ondan kömək almaq lazımdır. Əsas məsələ budur

Üç hakimiyyət orqanının başçıları və quruluşun məsul şəxsləri ilə görüşdə çıxışından: .۲۰۰۸

səh:۲۲۸

## Qədr gecələri – Allahla mənəvi əlaqənin, Onun qarşısında təzim və kiçilmənin baharı

Cümə və qədr günü, ramazan ayı və cümə namazından öncəki bu dəqiqələr oruc tutmuş əziz qardaş və bacılarla söhbət etmək üçün çox əlverişli fürsətdir. Öz qəlblərimizi ilahi lütf və mərhəmət mənbəyi ilə tanış edək, Ona yaxınlaşdıraq və öz qəlblərimizdə təqva ağacının böyüməsi üçün münasib şərait yaradaq.

Qədr gecəsi Allaha ibadət və dua mövsumudür. Ramazan ayı, xüsusən də qədr gecələri Allahla mənəvi əlaqənin, Onun qarşısında hörmət və təzimin baharıdır. Bu ay həm də qəlblərimizi dünya möminlərinin əmiri və təqvalıların sərvəri ilə tanış etməyimiz və ondan dərs götürməyimiz üçün bir bəhanə və fürsətdir. Ramazan ayının fəzilətləri və bu ayda saleh bəndələrin vəzifələri haqda nə danışsaq, demək olar ki, Əmirəlmöminin (ə) həmin xüsusiyyətlərin kamil nümunəsi və ən dəyərli örnəyidir. Mən birinci xütbəni Əmirəlmöminini (ə) xatırlamaqla başlayıram ki, onunla daha yaxından tanış olaq. Onun haqqında deyilənlər, bizim deyib-eşitdiklərimiz o şəxsiyyətin uca məqamı və əzəməti ilə müqayisədə kiçikdir. Biz nə onun mübarizəsini, nə Allah-Taalaya yaxınlaşmaq üçün göstərdiyi səyləri, nə həyatının əzab-əziyyətlərini, nə də öz dövründə gördüyü işin əzəmətini vəsf edə bilərik.

## Əmirəlmöminin Əlinin (ə) əxlaqi tərbiyə cəhəti

Mən bu gün Əmirəlmöminindən (ə) dərs götürmək üçün onun hərtərəfli fəaliyyətinin əxlaqi tərbiyə cəhəti haqda danışmaq istəyirəm. Əmirəlmömininin (ə) ozamankı İslam cəmiyyətində iş başına gəldiyi zaman müsəlman ümmətin vəziyyəti əziz Peyğəmbərin (s) dünyadan köçdüyü zamanla çox fərqli idi. Peyğəmbərin (s) vəfatı ilə Əmirəlmömininin (ə) iş başına gəlməsi arasındakı iyirmi beş illik fasilədə çoxlu hadisələr baş vermiş və bu hadisələr İslam cəmiyyətinin beynində, düşüncəsində, əxlaqında və əməlində dərin izlər buraxmışdı. Bundan sonra bu quruluşu və bu cəmiyyəti Əmirəlmöminin (ə) təhvil aldı.

Əmirəlmöminin (ə) böyük İslam ölkəsində beş ilə yaxın hakimiyyətdə oldu. Bu beş ilin hər bir günündə bir dərs vardır. Əmirəlmömininin (ə) davamlı işlərindən biri xalqın əxlaqi tərbiyəsi ilə məşğul olmaq idi. Cəmiyyətdə yaranan bütün yayınmaların kökü bizim xarakterlərimizdədir. İnsan əxlaqı, insanların əxlaqi xüsusiyyət və xarakterləri

onların əməlinə istiqamət verir və onu formalaşdırır. Əgər biz bir cəmiyyətdə, yaxud dünya miqyasında əyintilər müşahidə ediriksə, onların kökünü xoşagəlməz .xarakterlərdə axtarmaq lazımdır

Bu məsələ Əmirəlmömininі (ə) daha mühüm bir həqiqəti bəyan etməyə vadar edir. O həqiqət budur ki, insanlarda olan bu batil və zərərli xarakterlərin əksəri dünyagirlikdən irəli gəlir. Odur ki, Əmirəlmöminin (ə) buyurur: Dünyagirlik bütün səhvlərin kökündür.(١) Dünyagirlik bizim ümumi və fərdi həyatımıza təsir göstərən bütün səhvlərimizin kökü ?və əsasıdır. Bəs dünyagirliyin mənası nədir? Dünya nədir

## Dünya İslam təlimlərində

Dünya Allah-Taalanın yaradıb insanların ixtiyarında qoyduğu bu möhtəşəm təbiətdən ibarətdir. Dünya budur. Allah-Taalanın kainatda yaratdığı nemətlərin hamısı dünyanı təşkil edən elementlər məcmusudur. Birincisi bizim öz ömrümüzdür. Dünyəvi gəlirlər və dünya səylərinin məhsulu dünyadır; övlad dünyadır, mal dünyadır, elm dünyadır, təbii sərvətlər dünyadır, sular, mədənlər, insanın təbiətdə gördüyü hər bir şey - yəni bizim bu dünya həyatımızın müxtəlif hissələrini təşkil edən amillər dünyadır. Bəs bu dünyanın nəyi pisdir? Şəriət və İslam təlimlərinin bir qismi bizə deyir ki, dünyanı abadlaşdırın: Yerdə olanların hamısını sizin üçün yaratmışdır. Gedin dünyanı abadlaşdırın, özünüzə və xalqa təbii nemətlərdən istifadə şəraiti yaradın. Rəvayətlərin bir qismi bunlardır: Dünya axirətin tarlası, Allah bəndələrinin bazarıdır. Belə sözlər .çoxdur və bunların hamısı dünyaya müsbət baxışı göstərir

Bizim İslam və din təlimlərimizin bir qismi də dünyanı günah və xətaların kökü sayır. Bu, iki növ göstərişlər toplusundan alınan nəticədir. Söz aydındır. Əlbəttə, bu işlər üçün dərin təhlillər lazımdır və yaxşı işlər də görülmüşdür. Qısası budur ki, Allah-Taala bu təbiət süfrəsini insan üçün açmış, bütün insanlara onu bacardıqları qədər aktual, hazır və rəngarəng şəkildə özlərinin və insanların ixtiyarına qoymağı tapşırmış, əmr etmişdir. Lakin buna bir sıra hədlər, qanun-qaydalar hakimdir. Burada qadağan olunmuş zona vardır. Bəyənilən dünya odur ki, insan bu ilahi təbiətlə, bu nemətlərlə ilahi qayda-qanunlara uyğun rəftar etsin, çərçivədən çıxmasın, qadağan olunmuş zonalara girməsin. Məzəmmət olunmuş dünya odur ki, insan Allah-Taalanın verdiyi bu nemətləri özü üçün istəsin, özünə digərlərindən çox pay götürsün, başqalarının payına əl uzatsın və göz diksin. Bu, insanı kar və kor edir və nəhayət könlü istəyəni əldə etmək üçün heç bir qırmızı xətt və çərçivə tanımır. Bu, məzəmmət olunmuş dünyadır. Dünyaya vurulmaq, həddən artıq və öz haqqından çox pay istəmək, digərlərinin

payına əl uzatmaq, digərlərinin haqqını tapdamaq məzəmmət olunmuş dünyadır. Mal dünyadır, vəzifə dünyadır, hakimiyyət



---

۱- [۲۵۸] Təsnif Ğürər əl-hikəm və dürər əl-kəlim, səh: ۱۴۲.

dünyadır, sevilmək dünyadır, dünya nemətləri, təbii ləzzətlər – bunların hamısı dünyadır. İslam və ilahi dinlər ümumi olaraq bu dünyadan istifadəni halal etmiş, digərlərinin haqqını tapdamağı, təbiətin qayda-qanunlarını pozmağı, digərlərinə zülm etməyi, özünü bu dünya nemətlərinə qərq etməyi və əsas məqsədi unutmağı isə qadağan etmiş, pisləmişlər. Bu dünya təkamülə vasitədir, onu məqsəd seçmək olmaz. .Əgər bu qaydaya riayət olunmasa, dünya məzəmmət olunmuş dünya olar

Əmirəlmömininin (ə) iş başına gəldiyi dövrdə İslam dünyasında mövcud olan bu bəla açıq-aşkar haqq olan Əli ibn Əbu Talib (ə) kimi bir şəxsə qarşı şübhə və iradlara səbəb olmuşdu. Bəzi adamlar İslam cəmiyyətinin idarəsi üçün onun məqamını, mənəviyyatını, keçmişini və bənzərsiz səlahiyyətlərini görməzliyə vurur, onunla mübarizəyə qalxırdılar. Bu, dünyagirliyə görə idi. O zaman Əmirəlmömininin (ə) öz qarşısında gördüyü bu azğınlığın sirri dünyagirlikdən ibarət idi. Nəhcül-bəlağə bu azğınlığa dair sözlərlə doludur. Bu gün siz dünyada bunu müşahidə edirsiniz. Dünyaya fürsət gözləyən dünyagir və təcavüzkar qüvvələr başçılıq edəndə vəziyyət gördüyünüz kimi olur: əvvəla, insanların haqqı tapdanır; ikincisi, insanların bu ilahi təbiətin və ilahi nemətlərin əzəmətli süfrəsində olan haqları görməzliyə vurulur; üçüncüsü, həmin dünyagirlərin öz məqsədlərinə çatması üçün cəmiyyətdə fitnə yaradılır, müharibələr, yalançı təbliğatlar və çirkin siyasətbazlıqlar baş alır. Bunlar günyagirlikdən doğur. Cəmiyyətdə fitnə və dumanlı şərait yarandıqda xalqın zehni dumanlanır və insan iki metr önünü görə bilmir. Belə vəziyyətdə çoxları səhv edir, sayıqlıqlarını itirirlər, puç cahiliyyət təəssübkeşlikləri inkişaf edir. Onda görürsünüz ki, əsas özək dünyagirlərdir, amma dünya adamı olmayanlar da fitnə səbəbindən onların məqsədləri istiqamətində hərəkət edirlər. Dünyanın vəziyyəti belə olur. Buna əsasən, dünya bütün səhvlərin köküdür. Dünya sevgisi və dünyaya vurulmaq bütün səhv və günahların başıdır. Əmirəlmöminin (ə) bu məqama diqqət yönəldir. Bu, .Əmirəlmömininin (ə) əxlaqi tərbiyə proqramıdır

Siz Nəhcül-bəlağəyə baxsanız, Əmirəlmömininin (ə) dünyaya rəğbətsizlik, dünyaya vurulmamaq və zahidlik barədə buyurduqlarının onda bəyan olunan digər bütün mətləblərdən çox olduğunu görərsiniz. Səbəbi məhz budur, çünki Əmirəlmöminin (ə) dünyadan kənara çəkilən və tərki-dünyalıq edən birisi deyildi. Xeyr! O, dünyanın

abadlığı üçün ən çalışqan adamlardan biri idi, istər xilafəti dövründə, istər xilafətdən öncə işləyir, çalışırdı. Bilirik ki, Əmirəlmöminin (ə) xilafətdən öncə Mədinədə yaşadığı zaman öz əli ilə bağlar salır, su çəkir, xurma ağacları becərirdi. Dünya ilə məşğul olmaq, Allah-Taalanın insanın ixtiyarına buraxdığı təbiətlə məşğul olmaq, xalqın məişətini və

iqtisadiyyatını idarə etmək, iqtisadi inkişafa şərait yaratmaq – bunların hamısı müsbət, vacib işlərdən, müsəlman şəxsin və müsəlman müdirlərin vəzifələrindəndir. Əmirəlmöminin (ə) belə bir insan idi, amma dünyaya vurğun deyildi. Bu, .Əmirəlmömininin (ə) vəziyyəti və əxlaqi tərbiyə proqramıdır

Əmirəlmöminin (ə) dünyagirliyin əlacını Təqvalılar xütbəsində bəyan etmişdir. Dünyaya vurulmağın əlacı insanın təqvalı olmasıdır. Təqvanın xüsusiyyətlərindən biri budur: Yaradan onların gözlərində böyük, digərləri isə kiçikdir.(١) Allah insanın qəlbində və ruhunda elə uca olur ki, onun gözündə hər şey kiçilir. Dünyəvi vəzifələr, sərvətlər, gözəlliklər, maddi həyatın rəngarəngliyi və müxtəlif ləzzətlər insanın gözündə kiçilir. Allahın xatirəsi qəlbdə o qədər böyüyür ki, bunlar öz əhəmiyyətini itirir. Təqvanın bir xüsusiyyəti budur. Əmirəlmömininin (ə) özü də bunun kamil tərənnümü idi. Növf Baqqali adı ilə məşhur olan bu xütbədə - indi mən ondan bir hissəni oxuyacağam - deyilir ki, həzrət qiymətsiz, sadə və nimdaş bir yun paltarda bir daş üzərində dayandı. Xurma yarpağından, yaxud xurma ağacının qabığından ayağında bir başmaq vardı. Əzəmətli İslam məmləkətinin hakmi və başçısı belə yoxsul və zahid görkəmdə idi, belə .yaşayır və bu əzəmətli, hikmətli sözləri söyləyirdi

Siffeyn döyüşündə bir nəfər gəlib Səqifə hadisələri haqda sual verdi. Həzrət ona sərt cavab verib buyurdu ki, sözün yerini bilmirsən, nə dediyinə, harada dediyinə baxmırsan, bu böyük hərbi və siyasi hadisədə keçmişdən soruşur və Səqifə hadisəsi haqda sual verirsən. Amma eyni zamanda bir kəlmə ilə onun cavabını verib buyurur ki, sənin sual vermək haqqın vardı və soruşduğuna görə cavab verməliyəm. Deyir ki, bu bir imtiyaz istəyi idi; bir qrup ona göz yumdu, bir qrup isə onu ələ keçirdi. Yəni Əmirəlmömininə (ə) görə hakimiyyət hərisliyi, vəzifə düşkünlüyü, dünyanın hər hansı bir formasının ardınca qaçmaq bütün zamanlarda rədd olunub qınanmalıdır. Bu, Əmirəlmömininin (ə) əhval-ruhiyyəsidir. O bizə bunu öyrətmək istəyir. Biz Əmirəlmömininindən (ə) bunu dərs götürməliyik. Allahı yad etmək, ilahi zikrə və .münacata diqqət yetirmək Əmirəlmömininin (ə) göstərdiyi ən mühüm çıxış yoludur

### Ramazan – daxili dərdlərin dərmanı

Biz bu gecələrin, gündüzlərin və duaların qədrini bilməliyik. Bu dualara diqqət

yetirmək, onların məzmununu yada salmaq çox dəyərlidir. Bunlar bizim mənəvi dərdlərimizin dərmanıdır. Təəssüf ki, insanlar bütün dövrlərdə bu dərdlərə düçar olmuşlar. Biz bacardıqca bu xəstəliyi, bu böyük dərdi – dünya



---

۱- [۲۵۹] Tühəf əl-üqul, səh: ۱۵۹.

sevgisini özümüzdə azaltmalıyıq. Allah-Taalanı yada salmaq və Onun əzəmətini xatırlamaq bunun yollarından biridir. Siz Əmirəlmömininin (ə) dualarına baxın. Ən yanıqlı dualar Əmirəlmömininin (ə) dualarıdır. Əlbəttə, məsumlardan nəql olunan duaların hamısı dərin məzmunlu, aşiqanə, arifanə və əksərən yüksək səviyyədədir, lakin ən yaxşılarından biri, yaxud ən yaxşıları Əmirəlmöminindən (ə) nəql olunmuş dualardır. Mən bir dəfə imamdan soruşdum ki, siz bu duaların hansını çox istəyirsiniz? O cavab verdi ki, Kumeyl duasını və Şəban münacatını. Onların hər ikisi Əmirəlmöminindən (ə) nəql olunmuşdur. Bu Kumeyl duası, Şəban münacatı, Sabah .duası və Əmirəlmömininin (ə) digər münacatları həqiqətən yanıqlıdır

Mən xahiş edirəm bizim əziz gənclərimiz bu duaların mənasına diqqət yetirməyə çalışsınlar. Duanın sözləri fəsahətli və gözəl sözlərdir, lakin mənalar da uca mənalardır. Bu gecələrdə Allahla danışmaq, Allahdan istəmək lazımdır. Əgər insan bu duaların mənasını bilsə, ramazan ayının gecələrində, əhya gecələrində oxunan dualarda, Əbu Həmzə duasında və qədr gecələrinin dualarında ən yaxşı sözlərin və ən yaxşı istəklərin cəm olduğunu görər. Əgər bu duaların mənasını bilməsəniz, öz dilinizdə dua edin, özünüz Allahla danışın. Bizimlə Allah arasında heç bir pərdə yoxdur, Allah-Taala bizə yaxındır, bizim sözümüzü eşidir. Allahla danışmağa çalışaq, öz istəklərimizi Allah-Taaladan diləyək. Allah-Taala ilə bu ünsiyyətin, Allahı yad etməyin, Ondan bağışlanmaq istəməyin və duanın insan qəlbinə çox möcüzəvi təsirləri var, ölü qəlbləri .dirildir

### Oruc tutan yeniyetmələrə orucluq təbriki

Bu il birinci vacib oruclarını tutan, ilahi müraciətin və ilahi vəzifənin müraciət tərəfi olmaqla şərəflənən əziz yeniyetmələri, xüsusən də az yaşlarında Allahın vacib buyurduğu əməli təcrübə edən və indiki nisbətən uzun və isti günlərdə oruc tutan qız uşaqlarını təbrik etmək istəyirəm. Bu bizim xalqımızın ən yaxşı sınaqlarından biridir. Bizim gənclərimiz orucdan ibarət olan şəriət təlimini gənclik çağında təcrübə edirlər. Ac qalmaq, ləzzətlərə göz yummaq və biraylıq fürsətdə haramlara rəğbətsizlik xalq, xüsusən də gənclər üçün çox dəyərlidir. Bu, qız və oğlanda həddi-büluğun əvvəlindən, yeniyetməlik dövründən təqva qazanmaq məşqidir. Bütün gəncləri, xüsusən də birinci ili olanları təbrik edirik. Allaha şükür olsun ki, bizim cəmiyyətimiz mənəvi cəmiyyətdir,

onun mənəvi ab-havası ramazan ayında daha güclənir, yaxşı adətlər tədricən xalqın arasında yayılır, yoxsullara kömək edilir, ehsan və yaxşılıq həftəsi keçirilir, müxtəlif şəhərlərdə iftar məclisləri təşkil olunur,

xeyriyyəçi insanlar məscidlərdə və ümumi yerlərdə iftar süfrələri açırlar. Bunlar paklığa, səmimiyyətə və yaxınlaşmaya bais olan, ramazan ayının haqqını ödəyən çox yaxşı işlərdir. Ramazan ayının hüquqlarından biri qardaşlara yaxşılıq etmək, yaxınlarla və müsəlman qardaşlarla mehriban olmaq, bir-birinə yardım etməkdir. Bunlar çox yaxşı işlərdir. Əvvəllər də bu işlər adət olmuşdur, bu gün isə daha çoxdur. Moizə məclisləri, dua məclisləri, Quran məclisləri yaxşı adətlərdir. Bunları günbəgün artırmaq və məzmununu gücləndirmək lazımdır. Məclisin forması kifayət etmir. Dua, moizə və Quran məclislərindən bəhrələnmək lazımdır. Bizim hər birimiz bunlardan pay .götürməyə çalışmalıyıq

.Tehranın cümə namazı xütbələrindən: ۲۰۰۸

## Fitr bayramının iki xüsusiyyəti

Fitr bayramı iki dəyərli xüsusiyyətə malikdir. Birinci xüsusiyyət mömin insanların qəlbində yaranan paklıqdan ibarətdir. Mübarək ramazan ayının şəriətə uyğun riyazətlərindən biri orucdur. İnsan öz iradə və ixtiyarı ilə saatlarla maddi ləzzətləri tərk edir, orucluq ayı boyu nəfsinə hakim olur. Bundan əlavə, Quranla ünsiyyət, Allahın kəlamını oxumaq, Quran təlimləri ilə tanış olmaq, üstəgəl zikr, dua, münacat, ibadət, insanın ramazan ayının gündüz və gecələrində, xüsusən də mübarək qədr gecələrində Allah-Taala ilə ünsiyyət haləti - bunların hamısı ürəyi işıqlandırır, insan ruhuna paklıq və təmizlik bəxş edir. Ramazan ayının çox əhəmiyyətli olan bu əməllərində bizim üçün .böyük dərslər vardır və biz onlardan istifadə etməliyik

## Ramazanın böyük dərsləri

Bir dərs budur ki, Allahı axtaran insanın iradəsi nəfsin dəvət etdiyi bütün istəklərə və maddi ləzzətlərə hakim ola bilir. Bu bizim üçün çox mühüm məsələdir. Bəzən insan özünə təlqin edir ki, mən nəfsimə hakim ola bilmirəm. Ramazan ayının orucu isə insana bacardığını sübut edir; sübut edir ki, iradə etdikdə, güclü əzmkarlığını işə saldıqda nəfsinə hakim ola və qələbə çala bilər. Bizdə mövcud olan azdırıcı əlamətləri, pis və bəyənilməz adətləri güclü iradə ilə və Allah-Taalaya güvənməklə məğlub etmək, onlardan qurtulmaq olar. Təsiri böyük dərs olan bu güclü iradə bizi həm xoşagəlməz şəxsi adətlərimizdən, həm də maddi və mənəvi sahələrdə geriliyimizə səbəb olan yerli xislətlərimizdən və ictimai adətlərimizdən ayıra bilər. Deməli, bir dərs .güclü iradənin bütün maneələrə qələbəsidir

Bundan əlavə, ramazan ayında insanlara yardım və xalq arasında həmkarlıq ruhu yaranır. İnsanın eqoistliyi digərlərinin xeyrinə məğlub olur. Siz görün xoşbəxtlikdən, son illərdə və bu il nə qədər namsız-nişansız insanlar məscidlərdə və hətta bəzən küçələrdə Allah bəndələrinə süfrələr açdılar, iftar məclisi qurub xalqı qonaq etdilər; adi komplimentlər olmadan, şəxsi qonaqlıqlarda mövcud olan utanıb-çəkinmələr olmadan. Bu həmkarlıq və xeyirxahlıq insan nəfsinin paklığı ilə nəticələnən çox dəyərli amillərdir. Bu ayda ehtiyacı olanlara nə qədər köməklər olundu, hətta ramazan ayında qan da verildi. Məsul işçilər xəstələrin yeni qana ehtiyacı olduğunu elan etdəndə çoxlu

insanlar oruc halda öz qanlarını hədiyyə etdilər. Bu, digərlərinin mənafeyini öz mənafeyindən üstün tutmaq haləti, digərləri üçün öz xeyrindən keçmək fədakarlığıdır. Bunun özü böyük həddə ramazan ayının ötən illərdə olduğu kimi Allahın lütfü ilə bu il də mövcud olan mənəvi ruhiyyəsinin nəticəsidir. Hətta

eşitdiyim qədərincə, etimadlı xəbərlərə və sənədli məruzələrə əsasən, bu il zikr, dua və ibadət ab-havası bütün ölkəni bürümüşdü. Xüsusən qədr gecələrində, bu bərəkətli saatlarda hamı, özəlliklə gənclər, müxtəlif təbəqələrdən olan, müxtəlif ictimai, fərdi, siyasi və digər qruplara məxsus insanlar dua, ibadət və zikr məclislərini rövnəqləndirdilər. Hamı əllərini qaldırıb dua və ürəyini Allahla tanış etdi. İnsanın qazandığı bu diqqətin, ibadətin və bu səadətin özü ilahi mərhəmətdir; bunun özü Allahın diqqətini göstərir. İmam Səccad (ə) mübarək ramazan ayı ilə vidalaşma duasında buyurur: Sənə şükür edənə təşəkkür edirsən, halbuki şükrünü ona Sən ilham etmisən. Sənə həmd edənə mükafat verirsən, halbuki həmdini ona Sən öyrətmisən.(1)

Həqiqətən insanın ey Allah deməsi, Allah-Taala ilə ünsiyyət qurması, Allahla danışması Allahın insana bəxş etdiyi ilahi lütf və səadətdir. Bu ey Allah sözünün özündə Allahın cavabı da vardır. Xüsusən siz gənclər bu mənəvi ləzzəti daddınız; pak, işıqlı, çirksiz, yaxud az çirkli qəlblərinizlə bu mənəvi ləzzəti daddınız. Bu ləzzəti əldən verməyin, onu tərk etməyin. Bu paklığın və mənəviyyatın davam etməsi üçün gündəlik beş namazdan, Quran qiraətindən, məscidlərdən, dualardan, Səhifeyi-Səccadiyyədən və digər amillərdən istifadə edin. Bu, fitr bayramının dəyərli bir xüsusiyyətidir və siz ramazan ayından yaranmış bu nurluluğu özünüzlə daşıyırsınız.

İkinci xüsusiyyət də sizin bu namazınızdadır. Fitr bayramı xalqın həqiqi və səmimi birliyinin təcəssüm və nümayiş olunmasıdır. Xalqın birliyi və ümumi şəkildə Allahın ipinə sarılmaq çox dəyərli məsələlərdəndir. Bunu özümüz üçün bir ramazan dərsi kimi qorumalıyıq. Bu da ramazan ayının mənəvi məzmununun məhsuludur. Xüsusən biz müsəlmanlar və özəlliklə İran xalqı böyük imamımızın sayəsində ramazan ayında Qüds günü keçiririk. Qüds günü İslam dünyasının həqiqi birliyinin əlamətlərindəndir. Bu il Qüds günündə İran xalqının möhtəşəm yürüşləri dünyanın müsəlman xalqlarının diqqətini cəlb etdi. İran xalqı hamılıqla fəryad çəkib məzlum Fələstin xalqını dəstəklədi. Mən bu il Qüds günündəki möhtəşəm fəallığına görə əziz İran xalqımıza təşəkkür etməyi özümə borc bilirəm.

Namazda iştirak edən əziz qardaş və bacılar və bütün İran xalqı! Özümüzdə, yaxınlarımızda, İslam cəmiyyətimizdə ramazan ayının səmərələrini bacardıqca davam etdirək və Allahın böyük neməti olan ilahi ehtiyatı qoruyaq.

Bu böyük İslam bayramı münasibəti ilə böyük İslam ümmətini, bütün dünya müsəlmanlarını, əziz, mömin və böyük İran xalqını, siz möhtərəm məclis iştirakçılarını və əziz qonaqları təbrik edirəm. Allah-Taaladan istəyirəm ki, fitr bayramını İslam ümməti üçün həqiqətən bayram etsin, onu haqlı olaraq gözlədiyi və ilahi vədlərdən .olan parlaq gələcəyə daha da yaxınlaşdırsın

Sizin, ölkəmizin əhalisinin və dünya müsəlmanlarının çoxu ramazan ayında ilahi ziyafət süfrəsindən maksimum istifadə etdi. Bu ayda tövbə, əfv, zikr, ibadət və Allah-Taala ilə ünsiyyət qapısı açıq idi. Oruc ağız və sakit nəfs Allah bəndələrinin bu ayda mənəvi və ilahi nemətlərdən istifadə etməsinə böyük kömək göstərdi. Müsəlman insanlar bu ilahi ziyafətdə zikr və münacat ləzzətini dadır, öz ilahi fitrətlərinə yaxınlaşır, iradələrini .gücləndirir və özlərində insana həqiqi azuqə olan təqva yaradırlar

.Fitr bayramı münasibəti ilə quruluşun məsul şəxsləri ilə görüşdə çıxışından: ۲۰۰۸

səh:۲۳۷

## Quran qiraəti – Quranla ünsiyyətə hazırlıq

Əvvəla Quranla ünsiyyət və Quran qiraəti ölkədə çox yaxşı inkişaf etmişdir. Mən burada Quran oxuyan bütün əziz qardaşlara, eləcə də bu məclisin təşkilatçılarına təşəkkür edirəm. Burada oxunan qiraətlər çox yaxşı idi. Bəziləri həqiqətən standart səviyyədə idi; həm tələffüz cəhətindən, həm avaz cəhətindən, həm təcvid cəhətindən, həm də məzmun və məfhumlara diqqət, onlara münasib avazın tənzimi cəhətindən. Allaha şükür olsun ki, bizim gənclərimiz bu cəhətlərdən də inkişaf etmişlər. Bunlar yaxşıdır. Dəfələrlə deyilmişdir ki, bu məclislər və yaxşı qiraətlərə dair həvəsləndirmələr cəmiyyətimizin Quranla ünsiyyət qurmasına hazırlıqdır. Qoy ölkəmiz və xalqımız uzun illər düçar olduğu Quranla özgəlikdən xilas olsunlar və Qurana yaxınlaşsınlar. Bu tədricən baş verməkdədir. Əlbəttə, bizim bütün xalqımızın, bütün gənclərimizin, bütün kişi və qadınlarımızın Quranla ünsiyyət qurmasına hələ çox var. Quranla ünsiyyət yarandıqda insanın Qurandan soruşmaq, həyatın müxtəlif məsələləri barədə Quranın sözünü bilmək və eşitmək imkanı yaranacaq. Bu, Quranla ünsiyyətin sayəsində baş verə bilər. Belə deyil ki, hər bir kəs heç bir ünsiyyət olmadan və Quranla işləmədən eləcə Quranı açsın və ondan mütləq bir mətləb tapsın. Xeyr! Bu çox zaman mümkün olmur və qəlb özünü Quranın məna və məfhumlarına yaxınlaşdıra bilmir. Ünsiyyət olduqda isə bu, həyata keçəcək. Deməli, bunlar Quranla ünsiyyət üçün .müqəddimədir

## Quran qiraətçilərinə tövsiyələr

Mən adətim üzrə əziz qiraətçilərimizə tövsiyələr edirəm. Builki tövsiyəm budur ki, bu avaz və ahənglər yaxşıdır. Bunlar Quranı könül oxşayan edir və təsirini artırır. Lakin belə gözəl səslərlə Quranı iki cür oxumaq olar. Biri budur ki, oxuyan sırf xanəndəlik edir. Bu bir cürdür. Məşhur Misir qiraətçiləri arasında bəziləri belədirlər, sırf xanəndədirlər. Yaxşı oxuyurlar, səsləri də yaxşıdır, avaz və ahəngləri də yaxşıdır. Biri də budur ki, Quranı həmin səslə, həmin avaz və ahənglə, amma elə oxuyur ki, ürəkdə Allaha təzim hissi yaranır və insan Allahı yada salır: Allahın ayələri oxunduğu zaman həmin ayələr onların imanlarını daha da artırar(١). Bu yaranmalı, qiraət insanda Allaha təzim hissi yaratmalıdır. Belələri də var. Məşhur qiraətçilərdən bəziləri belədirlər; oxumaqla Allahı yada salırlar. Buna riayət etmək lazımdır. Xüsusən siz gənclərin

Allahın lütfü ilə həm yaxşı səsiniz var, həm yaxşı bacarırsınız, həm də oxuduğunuz ayələrin mənası ilə tanış olduğunuzu anlayıram. Əvvəllər - inqilabın ilk onilliyində belə ,deyildi. Yaxşı səsi olanlar vardı, oxuyurdular



---

.Ənfal/۲ [۲۶۱] -۱

amma çox zaman mənalarına fikir vermirdilər. İndi Allaha şükür olsun ki, bu inkişaflar gənclərin səviyyəsini yüksəltmişdir. Bunlar yaxşıdır. Lakin buna da riayət edin və bunu da qiraət qaydalarınıza salın. Ayələr qarşısında zikr və təzim halı yarananda ürək Quran hidayətindən təsirlənir. Siz görürsünüz ki, insan bəzi ürəklərə nə qədər Quran ayəsi, Quran sözü oxuyursa, təsir etmir. Bəziləri isə təsirlənirlər: "Allah kimi düz yola yönəltmək istəsə, onun köksünü İslam üçün açıb genişləndirər, kimi azdırmaq istəsə, onun ürəyini daraldıb sıxıntıya salar. O, (sıxıntının şiddətindən) sanki göyə çıxar"١. Allah-Taaladan istəyək ürəyimizi elə etsin ki, Quran hidayəti və Quran işarəsi .qarşısında dərs götürsün və təsirlənsin

Quran ayələrini o qədər oxuyuruq, deyirik, bir-birimizə təkrarlayırıq, siz mənə deyirsiniz, mən sizə deyirəm; nəhayət ürəyi bu məfhumlardan təsirləndirməliyik. Misal üçün, deyirik ki, Hamılıqla Allahın ipinə (dininə, Qurana) möhkəm sarılın(١). Quranın bu təlimini dəfələrlə təkrarlamışıq və daim oxuyuruq. Bu şərafətli ayə ilahi ilham kimi bizim qəlbimizə girsə və ürəyimizə hopsa, birlik məsələsi bizim üçün əsaslı bir məsələ olar, şəxsi qərəz və məqsədlərimiz naminə böyük milli birlikləri pozmarıq. Baxın, təsiri burada görünür. Əgər Quran ayələri insanın qəlbinə girsə və ürəyinə hopsa, o zaman bizə Onunla birlikdə olanlar (möminlər) kafirlərə qarşı sərt, bir-birinə (öz aralarında) isə mərhəmətlidirlər(٢) deyəndə bunu qəbul etmək asan olar, kafirlərə qarşı tələbkar və sərt olarıq. Bunun mənası o deyil ki, insan düşməni tamamilə tapdayıb əzməlidir. Xeyr! Bəzən əzmək lazım olur, bəzən isə olmur, amma istənilən halda düşmən qarşısında sərt olmaq lazımdır. Düşmən qarşısında səngəriniz zəif olmamalı, düşmən bu tərəfə keçib təsir göstərə bilməməlidir. Digər tərəfdən isə bir-birinə (öz aralarında) mərhəmətlidirlər. Biz-birimizlə mehriban olmalı, bir-birimizlə yumşaq davranmalıyıq. Baxın, bu bir Quran göstərişidir. Nə üçün buna əməl etmirik? Nöqsan haradadır? Nöqsan budur. Əgər qəlblərimiz Quranın rəhmət və hidayətini qəbul etsə, qəlbimizi Qurana tapşırsaq, bu iş asan olar, şəxsi məqsədlər, qərəzlər, maddi mənafe, hakimiyyət hərisliyi, pul hərisliyi və dostbazlıqlar insanın bu Quran tövsiyəsini və Quran .hidayətini unutmasına, əldən verməsinə, ona arxa çevirməsinə bais olmaz

Baxın, Quranı açmaq, eşitmək və oxumaq bizi mənzil-mənzil buraya çatdırmalıdır. Belə olmalıdır. Səmavi kitab olan Quranın xüsusiyyəti belədir. Quran adi kitab deyil ki, insan

,bir dəfə oxusun. Çox gözəl! Oxuyub öyrəndik

səh:۲۳۹

---

.Ali-İmran/۱۰۳ [۲۶۳] -۱

.Fəth/۲۹ [۲۶۴] -۲

indi isə bağlayıb qoyaq yerinə. Xeyr! Bu, içməli su kimi həyat amilidir, ona həmişə ehtiyac var. Onun təsiri tədricən və zaman boyu görünür. Onun təsrinin və hidayətinin sonu yoxdur. Siz Qurandan nə qədər öyrənsəniz, açmalı yeni bir qapı, çözməli başqa bir düyün, öyrənməli başqa bir məchul qalacaq. Quran belədir. Odur ki, daim Quran oxumaq lazımdır. Bunun üçün də Quranla ünsiyyətdə olmalıyıq. Bizim gənclərimiz yaxşı səsləri və avazları ilə Quran oxusunlar və onun müxtəlif şərtlərinə riayət etsinlər. Qeyd .etdiyimiz kimi, Allahı yada salmağı da yaxşı qiraətin əsas şərtlərindən etsinlər

İlahi! Bizi Quranla yaşat, Quranla öldür, Quranla dirilt! İlahi! Bizim qəlblərimizi Quran hidayətini və mərifətini qəbul edən et! Bizi tövhid əhli et! İlahi! Məhəmməd və Ali-Məhəmməd (s) hörmətinə, bu ramazan ayını bizim xalqımıza və müsəlman ümmətə faydalı ramazan ayı et! İlahi! Quran təlimlərini İslam ümməti arasında günbəgün rəvac !ver və yay! İlahi! Öz rəhmət və əfvini bizim ölənlərimizə şamil et

.Ramazan ayının birində Quran qiraətçiləri ilə görüşdə çıxışından: ۲۰۰۹

## İmamın dəyərli yadigarı olan Qüds gününün əhəmiyyəti

Gələn cümə Qüds günüdür. Bu bizim əziz imamımızın ən dəyərli yadigarlarındandır. Bu, inqilabın və bizim xalqımızın şərafətli Qüds hadisəsinə və Fələstin məsələsinə sevgi əlamətidir. Qüds günü sayəsində biz bu adı hər il dünyada yaşada bildik. Çoxlu hökumət və siyasətlər Fələstin məsələsinin unudulmasını istəyirdilər, buna çalışdılar, pul xərclədilər. Əgər İslam Respublikasının səyi olmasaydı, əgər İslam Respublikasının bütün qüvvəsi ilə bu xəbis siyasətin qarşısında müqaviməti olmasaydı, Fələstin məsələsini tədricən gündəmdən çıxarıb ümumiyyətlə unutdurmaları mümkün idi. İndi də hegemonizmin və xəbis sionistlərin özləri etiraf edir, düşünür və narahatdırlar ki, İslam Respublikası Fələstin bayrağını ucaldıb və istədikləri sazişlərlə Fələstin məsələsini sıradan çıxarmağa qoymur. Qüds günü bu xatirənin və bu adın yaşadılması günüdür. Bu il də ilahi yardımla, ilahi hidayətlə bizim böyük xalqımız Tehranda və digər rayonlarda Qüds gününü uca tutacaq, yürüş keçirəcək. Digər ölkələrdə də bir çox müsəlmanlar Qüds günündə İran xalqı kimi edirlər. Qüds günü Qüds məsələsinə aid bir gündür və eyni zamanda İran xalqının birlik əlamətidir. Ehtiyatlı olun ki, kimlərsə Qüds günündə bu toplantılardan təfriqə yaratmaq üçün istifadə etməsinlər. Təfriqədən qorxmaq lazımdır. Təfriqə ilə mübarizə aparmaq və vuruşmaq lazımdır. Təfriqə yaranmamalıdır. İran xalqı o zaman Qüds bayrağını fəxrlə ucalda bilər ki, bir olsun. Bütün bu illərdə bunu pozmağa çalışıblar, amma Allaha şükür olsun ki, .bacarmayıblar, inşallah bundan sonra da bacarmayacaqlar

.Tehranın cümə namazı xütbələrindən: ۲۰۰۹

səh:۲۴۱

## Qədr gecəsi – insanın yeni ilinin başlanğıcı

Fitr bayramı münasibəti ilə namazda iştirak edən bütün qardaş və bacıları, bütün İran xalqını, dünya müsəlmanlarını və böyük İslam ümmətini təbrik edirəm. Müsəlman ramazan ayından mənəvi nurla xaric olur. Ramazan ayı öz orucu, onda olan zikr, dua, ilahi şükür, Quran qiraəti və mömin insanın bəhrələndiyi digər çoxlu faydalarla qəlbi işıqlandırır, insan ruhunun pasını təmizləyir. Oruc tutan mömin insan qədr gecəsindən sonra əslində yeni ilinə başlayır. Qədr gecəsində ilahi katiblər tərəfindən onun bütün illik müqəddəratı yazılır. İnsan yeni bir ilə, yeni mərhələyə, əslində yeni həyata daxil və yenidən doğulmuş olur. Bir yolla hərəkətə başlayır, təqva ehtiyatı ilə bu yola çıxır. Yol əsnasında onun yenidən yada salması üçün müxtəlif işarələr vurmuşlar. Fitr bayramı .bu işarələrlərdən biridir. Bu gündən istifadə etmək lazımdır

Fitr bayramı namazı bir cəhətdən ramazan ayındakı ilahi nemətin və bu yeni doğuşun şükrüdür. Fitr bayramı namazında Allaha dəfələrlə deyirik: Məhəmmədi (s) və onun ailəsini daxil etdiyin bütün xeyirlərə məni də daxil et! Məhəmmədi (s) və onun ailəsini xaric etdiyin bütün şərlərdən məni də xaric et! Yəni bizə bu dəyərli bəndələrinə yer verdiyin səfalı iman, əxlaq və əməl cənnətində yer ver! Bizi bu böyükləri, yaranış aləminin əzizlərini qoruduğun pis əməl, pis əxlaq və pis düşüncə cəhənnəmindən xaric et! Biz fitr bayramında özümüz üçün bu böyük məqsədi təsvir edir, Allahdan istəyirik. Təbii ki, bizim üzərimizə də vəzifə düşür və biz bu doğru yolda qalmağa çalışmalıyıq. .Bu, sözügedən təqvadır

## Ramazan ayının səmərələri

Ramazan ayının böyük səmərələrindən biri tövbə və Allah-Taalaya qayıdışdır. Şərafətli Əbu Həmzə Sumali duasında oxuyuruq ki, bizi tövbə məqamına çatdır ki, əyri yoldan, (pis əməldən, pis düşüncədən və çirkin əxlaqdan çəkinək.(١

Mübarək ramazan ayı ilə vidalaşma duasında İmam Səccad (ə) Allaha belə deyir: Bəndələrini bağışlamaq üçün bir qapı açıb adını tövbə qoyan Sənsən.(٢) Sənin əfvinə tələsmək, Sənin əfv və rəhmət nemətindən bəhrələnmək üçün bizə bir qapı açmısan. Bu qapı tövbə qapısı, ilahi əfvin səfalı cənnətinə sarı şux bir pəncərədir. Əgər Allah-Taala bəndələrinə tövbə yolunu açmasaydı, biz günahkar bəndələrin vəziyyəti çox pis

olardı. İnsan instinktlərin və nəfsin təsiri altına düşüb bəzən səhv və günah edir. Bu günahların hər biri bizim

səh:۲۴۲

---

۱- [۲۶۵] İqbal əl-əmal, c. ۱, səh: ۷۲.

۲- [۲۶۶] Səhifeyi-Səccadiyyə, dua, ۴۵, səh: ۱۹۴.

.qəlbimizə və ruhumuza vurulan bir yaradır. Əgər tövbə olmasaydı, biz nə edərdik

Əmirəlmöminin (ə) Kumeyl duasında deyir ki, əgər üzr istəmək məsələsi, Səxavətli və Rəhmli Allah tərəfindən də üzrün qəbul olunması olmasaydı, biz başımıza gətirdiyimiz günahlardan, səhvlərdən, yayınmalardan, nəfsə itaətlərdən və günahların bu ağır yükünün şərindən özümüzü necə xilas edə bilərdik? Heç bir yolumuz olmazdı. Allah-Taala bizə tövbə yolu açmışdır. Onun qədrini bilin.

Cahillik üzündən ata-anasının evindən qaçan bir gənc yenidən ata-anasının yanına qayıdarkən onların məhəbbəti və nəvazişi ilə üzləşir. Bu, tövbədir. İlahi rəhmət evinə qayıtdığımızda Allah-Taala bizi gülər üzlə qəbul edir. Ramazan ayında mömin üçün təbii şəkildə yaranan bu qayıdışı qənimət sayaq. Mən ramazan ayında gənclərin, yeniyetmələrin, qadın və kişilərin dua, Quran və zikr məclislərində iştirak etmələrinə dair fotolar gördüm. Allahı yad edərkən üzlərdə diyirlənən və axan göz yaşları çox qiymətli, çox dəyərlidir. Bunlar tövbədir. Bu tövbəni qoruyaq. Biz nəfsə pərəstiş edirik, diqqətsiz ürəklərimiz səhvə düçar olur. Ramazan ayı isə bizə özümüzü paklamaq imkanı yaradır. Bu çox dəyərlidir. Bu göz yaşları qəlbi yuyur, amma onu qoruyub-saxlamaq lazımdır. Ramazan ayında bütün bu böyük dərdləri, həlakedici və təhlükəli xəstəlikləri - bizim böyük xəstəliklərimiz olan qüruru, təkəbbürlülüyü, paxıllığı, haqsızlığı, xəyanəti, laqeydliyi müalicə etmək imkanı yaranır. Allah-Taala diqqət yetirir və şübhəsiz ki, diqqət yetirmişdir. Bu il bizdə çox yaxşı ramazan ayı keçdi, Quran, zikr, dua və moizə məclisləri təşkil olundu, müxtəlif təbəqələr, müxtəlif ictimai qruplar, müxtəlif çöhrə və görkəmdə olanlar bu məclislərdə iştirak etdilər. Bu ayda nə qədər maddi yardımlar edildi. Bu mübarək ay boyu nə qədər zəiflərə kömək olundu. Bunlar çox dəyərlidir. Bunların hər biri insanın ruhuna bir ətir bəxş edir, onun üçün bir qurtuluş yolu açır. Bunları qoruyaq. Mən tövsiyə edirəm ki, gənclər bu yumşaq ürəkləri, bu işıqlı qəlbləri qənimət saysınlar. Bu hal yuxarı yaşlarda az, gənclərdə isə çox yaranır. Bu qəlbləri qoruyun. İlk vaxtda namaz qılmaq, məscidlərə getmək, Quran oxumaq, Quranla ünsiyyət qurmaq, İslam bilgilərinin xəzinəsi olan və Əhli-beytdən (ə) nəql .olunmuş dualarla ünsiyyət qurmaq səadətini qənimət sayın

### Əxlaqın və cəmiyyətdə bədgümanlığın qarşısını almağın əhəmiyyəti

Öz əxlaqımızla məşğul olaq. Əxlaq əməldən də əhəmiyyətlidir. Biz cəmiyyətdə qardaşlıq, mehribanlıq və etimad ab-havası yaratmalıyıq. Mən

cəmiyyətdə bədgümanlığın yayılması ilə əsla müvafiq deyiləm. Biz bu adətləri özümüzdən uzaqlaşdırmalıyıq. Təəssüf ki, bu gün günbəgün daha artmaqda, genişlənməkdə və mürəkkəbləşməkdə olan müxtəlif informasiya vasitələrinin, qəzetlərin və media qurumlarının bir-birini ittiham etməsi geniş yayılmışdır. Bu yaxşı hal deyil; bizim qəlbimizi qaraldır, həyatımızı zülmətə çevirir. Heç bir ziddiyyəti yoxdur ki, günahkar öz günahının cəzasını çəksin, lakin mühit günahlandırmaq, ittiham etmək, şayiə və xəyallarla digərlərini günahlandırmaq mühiti olmasın. Mən burada bunu da deyim: Televiziyadan yayımlanan məhkəmə iclaslarında bir müttəhimin başqa bir şəxs haqqında nəsə deməsi şəriət baxımından mötəbər sayılmır. Bəli, müttəhim məhkəmədə özü haqda nə desə, mötəbərdir; özü barədə etdiyi etiraflar mötəbər sayılır. Müttəhimin bir məhkəmədə kamera önündə, milyonlarla tamaşaçı qarşısında öz əleyhinə etdiyi bütün etiraflar şəriət və el adətləri baxımından məqbuldur, keçərlidir, digəri haqda dedikləri isə qəbul olunmur. Cəmiyyəti ittiham və şübhə ilə doldurmaq olmaz. Quran buyurur: Məgər o yalan sözü eşitdiyiniz zaman mömin kişilər və qadınlar öz ürəklərində yaxşı fikirdə olub: "Bu, açıq-aydın bir böhtandır!" – deməli deyildilərmi? Birinin ittiham edildiyini eşitdikdə nə üçün bir-birinizə qarşı bədbin olursunuz? İcra və məhkəmə orqanlarının vəzifəsi öz yerində. İcra orqanları cinayətkarı təqib etməli, məhkəmə orqanları isə qanunlarımızda göstərilən şəkildə cəzalandırmalıdır. Bu işdə səhlənkarlığa yol vermək olmaz. Lakin qanuni yollarla cinayəti sübut olunmuş cinayətkarın cəzalandırılması gümanla, xəyalla və böhtanla birini ittiham və bədnam etməmizdən, cəmiyyətdə ağızlara salmamızdan fərqli bir şeydir. Belə olmaz. Bu düzgün deyil. Yaxud digərləri – xaricilər, əcnəbilər və qərəzli televiziya kanalları bir şəxsin, yaxud şəxslərin əleyhinə danışır, filan yerdə xəyanət etdiyini, filan yerdə səhvə yol verdiyini iddia edirlər. Biz də onu eynilə yaymalıyıq?! Bu zülmdür, məqbul deyil. Əcnəbi informasiya vasitələrinin nə zaman bizə ürəyi yanmışdır?! Nə zaman bizim haqqımızda həqiqətləri söyləmişlər ki, indi də söyləmiş olsunlar?! Deyirlər, danışırlar, iddia edirlər. Bunları şəffaflıq adlandırmaq olmaz. Bu, şəffaflıq deyil, şübhə yaratmaqdır. Şəffaflığın mənası budur ki, İslam Respublikasında bir məmur öz işlərini açıq şəkildə xalqın ixtiyarına qoysun. Şəffaflığın mənası budur və bunu etməlidirlər. Lakin bizim sübut olunmadan onu-bunu ittiham etməyə, doğruluğu mümkün olan, lakin hələ sübuta yetməmiş məsələləri kiməsə aid etməyə haqqımız çatmır. Bu onu müttəhim edir, o bunu; əcnəbi mediadan, qərəzli İngiltərə mediasından

faktlar göstərirlər, sonra da o tərəfdən biri peyda olub bütün quruluşu İslam quruluşuna yaraşmayan şəkildə ittiham edir. İslam quruluşunun məqamı bəzilərinin aid etdiklərindən olduqca

ucadır. Bu irad onlara daha çox yapışır. Bir şəxsə böhtan atmaq günahdır, bir İslam quruluşuna, bir təşkilata böhtan atmaq isə olduqca böyük günahdır. İlahi! Öz təqvanla !bizi günahlardan uzaqlaşdır

.Fitr bayramı namazının xütbələrindən: ۲۰۰۹

## Quran təlimlərindən bəhrələnməyin zəruriliyi

Allah-Taalaya şükür edirik ki, Öz lütfü və mərhəməti ilə bizim ömrümüzü uzadıb çox şirin, təsirli və səmərəli olan bu məclisdə bir də iştirak edib əziz qiraətçilərimizin Quran qiraətindən bəhrələnmək səadətini bizə nəsib etdi. Məncə cəmiyyətimizdə Qurana .marağın artması o qədər böyük nemətdir ki, bəlkə heç bir nemət ona bərabər deyil

Bugünkü məclis çox yaxşı məclis idi. Möhtərəm qiraətçilərin - istər bu gün qiraət edən ustadların, istər bu sahəyə yeni qoşulan, parlaq istedadları, səsləri və həvəsləri ölkə üçün daha yaxşı gələcəyi müjdələyən əziz gənclərin qiraəti gözəl idi. Allah-Taala bizə bu neməti vermişdir: Lakin Allah sizə imanı sevdirmiş, onu ürəklərinizdə süsləmiş, küfrə, günaha və itaətdən çıxmağa qarşı sizdə nifrət oyatmışdır(١). Allahın imanı və onun atributlarını bizim xalqımıza sevdirməsi, onu qəlblərimizdə zinətləndirməsi çox böyük nemətdir. Qurandan sözün həqiqi mənasında istifadə etmək istəyiriksə, onun təlim və məfhumları ilə tanış olmalıyıq. Bu qiraət, bu Quran hissi və Quranla ünsiyyət bizə bu cəhətdən kömək edir. Əgər Qurandan dərs götürmək məsələsi olmasaydı, onu oxumağı bizə bu qədər tövsiyə etməzdilər. Diqqət yetirməliyik ki, məqsəd havada bu səs dalğalarının yaranıb yayılması deyil. Məqsəd bu da deyil ki, gözəl səslə oxunan bir şeirdən həzz aldığımız kimi, Quranı da gözəl səslə oxusunlar və biz ondan həzz alaq. Bunlar məqsəd deyil. Bütün bu müqəddimələr – qiraət, gözəl səs, gözəl avaz, cəmiyyətdə qiraəti təbliğ edən və insanlarda rəğbət yaradan bu amillər Quranın .təlimlərini dərk etməkdən ötrüdür

## Quran təlimlərinin dərəcələri

Quran təlimlərini dərk etməyin dərəcələri vardır. Birincisi Quranın sözləri və tərcüməsi üzərində düşünməklə hasil olur. Yəni biz Quran təlimləri deyəndə mənası yeddi qat dərinlikdə olan sirli bir şey deyil ki, heç kəs ona nail ola bilməsin. Düzdür, bizim kimilərin başa düşmədiyi dərin məsələlər var, amma çoxlu məsələlər də var ki, biz adi insanlar bu sözlərə diqqət yetirmək şərti ilə onları anlaya və onlardan istifadə edə bilərik. Quranın müqəddəs ayələrində belə məsələlər çoxdur. Bunlar bizim həyatımızın dərsləridir. Misal üçün, bu şərafətli ayədə buyurur: (Ey Peyğəmbər!) Sənə beyət edənlər, şübhəsiz ki, Allaha beyət etmiş olurlar. Allahın (qüdrət) əli onların əllərinin

üstündədir. Kim (beyəti) pozsa, ancaq öz əleyhinə pozmuş olar (bunun zərəri yalnız onun özünə dəyər). Kim Allahla etdiyi əhdə vəfa etsə, (Allah) ona böyük mükafat (verər!(۲)



---

۱- [۲۶۷] Hucurat/۷.

۲- [۲۶۸] Fəth/۱۰.

Bu bizim həyatımız üçün aydın dərsdir. Əgər Peyğəmbərlə və İslamla bağladığınız əhdi, Allaha etdiyiniz beyəti pozsanız, sındırsanız, öz zərərinizə etmisiniz. Allah və Peyğəmbərlə (s) beyəti sındırmaq bizim zərərimizə olan işdir, Allahın və Peyğəmbərin (s) zərərinə deyil. Onlar ziyan görmürlər. Əgər bu müqaviləyə sadiq qalsaq, öz xeyrimizə sadiq qalmışıq və özümüz Allah-Taaladan böyük mükafat alacağıq. Bu mükafatın axirətdə veriləcəyini, yaxud cənnətdən ibarət olduğunu deməyiblər. Əsas hissə təbii ki, axirətdədir, amma bunun üçün bizə dünyada da mükafat veriləcək. Burada mübarək Əhzab surəsinin bu ayələri oxundu: Möminlərin içərisində elələri vardır ki, Allaha etdikləri əhdə sadiq olarlar. Onlardan kimisi (bu yolda) şəhid olmuşdur, kimisi də (şəhid olmasını) gözləyir. Onlar (verdikləri sözü) əsla dəyişməzlər ki, Allah (bununla) sadiqləri sədaqətlərinə görə mükafatlandırsın.(١) Bu sədaqət odur. Yəni Allahla bağladıqları bu əhd-peymanı sədaqətlə bağladılar və onun üstündə durdular. Həyatın çətinlikləri və dünyanın gözəllikləri onları bu yoldan yayındırmadı. Allah bu sədaqətə, bu ilahi sözün və əhdin üzərində durduqlarına görə mükafat verir. Bunlar elə məsələlərdir ki, Quranın zahirinə baxmaqla onları anlamaq olar; baxmayaraq ki, bunların arxasında daha dərin məsələlər var. Onları xüsusi insanlar, Allahın saleh və layiqli bəndələri anlaya bilirlər, biz anlamırıq. Biz yalnız həmin bəndələrin vasitəsi ilə anlayırıq. Şübhəsiz ki, belə şeylər var. Buyurublar ki, Quranın dərin qatları var. Çoxlu hədislərdə deyilir ki, Quranın zahiri və batini, sirləri, dərinlikləri var. Zahirdə yalnız suyu görünən bir dərya kimidir, amma yalnız bundan ibarət deyil, dərinliyi var, dərinliklərində də bəzi şeylər var. Şübhəsiz ki, Quran belədir, amma biz onun .zahirindən istifadə edə bilərik. Hansı şərtlə? Diqqət və düşünmək şərti ilə

## Quranın mənasını anlamağın zəruriliyi

Biz bir neçə ildir bir məsələni dönə-dönə təkrarlayırıq və xoşbəxtlikdən, nəticəsi olmuşdur və görünür. Bir daha deyirik ki, siz oxuduğunuz ayələrin mənasını yaxşı dərk edin, ərəb dilini bilən bir insanın anladığı zahiri mənanı düzgün anlayın. Mənası bilinəndə qiraət zamanı insana düşünmək imkanı yaranır və o, oxuduqları haqda təfəkkür edə bilir. Mən sizə deyirəm ki, ayənin mənasını bilməyin özü səsi, avazı və ahəngi tənzimləyir. Əgər biz nə oxuduğumuzu bilsək, hansısa məşhur qiraətçinin bu ayəni oxuyanda harada zilə qalxdığını və harada bəmə düşdüyünü öyrənməyimiz lazım olmayacaq. Əgər mənanı anlasa, bunun özü gözəl və münasib səsi olan adamın

avazını yönəldər, adi danışıqda olduğu kimi, özü intonasiyanı tənzim edər. Adi danışıqda sizin



---

.Əhzab/۲۳-۲۴ [۲۶۹] -۱

səsiniz bir yerdə zəifləyir, bir yerdə ucalır, bir yerdə asta söhbət edirsiniz, bir yerdə tez-tez danışırsınız və sair. Öncədən bunun üçün heç bir musiqi notu yazılmayıb. Bu sizin hiss və duyğularınıza uyğundur. Əgər oxuduğunuz Quran ayəsinin mənasını bilsəniz, həmin duyğular nə etməli, haranı asta oxumalı, harada dayanmalı, haradan başlamalı olduğunuzu deyəcək. Quran ayələrinin mənasını bilmək insana bu məharəti verir. Düzdür, Quran ayələrini anlayan bəzi şəxslərdə bu yoxdur. Özləri ərəb olduqlarına görə ayənin tərcüməsini yaxşı bilirlər, amma sanki mənaya diqqət yetirmədən oxuyurlar. Məşhur Misir qiraətçilərindən bəziləri elə oxuyur ki, sanki bir mətni verib oxumasını tapşırıblar; o da əvvəldən axıra qədər oxuyur və dinləyici ilə onun arasında əlaqə yaranmır. İnsan bəzi qiraətçilərdə bunu görür. Bəziləri isə .oxuyarkən sanki dinləyici ilə danışır. Sizin qiraətiniz belə olmalıdır

Təəssüf ki, xalqımızın əksəri ərəb dilini bilmədiklərinə Qurani-kərimin ayələrindən birbaşa istifadə edə bilmirlər. Bu bizim çatışmazlıqlarımızdan biridir. Bu səbəbdən ərəb dilini öyrənmək ölkə qanunlarında vacib məsələlərdən biri kimi nəzərdə tutulmuşdur. Hər halda, ərəb dilini bilməyən adi insanlar həqiqətən Quranın mənasını anlamaq .istəyirlərsə, təfsir və tərcümələrə müraciət edə bilərlər

Xoşbəxtlikdən, bu gün yaxşı tərcümələr var. Ölkədə bəzi şəxslər zəhmət çəkib yaxşı tərcümələr etmişlər. Hər halda, Quranı gözəl səslə oxuyan siz əziz qardaşlara tövsiyəm budur ki, bunu yaddan çıxarmayın və Quran oxuyarkən mənasına diqqət yetirin. Elə oxuyun ki, sanki sizi eşidən tərəf-müqabiliniz və dinləyicinizlə danışırsınız. Əgər belə olsa, siz oxumanızdan, insanlar da qiraətinizi eşitməkdən fayda .götürəcəklər

Ümidvarıq Allah-Taala bizim xalqımız arasında Quran dərkinin, Qurandan faydalanmağın və Quran təlimlərini anlamağın dairəsini günbəgün genişləndirsin, bizə .Quran həzzini və bərəkətlərini əta etsin

Mən bu tövsiyəni mütləq edim ki, qiraətçi dostlar Quranın tərcüməsi üzərində işləsinlər, buna həqiqətən tam yiyələnsinlər. Quranı əzbərləmək də bu sahədə çox !əhəmiyyətlidir. Allah sizə uğur bəxş etsin və yardımçı olsun

.Ramazan ayının birində Quranla ünsiyyət məclisindəki çıxışdan: ٢٠١٠

## Məsumlardan nəql olunan dualarda ramazan ayının xüsusiyyətləri

İstər Səhifeyi-Səccadiyyə kitabında, istərsə də məsumlardan nəql olunan digər dualarda ramazan ayı üçün bəzi xüsusiyyətlər qeyd olunmuşdur. Bunların hər biri diqqətəlayiqdir: Ramazan tövbə ayıdır – mən tövbə haqda bir neçə cümlə deyəcəyəm. Ramazan İslam - təslim olmaq ayıdır. Burada İslam sözündə məqsəd şərafətli ayədə deyiləndir: Kim yaxşı əməl sahibi olub özünü (səmimi-qəlbdən) Allaha təslim edərsə, o artıq ən möhkəm ipdən (Qurandan, imandan) yapışmış olur(١). İslam qəlbi və canı təslim etmək, ilahi iradə, ilahi hökm və şəriət qarşısında tabe olmaqdır. Qeyd olunan xüsusiyyətlərdən biri onun pakedici ay olmasıdır. Yəni bu ayda insanı paklayan amillər mövcuddur. Bunu belə də tərcümə etmək olar: çirkablardan paklanma ayı. Başqa bir xüsusiyyət saflaşmaq ayı olmasıdır. Ucuz metallarla qarışmış qiymətli bir filizi, məsələn, qızılı əridib saflaşdırırlar. Bu da insanın pak mahiyyətini qatqılardan və .çirkablardan ayırır. Bunlar ramazan ayı üçün deyilən xüsusiyyətlərdir

Belə görünür ki, il ərzində, ilin ayları və günləri arasında ramazan ayı sutka ərzindəki namaz vaxtları kimidir. Müqəddəs İslam şəriətində bizə namaz vaxtları verilmişdir. Sübh, günorta, ikindi, günbatan və axşam vaxtları qəlbdə və ruhda mənəviyyat yaratmaqdan ötrü özünü xəlvətə çəkmək fürsəti və bir siqnaldır. Maddiyyata qərq olmamaq, bir anlığa onun əsarətindən çıxıb nəfəs dərmək, mənəviyyatı yada salmaq və daim maddiyyat içərisində qalmamaq üçün sutka ərzində bizə namaz saatları ayırmışlar. Belə görünür ki, bütün il üçün ramazan ayı da belə bir şeydir, ruhun nəfəs dərməsidir. Bu biraylıq uzun riyazətlə ruh onu əhatə edən maddi amillər qəfəsindən xilas olub qurtulur və nura boyanır. Müqəddəs şəriət ramazan ayını bunun üçün təyin .etmişdir. Bu bir fürsətdir

Hamısı mühüm olan bu xüsusiyyətlər arasında mənim daha çox diqqətimi çəkən onun tövbə ayı olmasıdır. Ramazan ayı tövbə ayıdır. Tövbə yanlış bir yoldan, yanlış bir işdən, yanlış bir düşüncədən qayıdış deməkdir, Allaha doğru qayıtmaqdır. Bu tövbə öz daxilində təbii bir mənanı ehtiva edir. Biz yanlış yoldan qayıtmaq istəyiriksə, ilk növbədə yanlış cəhəti, yanlış yolu tanımalıyıq. Bu çox mühüm məsələdir. Biz hərəkət zamanı çox vaxt öz işimizə, səhvimizə və təqsirimizə diqqət yetirmirik, işlərdə mövcud olan qüsurlarımızı görmürük. Burada söhbət həm şəxsi, həm də ictimai subyektlərdən

gedir; öz xalqımız, partiyamız, cinahımız. İnsanın özünə aid olan nöqsanlar çox zaman gözündən yayınır. Odur ki, bizim nöqsanlarımızı başqaları bizə deməlidir. Əgər özümüz anlayıb düzəltsəydik, növbə başqalarına çatmaz, digərlərinin deməsinə ehtiyac



---

۱- [۲۷۰] Loğman/۲۲.

qalmazdı. Tövbənin birinci addımı odur ki, nöqsanımıza diqqət yetirək, nəyin qüsurlu olduğunu anlayaq, səhvimizin harada, günah və təqsirimizin nədə olduğunu bilək və özümüzdən başlayıb daha geniş ictimai dairələrə çataq. Əvvəl özümüzü sorğuya çəkək, görək harada səhv etmişik. Bu, işlərində nöqsanın, günahın və səhvin çox olduğu bizim kimi adi insanlardan tutmuş böyük şəxsiyyətlərə, Allahın saleh bəndələrinə, hətta övliyalara qədər hamının vəzifəsidir. Onlar da belədirlər. Onların da bağışlanmaq istəməyə və tövbəyə ehtiyacları var. Həm şiə, həm sünni rəvayətçiləri əziz İslam Peyğəmbərindən (s) nəql etmişlər ki, buyurur: "Bəzən mənim qəlbim tutulur".(١) Burada işlənən "yuğanu" sözü buludun günəşin önünü tutması üçün işlənir. Yəni nisbi bir qaranlıq haləti yaranır və işığın qarşısı tutulur. Buyurur ki, bəzən mənim qəlbim tutulur, dumanlanır və mən hər gün yetmiş dəfə Allahdan bağışlanmaq istəyirəm.(٢) Bu cümləni müqəddəs ruha malik olan müqəddəs Peyğəmbər (s) buyurur. Başqa bir hədisdə deyilir ki, Allahın rəsulu (s) hər gün yetmiş dəfə tövbə edirdi. Burada tövbə sözü işlənmişdir. İmam Sadiqdən (ə) nəql olunmuşdur ki, Peyğəmbər (s) günah etmədiyi halda hər gün yetmiş dəfə tövbə edirdi. Peyğəmbər (s) məsumdur, nəyə görə tövbə edir? Mərhum Feyz yazır ki, Peyğəmbər (s) və canişinlərinin günahları bizim günahlarımız kimi deyil, onlar daimi zikri tərk edib halal işlərlə məşğul olduqlarına görə tövbə edirlər. Peyğəmbər (s) və ya canişini üçün küçədə, bazarda, adi həyatda bir anlıq unutqanlıq baş verə bilər. Bizim həyatımızın əksəriyyətini təşkil edən bu hal onlar üçün bir anlıq yarana bilər, halal bir işə başı qarışa bilər. Peyğəmbər (s) bunun üçün .bağışlanmaq istəyir. Deməli, bu yalnız bizə məxsus deyil, hamı üçündür

Tövbə yüksək vəzifəli şəxslərə daha çox lazımdır. Yəni ölkənin hansısa bir sahəsində vəzifəsi, təsiri, yaxud xüsusi bir ictimai dairədə nüfuzu olan bizim kimilərin bağışlanmaq istəyi, tövbə və Allaha qayıdış sarıdan vəzifəsi daha ağırdır. Biz çox ehtiyatlı olmalıyıq. Bəzən hətta tabeliyimizdə olan orqanlarda qanun pozuntusu baş verir. Əgər bu qanun pozuntusu hansısa formada bizə aid olsa, biz məsuliyyət daşıyırıq. Məsələn, qanunu çatdırmaqda, yaxud filankəsi vəzifəyə təyin etməkdə diqqətsizliyə yol vermiş, qanun pozuntularına səhlənkar yanaşmış və belə bir işin baş verməsinə bais olmuşuq. Özünüzü və ailənizi yanacağı insanlardan və daşlardan .(ibarət olan oddan qoruyun(٣

Deməli, nəticə bu oldu ki, ramazan ayında öz imkanımız həddində ehtiyatlı olmalı, rəftarımızı, düşüncəmizi, sözümüzü, əməlimizi düzəltməliyik, nöqsanları axtarıb tapmalı və aradan qaldırmalıyıq. Bu düzəltmə hansı istiqamətdə olmalıdır? Təqva istiqamətində. Şərafətli oruc ayəsində buyurulur: Oruc tutmaq sizdən əvvəlki ümmətlərə vacib edildiyi kimi, sizə də vacib edildi ki, (bunun vasitəsilə) təqvalı olasınız.(۱) Oruc təqva üçündür. Buna görə də mübarək ramazan ayında görülən işlər .təqva istiqamətində olmalıdır

## Təqvanın geniş cəhətləri

Mən təqva barədə bir cümlə qeyd etmişəm. Çox vaxt təqva deyəndə şəriətin zahiri məsələlərinə, haram və vaciblərə əməl etmək yada düşür; yəni namaz qılaq, şəriət ödənclərimizi verək, oruc tutaq, yalan danışmayaq. Sözsüz ki, bunlar mühüm məsələlərdir, lakin təqvanın bizim çox zaman diqqət yetirmədiyimiz digər cəhətləri də var. Şərafətli Məkarim əl-əxlaq duasının bir hissəsində bu cəhətlər izah edilmişdir. Allah-Taaladan istəyir ki, İlahi, məni salehlərin zinəti ilə bəzə və təqvalıların libasına bürü. Təqvalıların libası nədir? Bu zaman maraqlı şərh gəlir: (Təqvalıların libası) ədaləti yaymaq, qəzəbi udmaq, (insanlar arasında ixtilaf) alovunu söndürmək və ayrılanları birləşdirməkdir.(۲) Bunlar Səhifeyi-Səccadiyyənin iyirminci duası olan şərafətli Məkarim əl-əxlaq duasında göstərilən təqva nümunələridir. Bu dua çox mühüm duadır. Mən təklif edirəm ki, hamı, xüsusən də vəzifəli şəxslər bu duanı oxuyub, məzmununa diqqət yetirsinlər. Ardınca buyurur ki, ara vurmaq, xəbər aparmaq, bunu onun canına, onu bunun canına salmaq əvəzinə münasibətləri yaxşılaşdırsınlar, .mömin və müsəlman qardaşlar arasında ülfət yaratsınlar. Bunlar təqvadır

Baxın, bunların hamısı bizim bugünkü məsələlərimizdir. Ədaləti bərqərar etmək - məhkəmə ədaləti, iqtisadi ədalət, seçkilərdə ədalət, ölkənin sərvət və imkanlarını qruplar arasında bölməkdə ədalət, coğrafi ədalət – bunlar çox mühüm məsələlərdir. Bizim bunların hamısına ehtiyacımız var. Ədaləti bərqərar etmək təqvanın ən üstün cəhətidir. Bu, yaxşı bir namazdan, isti yay günlərində bir orucdan da üstündür. Hədisdə deyilir ki, hər hansı bir əmirin ədalətlə hökm etdiyi bir gün yetmiş il ibadət kimidir. Əmir sizlərsiniz - yəni fərmanınız altında bir təşkilat var və orada sözünüz keçir. Çox mühüm .olan bu məsələlər ədalətin və ədalətli rəftarın əhəmiyyətini bizə göstərir

Başqa bir məsələ dostlar qarşısında qəzəbi udmaqdır. Burada söhbət dostlardan gedir. Düşmənlər qarşısında əlbəttə ki, qeyzli olmaq lazımdır: Və onların (müşriklərin əlindən əziyyət çəkən müsəlmanların) qəlblərindən qəzəbi silib aparsın[۱]. Sizin kimliyinizlə və varlığınızla müxalif olan düşmənə qarşı qəzəb müqəddəs qəzəbdir, onun eybi yoxdur. Möminlərə, müsəlman kimi rəftar etməyə əmr olunduğumuz insanlara qarşı qəzəb və əsəbilik isə yolverilməzdir. Qəzəb insana ziyan vurur. Qəzəblə qərar vermək zərərlidir, danışmaq zərərlidir, işləmək zərərlidir və çox zaman səhvlə nəticələnir. Bizdə təəssüf ki, belə hallar çox görünür. Yayınmaya, düşüncə və əməldə .səhvə bais olan qəzəbin qarşısını almaq təqva nümunələrindən biridir

Başqa bir məsələ alovu söndürməkdir. Bəzi adamlar siyasi və cinah ixtilafları yaradırlar. Bəzi adamlar sanki bu işə təyin olunmuşlar. Mən görürəm ki, öz ölkəmiz daxilində bəzi adamlar ümumiyyətlə müxtəlif qüvvələri, müxtəlif cinahları, onların hər birindən olan insanları bir-birinin canına salıb ixtilaf yaratmağa çalışır və sanki bundan xoşlanırlar. Bu, təqvanın ziddinədir. Təqva ixtilafları yatırtmağı tələb edir. Siz fiziki .alovları söndürdüyünüz kimi, insani, mənəvi və əxlaqi alovları da söndürməlisiniz

Başqa bir cəhət də ayrılanları cəlb etməkdir. Biz dedik ki, maksimum cəzb, minimum dəf etmək lazımdır. Əlbəttə, bu işdə meyar prinsip və dəyərlərdir. İnsanlar iman baxımından eyni deyillər. Bizim aramızda imanı zəif olanlar var, güclü olanlar var. Gərək yola gedək. İmanı zəif olanı dəf etmək və yalnız imanı güclü olanlara göz dikmək olmaz. Xeyr! Zəifləri də nəzərə almaq lazımdır. Özlərini güclü bilən şəxslər zəif hesab etdiklərini nəzərə alsınlar, özlərindən uzaqlaşdırmasınlar. Xətdə olan, lakin səhv və diqqətsizlik səbəbindən kənara çəkilib ayrılan şəxsləri özlərinə gətirsinlər, onlara nəsihət versinlər, istiqamət və yol göstərsinlər və geri qaytarsınlar. Bunlar mühüm .məsələlərdir

Bunlar təqvadır, tövbə yollarıdır. Bu ay tövbə və Allaha qayıdış ayıdır. Maraqlı burasıdır ki, oruc tutmaq və bu aydan istifadə ümumi məsələlərdir, fərdi məsələlər deyil. Yəni hamımız orucuq, hamımız bu aya daxil olmuşuq, hamımız bu süfrə başında əyləşmişik; İslam cəmiyyətinin və İslam ümmətinin bütün fərdləri. Əgər bu nəsihətlərə, kitab və sünnənin bu mühüm tövsiyələrinə əməl etsək, hamı özünü onun müraciət tərəfi bilsə, görün İslam dünyasında necə möhtəşəm hadisə baş verər; daha məhdud dairə olan

ölkədə necə möhtəşəm hadisə baş verər. Bu ayın qədrini bilmək lazımdır. Qədrini bilmək odur ki, bu



---

۱- [۲۷۶] Tövbə/۱۵.

ayı həqiqətən tövbə ayı, Allaha qayıdış ayı, paklanma və saflaşma ayı edək və belə .işlərlə məşğul olaq. Bu məclis üçün bizim əsas sözümüz bunlardır

.Quruluşun məsul şəxsləri ilə görüşdə çıxışından: ۲۰۱۰

səh:۲۵۳

Siz gəncsiniz, ürəkləriniz pakdır, təmizdir. Siz indi bunun mənasını yaxşı anlamırsınız, çirkli ürəklərin problemindən xəbərsizsiniz. Siz gənc olduğunuza görə hələlik bunları dərk etmirsiniz. Bizim yaşlarımıza çatanda problemi anlayacaq və gənclik dövründə .qəlbin təmizliyinin nə qədər qiymətli olduğunu biləcəksiniz, amma onda gec olacaq

Siz bu gün bu sərvətə maliksiniz. Mənim sözüm budur: Bu pak və təmiz qəlbləri bacardığınız qədər əzəmət, həqiqət və gözəllik mənbəyi olan Allah-Taalanın müqəddəs zatı ilə birləşdirin, Ona yaxınlaşdırın. Əgər bunu bacarsanız, ömrünüzün sonuna qədər xoşbəxt həyata sahib olacaqsınız. Əgər indi bunu bacarmasanız, iyirmi ildən sonra çətin olacaq. Əgər iyirmi ildən sonra - ۴۰-۴۵ yaşınızda bacarmasanız, ondan iyirmi il sonra çox-çox müşkül olacaq. Yəni mənim indiki yaşımdan bir qədər az yaşlarda çox çətin olacaq; qeyri-mümkün yox, amma müşkül olacaq. İndidən qəlbinizi Allaha yönəldin. Müqəddəs şəriətdə bunun yolu açıqdır, sirli və mürəkkəb məsələ deyil. Siz aşağıdan dağın zirvəsinə baxıb orada kimlərisə görəndə onların oraya uçub getdiklərini düşünmürsünüz. Xeyr! Bunlar sizin önünüzdə olan yolla getmiş və oraya çatmışlar. Xəyalata qapılıb zirvələrə qeyri-adi yolla çatmağın mümkünlüyünü düşünməyək. Xeyr! Zirvələrdə gördüyünüz şəxslər bu yollarla getmişlər. Bu yollar hansılardır? Birinci növbədə günahı tərk etmək. Bunu demək asan, əməli isə çətin və mütləq lazımdır. Yalan danışmamaq, xəyanət etməmək, müxtəlif cinsi səhvlərdən, günahlardan çəkinmək - ən mühüm addım budur. Günahı tərk edəndən sonra vacibləri yerinə yetirmək və birinci növbədə namaz qılmaq lazımdır: Bil ki, sənin hər bir əməlin namazına tabedir.(۱) İnsanın bütün işləri namaza tabedir. Namazı vaxtında, diqqətlə və qəlbin hüzuru ilə qılın. Qəlbin hüzuru odur ki, bir nəfərlə, bir tərəf-müqabillə danışdığınızı biləsiniz. Əgər özünüzdə bu halı və bu diqqəti yarada bilsəniz, ömrünüzün sonuna qədər sizinlə qalacaq. Qeyd etdiyim kimi, indi bacarmasanız, iyirmi ildən sonra çətin, daha iyirmi il sonra daha çətin, daha sonra isə çox-çox çətin olacaq. İndidən namaz qılarkən özünüzdə bu diqqəti yaratmağa çalışın. O zaman bu namaz sizi çirkin və bəyənilməz işlərdən çəkindirəcək.(۲) Onun çəkindirməsinin mənası bu deyil ki, önünüzdə bir maneə yaradacaq və siz günah edə bilməyəcəksiniz. Xeyr! Yəni daim sizə deyəcək ki, günah etmə. Əgər insanın daxilindən ona gündə bir neçə dəfə günah .etmə! deyilsə, günah etməz. Namaz budur

Ramazan ayının orucu çox faydalı fürsətdir, aclıq, susuzluq, istilik və çətinliklərlə mübarizədir. Bundan əlavə, Quranla, Nəhcül-bəlağə ilə, Səhifeyi-Səccadiyyə ilə, dua, .nafilə, gecə namazı və bacardığınız hər bir müstəhəb işlə ünsiyyət qurun

Sizdə olan bu nurlu və pak qəlbin qədrini bilin. Bunu sizin xoşunuza gəlməkdən ötrü demirəm. Xeyr! Dünyanın gəncləri yalnız siz deyilsiniz. Gəncliyin xüsusiyyəti belədir, qəlbiniz pakdır. İndi sizin müqayisə imkanınız olmadığından bunu hiss edə bilmirsiniz, zaman ötdükcə problemlər, toz-dumanlar və paslar qəlbi bürüyür. Hədisdə deyilir ki, bir günah etdiyinizdə qəlbinizdə bir qara nöqtə yaranır, – təbii ki, bu, məcazi mənadadır – ikinci günahı etdiyinizdə bu nöqtə iki dəfə çoxalır. Günah etdikcə bu nöqtələr daim artır və nəhayət bütün qəlbi qaraldır. İndi sizin hazırlıqlı qəlbiniz və ruhunuz vardır. Getdikcə günahlar baş verir, insanın həyatında çoxlu problemlər yaranır; siyasətdə, iqtisadiyyatda, bir tikə çörəkdə, həyat imkanları əldə etməkdə. Əgər insan indidən vərdiş etməsə, bunlar problemləri çoxaldıb qəlbi qaraldacaq. Deməli, bizim birinci və əsas sözümüz budur. Siz mənim övladlarım kimisiniz. Əgər mən öz doğma övladlarıma ən yaxşı tövsiyələr etmək istəsəm, sizə dediklərimi .deyərəm

Diqqətli olun. Hamısını demirəm, amma müxtəlif sahələrdə insanların etdiyi əksər səhvlər bu əsas və mühüm məqama riayət etməməkdən yaranır. Hətta cihadda da belədir. Bildiyiniz kimi, Ühüd döyüşündə bir qrup müsəlman səhlənkarlıq etdi və faciə yarandı. Əgər Ühüd döyüşünün hadisələrini oxumamısınızsa, tarix kitablarında oxuyun. Mən burada şərh etmək istəmirəm. Quran onlar haqda buyurur: (Ühüd müharibəsində) iki ordu qarşılaşdığı gün sizdən üz döndərənləri şeytan, məhz etdikləri bəzi əməllərlə yoldan çıxmağa məcbur etdi(۱). Yəni Ühüd döyüşündə düşmənə arxa çevirən, faciənin yaranmasına, Seyyidüş-şühəda Həmzənin və digər böyük səhabələrin şəhidliyinə səbəb olan şəxsləri şeytan öncədən etdikləri günahlar səbəbindən buna vadar etdi. Quranda belə ayələr çoxdur. Günahdan çəkinməmək öz təsirini ölkə idarəçiliyində olsaq, orada, bir sahənin müdiriyyətində çalışsaq, həmin sahədə, döyüşdə olsaq, döyüşdə, maliyyə və iqtisadi sınaqlarda olsaq, uyğun yerlərdə göstərir. Odur ki, bizim əsas sözümüz budur. Qısaca deyirəm ki, gəncliyin qədrini bilin, pak qəlblərin qədrini bilin, Allahla daha çox ünsiyyət qurun. Bunun yolu günahı tərk

etmək və namaza diqqət yetirməkdir. Vacib namazlardan və qeyd etdiyim diqqətdən sonra müstəhəb əməllərlə, dualarla və



---

۱- [۲۷۹] Ali-İmran/۱۵۵.

.digər yaxşı işlərlə bacardığınız qədər məşğul olun. İnşallah Allah-Taala da yolları açar

.Ramazan ayının on birində tələbələrlə görüşdə çıxışından: ۲۰۱۰

## Ramazının gündüz və gecələrinin qədrini bilmək

Ramazan ayının son günləridir. Bizim xalqımızın, o cümlədən sizin qəlbiniz və ruhunuz pakdır, ibadət və zikr halındadır. Bu gündüz və gecələrin dualarında oxudunuz ki, İlahi, ramazan ayının gecələri ötdü, gündüzləri keçdi və biz bu gecə-gündüzlərdə Sənin rəhmət və lütfünü nə qədər cəlb etdiyimizi bilmirik. İlahi, əgər bu ana qədər Sənin !razılığını qazana bilməmişiksə, bu an Öz razılığını bizə şamil et

Mənəvi paklıq hamı üçün mühüm, lazım və hamının həyatında təsirlidir. Amma mənim fikrimcə, universitet müəllimləri və alimlər üçün daha mühüm və daha faydalıdır. Əvvəla ona görə ki, siz müəllimsiniz, tələbə və gənclərin şəxsiyyətinin formalaşmasına sizin sözünüzdən çox rəftarınız təsir edir. Əksərən belədir. Əgər sizin sözünüz onu bir istiqamətə sövq etsə, amma rəftarınız həmin istiqamətdə olmasa, bu rəftar sizin tərəf-müqabilinizə, şagirdinizə və gənc tələbənizə təsir edəcək. Bu, mənəvi saflığın əhəmiyyətinin bir cəhətidir. Əgər bizim universitet müəllimimiz mənəviyyatlı və pak olsa, sinfi və şagirdinin qəlbini nura boyayar. Bizim buna ehtiyacımız var. Bundan .əlavə, siz alimsiniz. Əgər elm mənəviyyatla yanaşı olsa, istiqaməti düzgün olar

Siz dostlar bəzi mətləblər söylədiniz, müxtəlif sahələrdə müşahidə olunan maneələri, problem və iradları xatırlatdınız. Bunların çoxu ona görədir ki, elm özünün düzgün ilahi istiqamətində hərəkət etməmişdir. Bu mənəvi saflıq, bu mənəviyyat elmi düzgün .istiqamətinə yönəltməkdə və inkişaf etdirməkdə alimə kömək edir

Bu günlərin və gecələrin qədrini bilək. Siz iyirmi gündən artıq oruc tutmusunuz. Allaha şükür olsun ki, bu səadət sizə nəsib oldu və şübhəsiz, bu gecə və gündüzlərin ruhani işığından bəhrələndiniz. Qarşıdakı bir neçə gecə və gündüzdə də öz vücudunuzu bizə .doğru axan ilahi lütf və mərhəmət şəlaləsi ilə yumağa çalışın

.Universitet müəllimləri ilə görüşdə çıxışından: ۲۰۱۰

səh:۲۵۷

Mübarək fitr bayramı münasibəti ilə bütün İslam ümmətini, əziz İran xalqını, namazda iştirak edən siz hörmətli insanları təbrik edir, hamını və özümü ilahi təqvaya, sözdə, .əməldə və düşüncədə Allahın əmr və qadağalarına riyaət etməyə çağırıram

Allah-Taalaya şükür edirik ki, fürsət və ömür verdi, biz daha bir ramazan ayını, daha bir fitr bayramını gördük. İlahi ziyafət ayını dərk etmək böyük nemətdir. Bizim xalqımız bu aydan həqiqətən yaxşı istifadə etdi, bu şərafətli və əziz ayın qədrini bildi. Bu məclislər, Quran qiraətləri, zikrlər, dualar, daha çox gənclərin, pak və mənəviyyatlı insanların iştirak etdiyi müxtəlif mərasimlər ilahi rəhmət bacalarını xalqın üzünə açır. .Bunun qədrini bilmək lazımdır

Mənəviyyat ruhu və Allahın müqəddəs zatı ilə mənəvi əlaqəyə vurğunluq bizim xalqımızda oturuşmuş, dərinləşmiş və kök salmışdır. Bəzilərinin səhvlərə düçar olması, öz fərdi həyatlarında səhvlər etməsi mümkündür, amma ramazan ayı onlara Allaha-Taalaya doğru qayıtmaq, diqqət yetirmək və Onu yada salmaq imkanı verir. Bütün insanlarda mənəvi işlərə həvəs, eşq var. Bu eşq maddi eşq deyil, həvəsbaz eşq deyil, Allaha eşqdir, Müqəddəs Rəbbə eşqdir, varlığın mənbəyinə eşqdir. Bu bütün insanların fitrətində vardır: Allahın fitri olaraq insanlara verdiyi din(١). Maddi amillər, maddi gözəlliklər çör-çöp kimi bu qiymətli gövhərin üzərini tutur, ramazan ayı isə bir yel kimi gəlib bu zibilləri təmizləyir, o gövhər özünü göstərir və Allah-Taalaya diqqət cana gəlir. Buna görə, keçmiş ramazan aylarının əksərində olduğu kimi, bu ramazan ayında da müxtəlif üsul, rəftar və görkəmlərə malik olan bütün xalqın xüsusən mübarək qədr gecələrində bu məclislərdə iştirak etdiyini, faydalandığını və göz yaşı tökdüyünü .gördük

Gözlərdən axan bu yaşlar əslində ayıq və pak ürəklərdən çağlayır. Bizim əziz xalqımız bunun qədrini bilsin. Bu mübarək ayda topladığınız azuqə və məhsulları qoruyun. Quranla qurduğunuz ünsiyyəti davam etdirin, onu qoruyun. İlk vaxtda, məsciddə və qəlbin hüzuru ilə namaz qılmağı il boyu özünüz üçün qoruyun, imkanınız həddində bu maddi amillərin, çör-çöp və küllərin bu qiymətli cəvahiratın üzərinə oturmasına imkan verməyin. Özündə bu xüsusiyyətləri, bu mənəvi yüksəlişi və kamilliyi qoruyan xalq

bütün sahələrdə – maddi-mənəvi sahələrdə, nüfuzda, iqtidarda, milli sərvətlər .yaratmaqda müvəffəq olacaq. İnşallah bu bizim xalqımız üçün baş verəcək

Bu gün fitr bayramıdır; həm bayramdır, həm də xalqın bir yerə toplandığı gündür. Bu gün bütün İslam dünyasında müsəlmanlar bayram edirlər. Eyni



---

.Rum/۳۰ [۲۸۰] -۱

vaxtda ürəklərin bir nöqtəyə yönəlməsi İslam ümməti üçün böyük fürsətdir. Hədisdə deyilir ki, bu gün bayram, toplantı, fitrə, zəkat, rəğbət və ibadət günüdür.(١) Bu gün Allah-Taalaya rəğbət günü, Allah qarşısında kiçilmə günüdür. Bu bayram Allaha diqqət bayramı, mənəviyyat bayramıdır. Ümidvarıq ki, Allah-Taala bayram və mübarək cümə günü olan bugünkü gündə ilahi mərhəmətdən istifadə etmək səadətini hamımıza !nəsib etsin

.Fitr bayramı namazının xütbələrindən: ٢٠١٠

səh:٢٥٩

---

.İləl əş-şərai, c.١, səh. ٢۶٩ [٢٨١] -١

Siz möhtərəm məclis iştirakçılarını, ölkə məmurlarını, İslam ölkələrinin möhtərəm səfirlərini, bütün İran xalqını və İslam ümmətini bu böyük və mübarək bayram münasibəti ilə təbrik edirəm. Ümidvarıq Allah-Taala mömin xalqın və müsəlman ümmətin ramazan ayı boyunca və bugünkü gündə Allahın dərgahına etdiyi ibadət və tövbəsi sayəsində Öz rəhmətini, lütfünü, yardımını və hidayətini bu böyük ümmətin !hamısına şamil etsin

Bu mübarək bayramın rəmzi bəndəlikdir, ibadətdir, namazın sıx sıralarıdır. Bu gün bütün İslam dünyasında insanlar camaat namazına durub Allaha sitayiş etdilər. Bu, müsəlman ümmət arasında mənəvi və səmimi bir rabitədir. Bu sıxlıq və birlik İslam ümməti və onun taleyi ilə əlaqədar olan mühüm beynəlxalq məsələlərdə də .yaranmalıdır

Əgər bu qəlblər bir olsa, İslam ümmətinin düşmənlər tərəfindən yaradılmış ixtilaflar həll olunsa, o zaman əllər, addımlar, güclər və düşüncələr də vahid istiqamətə yönələr, .İslam və onun ümməti qarşısındakı böyük cəbhə ilə qarşıdurmada öz təsirini göstərər

Fitr bayramında quruluşun məsul şəxsləri və İslam ölkələrinin səfirləri ilə görüşdə .çıxışından: ۲۰۱۰

səh:۲۶۰

## İslam dünyasının çatışmazlıqlarını düzəltməkdə Quranı dərk etməyin və Quranla ünsiyyətin təsiri

Bu gün burada Quranın uca ayələrini gözəl səslə oxuyan və bizim qəlblərimizi ilahi kitabın şanlı ayələrinin nuru ilə işıqlandıran əziz qardaşlara çox təşəkkür edirik. Ümidvarıq Allah-Taala bizim xalqımızı, xüsusən də gənclərimizi Quranla daha çox tanış !etsin

Quranla ünsiyyət bizim qəlblərimizi Quran təlimləri ilə daha yaxından tanış edir. İslam dünyasında nə qədər çatışmazlıq varsa, ilahi təlimlərdən uzaq olduğuna görədir. Quran hikmət kitabıdır, elm kitabıdır, həyat kitabıdır. Ümmətlərin və xalqların həyatı Quran təlimləri ilə tanışlıqda, bu təlimlərə və Quran hökmlərinə əməl etməkdədir. İnsanlar ədalət istəyirlərsə, zülmdən bezmişlərsə, zülmlə mübarizə yolunu Qurandan öyrənməlidirlər. İnsanlar elm istəyirlərsə, elm və ayıqlıq vasitəsi ilə həyatı rövnəqləndirmək, özləri üçün rahatlıq və rifahı təmin etmək istəyirlərsə, yolu Quranda göstərilmişdir. Əgər insanlar Allah-Taala ilə əlaqəni, mənəvi və ruhi paklığı, ilahi .məqamla tanışlığı istəyirlərsə, yolu Qurandır

Biz müsəlman ümmətin zəifliyi, geriliyi, yanlış rəftarları, əxlaqi məsələlərdə və həyatda problemləri - bunların hamısı Qurandan uzaq düşdüyümüzə görədir. Zalım və tağutların hakimiyyəti səbəbindən - Quran öz oxucularını tağutlardan çox çəkindirmişdir - müsəlman xalqların qanı soruldu; yalnız iqtisadi qanlar yox, yalnız həyati sərvətləri, yeraltı mədənləri, neftləri və bu kimi sərvətləri yox, hətta müqavimət ruhları, iqtidar və izzət istəkləri də onlardan alındı. Müsəlman xalqlar öz mədəniyyətlərinə arxa çevirib, materialist mədəniyyətləri qəbul etdilər. Biz dilimizdə la ilahi illəllah desək və müsəlman olsaq da, Qərb mədəniyyəti və Qərb təlimləri təsir göstərib bizi həqiqətlərdən uzaqlaşdırdı. Bu zaman yalnız iqtisadiyyatımızı və dünyəvi iqtidarımızı yox, hətta əxlaqımızı, mənəvi təlimlərimizi də əldən verdik. Biz əgər tənbəllik ediriksə, zəiflik göstəririksə, bir deyiliksə, bizim aramızda bədxahlıq varsa, .bunlar qeyri-dini və antiislam mədəniyyətin təlqin olunmasının təsirlərindəndir

Quranın rolu bizi maddiyyat və mənəviyyat baxımından ucaltmaqdır. Quran bu işi görür. Tarixlə tanış olanlar bunun nümunələrini görmüşlər. Bu dövrün biz insanları öz

dövrümüzdə nümunələrini müşahidə etməkdəyik. Bir nümunə siz əziz İran xalqısınız. Siz elə bilməyin ki, tağut rejimlər – istər Pəhləvi, istərsə də ondan öncəki Qacar rejimi dövründə İran xalqının beynəlxalq aləmdə zərrə qədər etibarı vardı. Yox idi. Bizim xalqımızda olan bu güclü istedad unudulmuş, xarabalıqda basdırılmış bir xəzinə kimi yaddan çıxmışdı. Yalnız təsadüfi formada bir nəfər özünü göstərə bilərdi və bu da baş .vermirdi

Siz bu gün görürsünüz ki, bu qədər fəal, həvəskar, yaradıcı və ölkənin inkişafına maraqlı gənc müxtəlif sahələrdə uğur və nailiyyət əldə edir, xalqlarına şan-şöhrət gətirirlər. Gənclər o zaman da var idilər, amma tağut hökmranlığı səbəbindən bu işlər .görülmürdü

Biz Qurana və Quran təlimlərinə doğru bir addım atan kimi – biz Qurana doğru həqiqətən yalnız bircə addım atmışıq – Allah-Taala bizə başucalığı verdi, həyat verdi, ayıqlıq, qüvvə və qüdrət bağışladı. Bizim xalqımız bu gün ən fəal və ən güclü xalqlardandır. Bu gün ölkəmizdə güclü və parlaq istedadlar, müxtəlif sahələrdə inkişaf qabiliyyəti və ardıcıl inkişaflar müşahidə olunur. Başqa xalqlar da bizim xalqımızı .alqışlayırlar

Bu gün xoşbəxtlikdən, İslam ümməti arasında xalqları hərəkətə gətirən İslam şüarları müşahidə olunur. Siz görür və xəbərlərini eşidirsiniz. Bu hərəkətlər İslam şüarının, İslam tələbinin və İslam istəyinin olduğu yerlərdə daha rövnəqli, daha təravətli, daha təsirli və daha nüfuzludur, düşmənlərdən, münafiqlərdən, müxalif və hiyləgərlərdən .daha az təsirlənir. Bu, Quran təlimlərinin xüsusiyyətidir. Quranla tanış olmaq lazımdır

Əlbəttə, bu gün keçmişlə müqayisəolunası deyil. Keçmişdə bu qədər Quran oxuyan, bu qədər Quran hafizi, Quranın mətni ilə bu qədər tanış olan, Quran qiraətinə bu qədər həvəs göstərən və eşq bəsləyən yox idi. Halbuki eyni ölkə və eyni xalq idi. Mənim yadımdadır, məşhur Misir qiraətçilərindən olan mərhum Əbüleyneyn Şueyşə Məşhədə gəlib Gövhərşad məscidində çox gözəl Quran oxuyurdu. Mən onun qiraətini dinləməyi çox istəsəm də, məclis ozamankı tağut qurumları tərəfindən təşkil olunduğuna görə oraya gedib otura bilmirdim, uzaqdan baxır və səsini eşidirdim. Həmin məclisdə zənnimcə ۵۰-۶۰ nəfər iştirak edirdi. Bir qrupu dövlət məmurları idi, bir qrupu da .Məşhədin məşhur qiraətçiləri

Bu gün hər yerdə mövcud olan bu Quran həvəsini artırmaq, günbəgün çoxaltmaq lazımdır. Bu yaxşı qiraət, yaxşı səs, yaxşı məclislər – Allahın lütfü ilə görürəm ki, bizim bu qiraətçilərimiz Quran məclisləri üçün tədricən mahirləşmişlər – dəyərli məsələlərdir. .Faydası budur ki, bizi Quranla, Quran təlimləri və Quranın mənaları ilə tanış edir

**Quran əzbərləməyin onu dərk etməyə təsiri**

Bizə Quran təfəkkürünü bəxş edən amillərdən biri Quranı əzbərləməkdir. Bizdə Quran hafizi azdır. Mən əvvəllər demişdim ki, ölkəmizdə ən azı bir milyon Quran hafizi olmalıdır. Bir milyon bizim əhaliyə nisbətən kiçik rəqəmdir. İndi Allahın lütfü ilə dostlar hazırlıq işlərini gördüklərindən və Quran

əzbərləməyə dair proqramlar hazırladıqlarından bizim də ümidimiz çoxalmışdır və .deyirik ki, bizdə on milyon Quran hafizi olmalıdır

Əlbəttə, yaddan çıxarmayın ki, Quranı əzbərləmək birinci addımdır. Əvvəla bunu qorumaq lazımdır. Buna görə Quranı əzbərləyən şəxs onu daim oxumalıdır ki, yadından çıxmasın. Sonra bu əzəbərləmək təfəkkür məsələsinə kömək etməlidir. Bu belədir. Hifz həqiqətən təfəkkürə kömək edir. Quranı əzbər bilən şəxs onu təkrarlayıb .oxuduqda Quran ayələri üzərində dərindən düşünmək imkanı qazanır

Təbii ki, ayənin məqsədini izah edən təfsirlərlə tanışlıq da çox lazımdır. Əzbərləmək, təfsirlə tanışlıq və təfəkkür olduqda bizim cəmiyyətimizdə gözlənilən hal, yəni Quran çiçəklənməsi baş verəcək. Təsəvvür edin, ölkəmizdə Quran təlimləri ilə tanış olan on milyon, on beş milyon insan olsa, görün nə qədər dəyərli olar! Onlar Quranın təlimlərini, dərslərini, nəsihətlərini, təhdid və müjdələrini yadda saxlasınlar, xatırlasınlar və öz qəlblərinə oxusunlar. Bu zaman polad kimi möhkəm bir xalq yaranar. Xoşbəxtlikdən, buna əlverişli şərait vardır. Bu gün də bizim xalqımızın iradəsi polad kimidir, amma cəmiyyətin sözügedən Quran forması o zaman baş verəcək. Biz ümidvarıq ki, buna müvəffəq olacağıq. Quranla ünsiyyət quran, Quran adamı olan, Quran oxuyan, gözəl səslə Quran qiraətinə müştəri, yaxud özləri həmin qiraətçilərdən olan siz gənclər öz qədrinizi bilin. Allah-Taala sizə böyük qarşılıq verəcək. Siz həqiqətən cəmiyyətin bu ümumi hərəkətinin ön sıralarındasınız. Çətinliyi kimi, bunun .Allah yanında əcri və savabı da çoxdur

İlahi! Bizi bütün ömrümüz boyu Quranla birgə et! İlahi! Bizi dünya və axirətdə Qurandan ayırma! İlahi! Bizi qiyamətdə Quranın sayəsində saxla! İlahi! Bizə Quran həyatı, ilahi həyat və İslamın ideal həyatını bəxş et! İlahi! Məhəmməd (s) və Ali-Məhəmməd (ə) hörmətinə, dövrün imamının müqəddəs qəlbini bizdən razı et! Bizi !Quran və Əhli-beytdən (ə) ayırma

.Quran qiraətçiləri, hafizləri və müəllimləri ilə görüşdə çıxışından: ٢٠١١

### Oruc – möminlərə ilahi hədiyyə

Məşhur arif və və böyük fəqih olan mərhum Hacı Mirzə Cavad Ağa Məliki Təbrizi şərafətli əl-Müraqibat kitabında buyurur ki, oruc Allah-Taalanın öz bəndələrinə və möminlərə hədiyyə verdiyi bir nemətdir. O yazır ki, oruca vacib tapşırıq gözü ilə yox, bir şərəf kimi baxın və Allahın bəndələrinə hörmət əlaməti olan oruc əməlinə diqqətin özü üçün şükür edin. O, möminlərin ramazan ayında çəkdikləri aclıq və susuzluq üçün hədislərdən və bu böyük insanın nurlu qəlbindən götürülmüş çoxlu faydalar sadalayır. O, bir xüsusiyyət üzərində dayanıb hamısından mühüm olduğunu vurğulayır. Deyir ki, bu aclıq və susuzluq insana təfəkkür etmək üçün əlverişli şərait yaradan mənəvi paklıq bəxş edir. "Bir saat təfəkkür etmək bir il ibadətdən üstündür".(١) İnsanın daxilinə, ruhuna və qəlbinə müraciət növündən olan bu təfəkkür həqiqətləri aydınlaşdırır və .ona hikmət qapısını açır. Bundan istifadə etmək lazımdır

Ömür haqda fikirləşək. Ömür hər bir insanın əsas sərvətidir. Bütün xeyirlər ömrün – bu ötən saatların vasitəsi ilə əldə olunur. İnsana əbədi səadət və xoşbəxtlik gətirən amil bu sərvətdir. Bu ömür barədə fikirləşək, onun ötməsini görək, həyatın saatlarının, ömrün gündüz və gecələrinin tez-tez dəyişdiyini hiss edək, zamanın ötməsinə diqqət yetirək. Bu sərvət anbaan azalır. Halbuki axirət xoşbəxtliyini qazanmaq üçün bu bizim ?hər şeyimizdir. Biz onu necə və harada sərf edir, hansı yolda xərcləyirik

Ölüm haqda, bu dünyadan köçmək, ruhun bədəndən çıxdığı an və ölüm mələyi ilə görüş barədə fikirləşək. Bu an bizim hamımız üçün yaranacaq: Hər bir kəs (canlı) ölümü dadacaqdır(٢). Hamımız bunu dadacağıq. O anda bizim vəziyyətimiz necə olacaq? O anda bizim ruhumuz hansı halda olacaq? Bunlar diqqətəlayiq məsələlərdir. .Bunlar haqda fikirləşmək lazım, vacib və zəruri işlərdəndir

### Məsumlardan nəql olunan dualarda ilahi təlim və həqiqətlər

Təfəkkür etmək üçün başqa bir məsələ bu dualardır. Məsumlardan nəql olunan duaların məzmunu möhtəşəmdir. O, həmin əl-Müraqibat kitabında buyurur ki, tövhid mövzusu istisna olmaqla, məsumlardan nəql olunan bütün hədis və xütbələrdə onlardan nəql olunan dualarda mövcud olan həqiqət və bilgilərin onda biri yoxdur. Bu .dualar çox əhəmiyyətlidir

Mən indi bir neçə dəqiqə ərzində bir duanın bəzi cümələlərini oxumaq istəyirəm ki, eşidənlər üçün təkrar, eşitməyənlər üçün nəsihət olsun. Bu dua



---

۱- Müstədrək, c. ۱۱, səh: ۱۸۳.

۲- [۲۸۳] Ali-İmran/۱۸۵.

.Səhifeyi-Səccadiyyənin iyirminci duası olan şərafətli Məkarim əl-əxlaq duasıdır

**Məkarim əl–əxlaq duasına bir baxış**

Duanın əvvəlində Peyğəmbərə (s) və onun ailəsinə salam göndərib deyir ki, mənə saleh bəndələrinin zinətini əta et və məni təqvalıların libasına bürü!(١) Yəni məni saleh və təqvalı bəndələrindən et! Sonra təqvalıların xüsusiyyətlərini qeyd edərək onların zinətinin nədən ibarət olduğunu deyir. Biz hansı işlərdə təqvalıların zinəti ilə bəzənməliyik? Adətən təqvadan söhbət düşəndə fərdi günahlardan çəkinmək və ibadətləri yerinə yetirmək yada düşür. Şübhəsiz ki, bunlar var, bunda şübhə yoxdur. Amma burada İmam Səccad (ə) ٢٢-٢٣ məsələni qeyd edib bizim diqqətimizi təqvanın .məna və məfhumunun yeni cəhətlərinə yönəldir

Birincisi budur ki, məni ədaləti bərqərar etməkdə təqvalılardan et. Cəmiyyətdə ədaləti bərqərar edək - məhkəmə ədalətini, ölkənin həyati sərvət və imkanlarını xalq .arasında bölməkdə ədaləti. Biz məmurlardan gözlənilən bu təqvadır

İkinci məsələ qəzəbi udmaqdır. Biri var ki, siz adi bir adamsınız və bir din qardaşınıza, bir ailə üzvünüzə, bir işçinizə qəzəbiniz tutub. Qəzəbi udmağın çox fəziləti var: qəzəblərini udar, insanların günahlarından keçərlər(٢). Biri də var ki, siz bir ictimai məmursunuz, mövqeyiniz var, hərəkətiniz, təsdiq və inkarınız, söz və əməliniz cəmiyyətə təsir göstərir. Belə bir şəraitdə sizin qəzəbiniz daha adi bir fərdin qəzəbi kimi deyil. Bəzi şəxslərin, bəzi fikirlərin əleyhinə qəzəblənirik, danışırıq. Belə bir qəzəbin təsirləri adi qəzəbin təsirləri ilə çox fərqlənir. Bu duada deyilir ki, qəzəbinizi udun, qəzəblə iş görməyin. Siz bir şəxslə, bir fikirlə, bir təşkilatla razı olmaya bilərsiniz. Burada dəlil və məntiq hakim olmalıdır. Əgər bu dəlil və məntiq qəzəblə qarışsa, iş korlanacaq, hədd aşılacaq və israf baş verəcək; Ey Rəbbimiz, günahlarımıza və (işlərimizdə həddi aşdığımıza görə bizi bağışla!(٣

Bizim təqvamız üçün zəruri işlərdən başqa birisi alovu söndürməkdir. Burada məqsəd qrup və qurumlar arasındakı ixtilaf alovlarıdır. Bu alovun şölələnməsi yandırıcı alov kimidir və hamı onu söndürməyə çalışmalıdır. Alov üzərinə benzin tökməyin, alovu gücləndirməyin. Biz məhz buna görə dostlara, məmurlara, tribuna sahiblərinə, sözləri ya ümumi şəkildə, ya da ölkənin bir

hissəsində işıqlandırılan şəxslərə tez-tez tövsiyə edirik ki, sözlərinə, dillərinə, fikirlərinə .nəzarət etsinlər. Bəzən bir söz nəinki alovu söndürmür, hətta daha da gücləndirir

Növbəti məsələ müsəlman camaatdan, xalqdan uzaqlaşan şəxsləri yaxınlaşdırıb cəlb etməyə çalışmaqdır. Yarıyolda qalanları mənzilə çatıdırın. Yarımçıq imanı olanların bizim əməlimiz, fikrimiz və rəftarımızla imanla tam üzülüşmələrinə, quruluşla yarımçıq əlaqəsi olanların quruluşdan ayrılmalarına bais olmayaq. Əksinə, yarıyolda olanları .cəzb edək. Təqvanın nümunələri bunlardır

Növbəti məsələ aralarında ixtilaf olan şəxslərin münasibətlərini yaxşılaşdırmaqdır. İnsanlar haqda müsbət və yaxşı cəhətləri yaymaq lazımdır. Bir şəxsdən, bir məmurdan yaxşı iş görmüsünüzsə, deyin, onda mənfi bir cəhət tanıyırsınızsa, ifşa etməyin. İfşa etməməyin mənası bu deyil ki, pis işdən çəkindirməyəsiniz. İşində nöqsanı olan şəxsə irad bildirmək lazımdır, amma bu məsələləri ifşa etmək məsləhət .deyil

Bu barədə söz çoxdur. Bu, həmin duanın bir hissəsidir. Onda iyirmi iki-iyirmi üç məsələ qeyd olunmuşdur. Mən indi altı-yeddisini qısa şəkildə dedim. Ürəklərimizi bu səmtə yönəldək, Allahdan istəyək ki, bizi təqvalıların zinətinə bürüsün. Hər halda, bundan başqa çıxış yolu yoxdur. Oruc da Quranda təqva üçün buyurulmuş, bizim təqvalı .olmamızdan ötrü vacib edilmişdir. Təqvanın yerləri bunlardır

.İran İslam Respublikası quruluşunun məmurları ilə görüşdə çıxışından: ۲۰۱۱

səh:۲۶۶

Burada iştirak edən əziz şairlərə və inqilab şeiri qrupundan sayılan digər şairlərə demək istəyirəm ki, bu dövrün xüsusiyyətlərinə əsasən, bizim dövrümüzün şairinin dərin dini inanca ehtiyacı var. Siz bu gün istəsəniz də, istəməsəniz də, bilsəniz də, bilməsəniz də, təsdiq etsəniz də, etməsəniz də, çoxlu xalqlar üçün örnək olmusunuz. Müşahidə etdiyiniz bu İslam oyanışı desək də, deməsək də, üz vursaq da, vurmasaq da, digərləri üz vursalar da, vurmasalar da, İran xalqının möhtəşəm hərəkətindən təsirlənmişdir. Bu möhtəşəb inqilab, bu böyük inqilab, tağut ənənələrini, sistemini və istismarçı sistemin kökünü kəsən bu dəyişiklik İran xalqını bir örnəyə çevirdi. Siz örnək olmağın şərtlərinə əməl etmək istəyirsinizsə, öz dini məlumatlarınızı və İslam inancınızı gücləndirməlisiniz. Bu, keçmişdə bizim şeirimizdə olmuşdur. Baxın, hamısı olmasa da, Firdovsidən tutmuş Mövləviyə, Sədiyə, Hafizə və Camiyə qədər bizim əksər dəyərli şairlərimiz belə olmuşlar. Firdovsi Həkim Əbülqasim Firdovsidir. Hekayə yazan bir şəxsə yalnız hekayə və qəhrəmanlıq dastanı yazdığına görə həkim demirlər. Bu sözü də biz deməmişik. Zaman boyu fikir və düşüncə sahibləri onu həkim adlandırmışlar. Firdovsinin Şahnaməsi hikmətlə doludur. O, əsl dini maarifdən bəhrələnmiş bir insan olmuşdur. Onların hamısı həkim olmuşlar, divanları başdan-ayağa hikmətlə doludur. Hafiz Quranı əzbər bilməsi ilə fəxr etməsəydi, özünə Hafiz təxəllüsünü götürməzdi. O, Quran hafizlərindəndir. İndi bizim müxtəlif qiraətlərlə də oxuyan qiraətçilərimiz adətən iki-üç rəvayətdən çoxunu bilmirlər. Amma o, Quranı on dörd rəvayətlə oxuya bilirmiş. Bu çox böyük məsələdir. Hafizin Quranla belə güclü tanışlığı onun qəzəllərində görünür. Sədinin məsələsi aydındır. Mövləvinin məsələsi aydındır. Cami və Saib də həmçinin. Siz Saibin divanında dərin dini etiqad görürsünüz. İnsan Bidelə çatdıqda onun şeirlərində çox möhtəşəm, dərin və mürəkkəb dini inancları müşahidə edir. Bunlar bizim böyüklərimiz, şeirin imamlarıdır. Demək olar ki, fars şeirinin peyğəmbərləri bunlardır. Bunlar dini bilgilərə yiyələnmişlər, siz də bu bilgilərə yiyələnin. Bunun üçün Quranla tanışlıq, ünsiyyət, Nəhcül-bəlağə ilə və Səhifeyi-Səccadiyyə ilə ünsiyyət qurmaq lazımdır. İnsanın bəzən qarşısına çıxan bu tərəddüdlərin, nigaranlıqların və qaranlıqların çoxu bunları mütaliə edərkən şəffaflaşır, .aydınlaşır. İnsan anlayır, yolu, işi və məqsədi tanıyır

Misal üçün, Şəhid Mütəhhərinin Mənəvi sözlər kitabını oxumaq, yaxud ilahi hökmlərə

diqqətin özü ramazan ayı ilə münasibdir. Mən bu gün bir söhbətdə mərhum Hacı Mirzə Cavad Ağa Məliki Təbrizinin dilindən dedim ki, orucdan hasil olan mənəviyyat, insanın ruhunda oruc səbəbindən yaranan

çiçəklənmə və ucalıq çox dəyərlidir. Təsadüfən siz şairlər ruhi həyəcanlarla, mənəvi təsəvvür və dərklərlə işləyirsiniz. Şairin xüsusiyyəti belədir. Şairin zərif təbiəti bunu tələb edir və çox asanlıqla bu bilgiləri qavraya bilir. Ramazan ayına və oruca diqqət buna çox kömək edir. Odur ki, öz dini məlumatınızı artırın; əlbəttə, qeyd etdiyim kimi, peşəkar və elmi formada olan dini məlumatı, qondarma məlumatları yox. Hərdən bəzi adamlar dinə dair sözlər danışır, əslində isə özlərindən quraşdırır, heç bir sənədə, elmi .baxışa və tədqiqata söykənmirlər. Bu çox da işə yaramır

.Şairlərlə görüşdə çıxışından: ۲۰۱۱

səh:۲۶۸

## Ramazan – dini təlimləri mənimsəmək və mənəvi faydalar götürmək fürsəti

Fitr bayramı münasibəti ilə namazda iştirak edən siz əziz qardaş və bacıların hamısını, bütün İran xalqını və böyük İslam ümmətini təbrik edirəm. Allah-Taaladan istəyirəm ki, bu şərafətli və mübarək gündə öz lütf və mərhəmətini bütün müsəlman qardaş və bacılarımıza şamil etsin! Onların biraylıq ibadət və itaətlərini ən gözəl şəkildə qəbul və !bu günü İslam ümmətinə həqiqi bayram etsin

Mübarək ramazan ayından çoxlu insanlar çoxlu faydalar götürə bildilər. Bu faydalar onların birillik ehtiyacları və hətta bəzən bütün ömürləri üçün faydalı ola bilər. Bəziləri Quranla ünsiyyət qurub, Quran maarifindən bəhrələndilər, Quranın sözləri haqda düşündülər. Bəziləri bu ayda Allahla ünsiyyət və münacat yolunu seçib öz qəlblərini nura boyadılar. Xalq oruc tutdu, orucla öz qəlbində mənəviyyat yaratdı. Həmin mənəviyyat, səmimiyyət və paklıq fərdi və ictimai həyatda çoxlu faydalara bais olur. Bu paklıq insana yaxşı düşüncə verir, nəfsi paxıllıqdan, xəsislikdən, təkəbbürlülükdən və ehtirasdan təmizləyir. İnsanların mənəvi paklığı cəmiyyəti psixoloji və mənəvi cəhətdən təhlükəsiz edir, möminlər arasında mehribanlıq yaradır, imanlı cəmiyyətdə bir-birinə qarşı qayğıkeşliyi artırır. Bunların hamısı mübarək ramazan ayının uğurlu və .səadətli insanlara faydalarıdır

Bu ayın başqa əsas faydası təqvadır. Oruc təqvadan ötrü vacib buyurulmuşdur. Təqva öz cilovunu tutmaqdır. Bəzən digərlərinin cilovunu yaxşı tuta bilirik, amma öz cilovumuzu tuta, özümüzü nadinclikdən, vəhşilikdən və Allahın qırmızı xətlərini keçməkdən saxlaya bilmirik. Bu böyük hünərdir. Təqva - düzgün ilahi yolda hərəkət etmək üçün özündən ehtiyatlı olmaq, elm, dərk və ayıqlıq toplamaq və onların əsasında hərəkət etməkdir. Xoşbəxtlikdən, bizim cəmiyyətimizdə ramazan ayında bu faydaları qazanan səadətli insanlar çox oldu. Demək olar ki, ölkəmizin və xalqımızın əksəri bunu bacardı. Bizim gənclərimiz, kişi və qadınlarımız, müxtəlif təbəqələrdən, müxtəlif ictimai qruplardan, müxtəlif üsul və yollardan olan insanlar müxtəlif yerlərdə, zikr və dua məclislərində, Quran məclislərində, qədr gecələrində və müxtəlif mərasimlərdə hamılıqla ilahi ziyafət süfrəsinə əyləşib birgə bəhrələndilər. Biz bu .barədə xəbərləri izləyib məlumat aldıq və şəkilləri gördük

Bizim dövrümüzdə öz cilovunu tutanlar az deyil. Ölkənin bu gənc toplumu, ölkədə iş başına gəlmiş bu təravətli nəsil düzgün yolda hərəkət edir və təqva təlimi keçir. Bu, .ölkəmizin və hətta İslam ümmətinin gələcəyi üçün böyük müjdədir

Bizim bu nailiyyət və faydaları qorumamız lazımdır. Günah ildırımının bu dəyərli tarlaya od vurub məhv etməsinə qoymayaq. Allahın yolunu, diqqət, mənəvi saflıq və Quranla ünsiyyət yolunu, Allahla əlaqəni qorumaq, Allahla dərdləşmək və danışmaq yolunu üzümüzə açıq saxlayaq. Əgər Allahla danışsanız, Allah da sizinlə danışacaq: Məni yada .salın, Mən də sizi yada salım

İlahi! Məhəmməd (s) və Ali-Məhəmməd (ə) hörmətinə, bizim cəmiyyətimizi həmişə Quran cəmiyyəti, mənəviyyatlı, məhəbbət və sevgili, həmrəy və yekdil cəmiyyət et! İlahi! Bu böyük xalqı, bu əziz gəncləri uca arzularına və dəyərli amallarına çatdır, onları düşmənlərinə qalib et! İlahi! Dövrün imamının müqəddəs qəlbini bizdən razı et! O həzrətin dualarını bizə şamil et! İlahi! Böyük imamızın ruhunu və şəhidlərin pak !ruhlarını bizdən razı et

.Fitr bayramı namazının xütbələrindən: ٢٠١١

Bu günü bayram kimi qeyd edirlər. Fitr bayramı xoşbəxt və mömin insanlar üçün həqiqi bayramdır. Bayram, əslində insanların biraylıq ixtiyari riyazətlərinə, aclıq və susuzluqlarına və gün boyu bəşəri ehtirasları cilovladıqlarına görə Allah-Taaladan mükafat almaq günüdür. Bunlar çox dəyərlidir. Bu məşqlər insanın həyat boyu güclü iradə ilə öz azdırıcı meyllərinin ağzını buxovlaması üçün bir hazırlıqdır. Biz insanların öz nəfsimizi cilovlamaq üçün güclü iradəyə ehtiyacımız var. Həyatı bizə və digərlərinə çətinləşdirən nəfsimizin azğınlığı və yayınmalarıdır. Allah-Taalanın insana vacib etdiyi bu təlim – möminlər bu ilahi dəvəti qəbul edib bir ay təlim və riyazət keçirlər - əslində bəşərin nəfsə itaətdən və nəfsinin tamahkarlığı qarşısında təslimçilikdən ibarət olan böyük dərdinin dərmanıdır. Bu təlimin qədrini bilmək lazımdır. Allaha şükür olsun ki, dünya müsəlmanları orucluq ayını uca tuturlar. Bizim əziz xalqımız da həqiqətən bu ayı uca tutdu, böyük saydı və bu ayda öz vəzifələrinə əməl etdi. Ümidvarıq ki, fitr !bayramında Allah-Taala bütün İslam ümmətinə bayram hədiyyəsi versin

.Prezident və dövlət şurasının üzvləri ilə görüşdə çıxışından: ۲۰۱۱

səh:۲۷۱

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik


:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

